## HUMANİTAR VƏ İCTİMAİ ELMLƏR
## HUMANITIES AND SOCIAL SCIENCES

DOI: https://doi.org/10.36719/2663-4619/115/9-13

**Firadun Ibrahimov**
Sheki Branch of Azerbaijan State Pedagogical University
Doctor of Pedagogical Sciences
https://orcid.org/0000-0002-0775-1048
firedun.ibrahimov55@gmail.com
**Gunel Aliyeva**
Sheki Branch of Azerbaijan State Pedagogical University
https://orcid.org/0000-0002-6613-8227
gunelaliyeva0492@gmail.com

# Competency-Based Approach to Education and its Impact on Quality

### Abstract

The article distinguishes educational competencies from among the competencies, emphasizes the importance of forming competencies that will be needed for subsequent periods of time during the education period. The competent approach in education evaluates as a means of improving the quality of the educational process and one of the main strategic directions of modernization of the education system in the world education system. It is noted that taking into account the characteristic featu res of the interaction between various components of the competent approach model (logical, functional, semantic (meaning), technological) determines its effectiveness. Literacy to understand complex written texts, numerical literacy to work with numbers and measured quantities, count them and perform various operations on them, acquiring appropriate knowledge, skills and habits to choose the right life position in different conditions and form a lifestyle, mastering the system of academic knowledge are considered competencies that play a special role in human activity. Reproducibility of complexity, ingenuity, intelligence, openness, normality, honesty, cooperation (a form of labor activity based on the cooperation and joint work of many people), historicity are distinguished as a group of competencies that play a key role in the field of activity. Key competencies should be specified taking into account the age and characteristics of the subject of the learners, and these should be taken into account when developing educational programs, textbooks, and teaching aids.

***Keywords:*** *anthropotechnology, competence, competent approach model, component of competence, personality self-realization skills*

**Firadun İbrahimov**
Azərbaycan Dövlət Pedaqoji Universitetinin Şəki filialı
pedaqoji elmlər doktoru
https://orcid.org/0000-0002-0775-1048
firedun.ibrahimov55@gmail.com
**Günel Əliyeva**
Azərbaycan Dövlət Pedaqoji Universitetinin Şəki filialı
https://orcid.org/0000-0002-6613-8227
gunelaliyeva0492@gmail.com

# Təhsilə səriştə əsaslı yanaşma və onun keyfiyyətə təsiri

### Xülasə

Məqalədə kompetensiyalar sırasından təhsil kompetensiyaları fərqləndirilir, bunların təhsilalma dövründə sonrakı zaman kəsikləri üçün gərək olacaq kompetensiyaların formalaşdırılmasının vacibliyi vurğulanır. Təhsildə səriştəli yanaşma, təlim-tərbiyə prosesinin keyfiyyətinin yüksəldilməsi

vasitəsi və dünya təhsil sferasında təhsil sisteminin modernləşdirilməsinin əsas strateji istiqamətlərindən biri kimi qiymətləndirilir. Bildirilir ki, səriştəli yanaşma modelinin müxtəlif komponentləri (məntiqi, funksional, semantik (məna), texnoloji) arasındakı qarşılıqlı əlaqələrin xarakterik xüsusiyyətlərinin nəzərə alınması onun səmərəliliyini müəyyən edir. Mürəkkəb yazılı mətnləri başa düşmək üçün savadlılıq, ədədlər və ölçülən kəmiyyətlərlə işləmək, onları saymaq və onlar üzərində müxtəlif əməliyyatları yerinə yetirmək üçün ədədi savadlılıq, müxtəlif şəraitdə düzgün həyat mövqeyinin seçilməsi və yaşayış tərzinin formalaşdırılması üçün müvafiq bilik, bacarıq və vərdişlərin qazanılması, akademik biliklər sisteminə yiyələnmək insanın fəaliyyətində xüsusi rol oynayan kompetensiyalar sayılır. Mürəkkəbliyin reproduksiyalılığı (yenidən hasil edilməsi), fərasətlilik, ağıllılıq, gözüaçıqlıq, normallıq, dürüstlük, kooperasiyalılıq (bir çox insanın əməkdaşlığı, birgə işləməsi əsasında qurulmuş əmək fəaliyyəti forması), tarixlilik fəaliyyət sahəsində əsas açar rolunu oynayan kompetensiyalar qrupu kimi fərqləndirilir. Əsas kompetensiyalar öyrənənlərin yaş və fənninin xüsusiyyətləri nəzərə alınmaqla konkretləşdirilməli, təhsil proqramları, dərsliklər, dərs vəsaitləri hazırlanarkən bunlar nəzərə alınmalıdır.

***Açar sözlər:*** *antropotexnologiya, səriştəlilik, səriştəli yanaşma modeli, səriştəliliyin komponenti, şəxsiyyətin özünüreallaşdırma bacarıqları*

## Introduction

**Relevance of the topic.** Renewal of the structure of the education system and moder nization of its content also depend on the level of understanding of its ultimate goal. From this point of view, a competent approach to education is a necessity, and its im pact on the quality of education has not been sufficiently studied and its options have not been developed. Therefore, a competent approach to education and its impact on quality are urgent pedagogical problems.

**Commentary on the research topic.** The modernization of the content of educati on is associated with its humanization on an anthropological basis and the perception of man as a whole being. Man can be perceived as a unique cosmic being, a fundamen tal and important element of the universe, a living being, a unique, powerful cognitive being with great opportunities for understanding the world, a personality with numero us abilities related to energetic substances, and a rich inner nature. The main goal of the education system is aimed at the formation of such a being - a perfect man (Mammadli, 2022).

**Research**

In modern literature, technologies related to human development are called anthropo technology. In this sense, any pedagogical system can also be viewed as anthropotech nology, technology related to various professional fields, or technologized art. Among the approaches that have great scientific and practical importance in modernizing the structure and content of the education system, the competency approach occupies a special place (Ibrahimov, 2018).

The competency approach helps to solve problems related to the needs of the develop ment of the production sphere, creates positive conditions for updating the content of education in connection with changes in socio-economic realities, as a source of gene ral development of human abilities and skills, allows for effective action in updating the content of education, competency acts as a radical means of modeling, is characteri zed by the ability to adapt skills and abilities formed in certain conditions to new condi tions, is defined as an attribute of "the readiness of a specialist to adapt to the field of activity" or preparation for future new professional activity. The competency approach can also be viewed as a set of cultural, scientific-educational, didactic-centrist, functi onal-communicative, etc. Approaches (Zimnyaya, 2004).

Competences at a high level are considered the main factor of personal, institutional and social development in the formation of a broad system of knowledge, skills and ha bits, as the main indicator that allows increasing the efficiency of the educational pro cess. In scientific sources, competencies are interpreted as the sum of knowledge, skills, habits and life experience necessary for the purpose of carrying out socio-perso nal productive activities in relation to objects of real existence (Feyziyev, Ibrahimov, Bediyev, 2011, pp. 254-256). Among the competencies, it is necessary to distinguish educational competencies. Competencies that will be needed for subsequent periods of time are formed during the educational period. Currently, a competent approach in education is a means of improving the qua lity of the educational process and is assessed as one of the main strategic

directions of modernization of the education system in the world education system. A competent approach allows for a systematic solution of issues related to the design of the content of education and the transition to a system of quality control in accordance with the general concept of educational standards.

Taking into account the characteristic features of the interactions between the various components of the competency approach model (logical, functional, semantic (mea ning), technological) determines its effectiveness. This model has the ability to act as a self-organizing system, being open to external and internal innovations, by describing the results based on the integrative knowledge of each participant in the process (Abbasov, Mammadzade, Mammadli, 2021).

The general education system, which is undergoing an active phase of reform in Azerbaijan, as well as all educational structures, cannot be left out of the competency approach. Therefore, conducting a pedagogical-psychological analysis of the compe tency approach and preparing its content should be considered the most urgent problem of general education schools, and taking into account the importance of developing the scientific foundations of competency to solve the problem, the following issues should be ensured: studying the pedagogical and psychological aspects of personality develop ment aimed at socialization in adulthood; establishing a pre-planned, development-crea ting teaching and learning process in accordance with modern requirements; suppor ting work carried out to change and update the content of training in secondary general education schools; expanding the scope of activities of the school psychologist in order to ensure the measurement of the level of competency formed in learners; increasing the efficiency of using the results of quality indicators in the national education system (Feyziyev, Ibrahimov, Bediyev, 2011). In pedagogical literature (Ibrahimov, 2018, pp. 111-113), competencies are reflected in the form of a three-stage series for each subject: related to the general content of education (leading); related to individual areas of education (related to a group of subjects); related to a specific subject.

The main competencies of education explain the main goals of general secondary edu cation. The following are included in the mentioned competencies: content-value com petencies; general cultural competencies; teaching-understanding competencies; infor mation competencies; labor-social competencies; personal-improvement competen cies. In order to achieve quality in education and to form citizens of our country who have acquired high knowledge, skills, and habits, it is the main task of the school and school management to instill these listed competencies in the growing generation. The main competencies should be specified taking into account the age and subject characte ristics of the learners, and they should be taken into account when preparing educa tional programs, textbooks, and teaching aids. Content-value competencies provide a mechanism for the student to determine his/her own activities in educational and other situations. They are the student's overall individual educational direction and life activity program. General cultural competence is the ability of a student to use his free time properly in the field of cultural leisure. Teaching-understanding competence inclu des analysis, goal setting, self-assessment and planning in teaching-assimilation activi ties. The student acquires scientific and practical skills of productive activity, acquires knowledge directly from real life, masters methods of action in non-standard condi tions (Mammadzadeh, 2010). Uses heuristic methods in solving problems. Within the framework of this compe tence, the level of functional literacy is determined. Information competence pro vides the skills of independent search, analysis, and collection, storage and use of necessary information with the help of technical means and information technologies.

Communi cation competence includes knowledge of the necessary languages, mastering the skills of communicating with people of different social roles, self-presentation, appeal, and discussion skills. Labor-social competence includes the ability to under stand one's duties in the labor-social sphere, family relations, and professional self-determination in legal and economic issues in order to carry out public citizenship acti vities. Personal-improvement competence is aimed at mastering the methods of spiri tual, intellectual self-development, emotional self-regulation, and physical develop ment. In this case, the student himself is a real object. He must master the methods of activity within his interests and capabilities. This competence includes personal hygiene rules, care for his own health, sexual communication culture, and internal ecological culture (Feyziyev, Ibrahimov, Bediyev, 2011, pp. 254-261).

Using a competent approach, it is considered important to acquire the following competencies that play a special role in human activity: literacy to understand complex written texts; numerical literacy to work with numbers and measurable quantities, count them, and perform various operations on them; acquiring appropriate knowledge, skills, and habits to choose the right life position and form a lifestyle in different circumstances, and mastering a system of academic knowledge (Mehrabov, 2010).

Competencies that play a key role in the field of activity can be grouped as follows: reproducibility of complexity; shrewdness, intelligence, openness; normality, honesty; cooperativeness (a form of labor activity based on the cooperation and joint work of many people); historicity (Methodology and pedagogy (Manual based on the updated framework document), MIG/Certification, 2024).

The productivity of students' intellectual activity, the application of acquired knowled ge, skills, and habits in new conditions, the identification of cause-and-effect relation ships, the integration and synthesis of information, the search for information in alterna tive ways, the evaluation of both the process and its results, the formulation of hypot heses, the application of ideas to practice, and the level of development of other similar activities are directly related to the operational structure of thinking (Makhmutov, 1972, p. 174).

Different types of competence can be grouped as follows: skills related to different tendencies and clear goals for a clearer understanding of values; abilities and tendenci es to keep one's own activities in mind; ability to involve emotions in the process of activity; skills related to readiness for independent learning; skills related to seeking and using feedback; skills related to self-confidence, self-confidence; self-control skills; skills and habits related to thinking about the future, adaptation and abstraction; attentive attitude to problems related to achieving the set goal; freedom, originality of thinking; development of critical (theoretical) thinking; ability to be ready to solve complex problems; readiness to solve any controversial and disturbing issues; ability to conduct research to identify the capabilities and resources of the surrounding world (both material and human resources); absence of fatalism (belief in fate, destiny, fate); ability to use new ideas and innovations to achieve goals; confidence (belief) in the favorable attitude of society to innovations; stubbornness, the ability to keep one's word; ability to use resources; qualities related to trust, confidence, and trust; ability to express an attitude towards desirable and desired moral rules; personal responsibility; ability to participate in joint work to achieve goals; ability to arouse the desire to work together in other people to achieve the set goal; ability to listen to other people and treat their opinions with respect; ability to strive for subjective assessment of the perso nal potential of employees; skills related to resolving conflicts and mitigating disagree ments and conflicts; skills related to understanding pluralistic politics; skills related to preparing to engage in organizational and social planning, etc. (Feyziyev, Ibrahimov, Bediyev, 2011, pp. 254-259).

According to D.C. Raven's model, different types of competence can act as components of a certain competence and vice versa in different situations. These components of competence are divided into cognitive, affective, and volitional parts (Mammadli, 2022).

Polish scientists have come to the conclusion that the development of competen ce in people functioning at different levels should be associated with age. Optimal development of the personality throughout life, its active renewal and acquisition of various life skills are based on the formation of different types of competence in them depending on time (Ibrahimov, 2018).

The main goal of the education system in different countries is aimed at develo ping various competencies in learners. Such competencies include: related to the development of strategic-future-oriented skills; related to the specificity of knowledge and skills in individual subjects studied; related to the content of methodological-mana gement skills; related to the acceptance of social-communicative-collaborative skills, criticism and feedback; related to the motivation of normative-cultural-professional relations and readiness to achieve results; related to the skills of self-realization of the personality; related to socially oriented skills; competencies related to a certain sphere of activity (Feyziyev, Ibrahimov, Bediyev, 2011).

Orientation to the learners' interests in understanding, perception, free choice and responsibility for personal learning, assimilation of knowledge together with the methods of its transmission, free search for information constitute the basis for the formation of general skills (Zimnyaya, 2004). In order to develop the creative abilities of learners in a competent approach, they must acquire specific

knowledge, skills and habits related to the process being studied. These can be grouped as follows: understanding the prob lem; the ability to ask questions; skills related to putting forward hypotheses; giving scientific definitions to concepts; classification; conducting experiments; the ability to draw conclusions and sum up; skills related to structuring the studied material; the ability to explain, prove and defend one's own opinion, idea (Sadigov, 2009). The competent app roach, in its comprehensive meaning and values, reflects the deep theoretical and peda gogical aspects of the main points of the modernization process in education.

In modern times, empirical and theoretical thinking types are widely used in the formation of skills as a result of mastering the main content of training. Theoretical thinking is sharply different from empirical thinking, since it reflects the essence. Modern school should form mainly theoretical thinking, "rational-dialectical thinking" in students (Zimnyaya, 2005). At school, it is necessary to master the ways of accumulating this knowledge, rather than giving students knowledge in certain subjects. In this case, the teaching process does not only instill knowledge in students, but first of all, theoretical thinking or critical thinking, which are valuable qualities of the human mind, is formed in them (Ibrahimov, Huseynzade, 2013, pp. 63-79). Critical thinking is an integrative virtue of the mind, the school of the 21st century should begin the problem of educating thinking with the formation of critical (creative) thinking in students (Feyziyev, Ibrahimov, Bediyev, 2011, pp. 58-70).

## Conclusion

By expanding the application of the competency-based approach model in education, gradually abandoning the calls for in-depth teaching of individual subjects in general education schools, the main goal of the educational process is to form life skills, develop a highly intelligent, sound-minded, logical-thinking, and comp lete human personality who has mastered the integrated knowledge system, which is the main principle of the learner-oriented, result-oriented teaching-learning process.

## References

1. Abbasov, A. N., Mammadzade, R. R., & Mammadli, L. A. (2021). *Pedagogy: Communication* (Textbook for higher education institutions). Mutarcim.
2. Feyziyev, J. A., Ibrahimov, F. N., & Bediyev, S. R. (2011). *Didactics* (Textbook). Mutarcim.
3. Ibrahimov, F. N. (2018). *Essays on the basics of optimal ratios of algorithmic and heuristic activity in education* (Monography). Mutarcim.
4. Ibrahimov, F. N., & Huseynzade, R. L. (2013). *Pedagogy* (Textbook), in 2 volumes, Volume I. Mutarcim.
5. Makhmutov, M. I. (1972). *Theory and practice of problem-based training*. Ka-Zhan.
6. Mammadli, L. A. (2022). *Theory of pedagogy: Textbook*. Mutarcim.
7. Mammadzadeh, R. H. (2010). *Quality in education as one of the leading directions*. Teacher.
8. Mehrabov, A. O. (2010). *Conceptual problems of modern education*. Mutarcim.
9. Methodology and pedagogy (Manual based on the updated framework document), MIG/Certification. (2024). *Maximum Training Center*.
10. Sadigov, F. B. (2009). *Pedagogy* (Textbook). Adiloglu Publishing House.
11. Zimnyaya, I. A. (2004). Competence approach to education. *Problems of Quality Education, 4*.
12. Zimnyaya, I. A. (2005). General culture and social-professional competence of a person. *High Education Today, 11*.

Received: 27.01.2025
Accepted: 22.04.2025

DOI: https://doi.org/10.36719/2663-4619/115/14-16

**Ceyran Kuliyeva**
Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universiteti
psixologiya üzrə fəlsəfə doktoru
https://orcid.org/0009-0009-2554-3750
kuliyevaceyran@gmail.com

# Müəllim-tələbə münasibətlərinin akademik motivasiya üzərindəki rolu

## Xülasə

Müəllim-tələbə münasibətləri təhsil təcrübəsinin ən vacib elementlərindən biridir və akademik motivasiyanın formalaşmasında mühüm rol oynayır. Müəllimlər və tələbələr arasında müsbət münasibətlər təhsildə öyrənmə üçün əlverişli mühit yaradır, özünə inamı artırır və akademik səyləri təşviq edir. Digər tərəfdən, mənfi münasibətlər iştirakın azaldılması, narahatlıq və akademik zəifliklə nəticələnə bilər. Bu tezis, müəllim-tələbə münasibətlərinin tələbələrin öyrənmə motivasiyasına təsirini araşdırır, emosional dəstək, müəllim gözləntiləri və ünsiyyət üslubları kimi əsas amilləri tədqiq edir. Araşdırma, həmçinin təhsil praktikasına olan təsirləri və təhsil mühitlərində güclü müəllim-tələbə münasibətlərinin təşviq edilməsinin vacibliyi haqqında müzakirə edir.

***Açar sözlər:*** *müəllim-tələbə münasibətləri, akademik motivasiya, emosional dəstək, iştirak, təhsil praktikası*

**Jeyran Kuliyeva**
Azerbaijan State University of Culture and Arts
PhD in Psychology
https://orcid.org/0009-0009-2554-3750
kuliyevaceyran@gmail.com

# The Role of Teacher-Student Relationships on Academic Motivation

## Abstract

Teacher-student relationships are one of the most important elements of the educational experience and play a significant role in shaping academic motivation. Positive relationships between teachers and students create a conducive environment for learning, enhance self-confidence, and encourage academic effort. On the other hand, negative relationships can lead to decreased engagement, anxiety, and academic underachievement. This thesis explores the impact of teacher-student relationships on students' learning motivation, examining key factors such as emotional support, teacher expectations, and communication styles. The study also discusses the implications for educational practice and the importance of fostering strong teacher-student relationships in educational settings.

***Keywords:*** *teacher-student relationships, academic motivation, emotional support, engagement, educational practice*

## Giriş

Müəllim-tələbə münasibətləri, tələbənin təhsil yolundakı ən təsirli faktorlardan biridir. Emosional dəstək, rəhbərlik, hörmət və ünsiyyət kimi müxtəlif elementləri əhatə edir. Bu münasibət, tələbənin akademik motivasiyasına, iştirakına və ümumi performansına əhəmiyyətli dərəcədə təsir göstərə bilər. Akademik motivasiya, öyrənmə fəaliyyətlərinə qoşulmaq və təhsil hədəflərinə çatmaq üçün əzmkarlıqla mübarizə aparmaq istəyi kimi tərif olunur (Rzayeva, 2017, s. 67). Müsbət müəllim-tələbə münasibətləri, motivasiyanın artması ilə əlaqələndirilir, mənfi münasibətlər isə iştirakın azalmasına və akademik nailiyyətin aşağı düşməsinə səbəb ola bilər.

Bu münasibətlərin dinamikasını başa düşmək, dəstəkverici, motivasiyaedici və təsirli təhsil mühitləri yaratmaq istəyən müəllimlər üçün vacibdir (Ahmadov, 2013).

**Tədqiqat**

Əsas aspektlərindən biri emosional dəstəkdir. Araşdırmalar göstərir ki, müəllimlər emosional qayğı, təşviq və anlayış göstərdikdə, tələbələr özlərini qiymətləndirilmiş və təhsil fəaliyyətlərində dəstəklənmiş hiss edirlər. Müəllim tərəfindən göstərilən emosional dəstək, tələbələrə özünə inam yaratmağa və sinifdə aidiyyət hissi inkişaf etdirməyə kömək edir ki, bu da birbaşa olaraq öyrənmə motivasiyasını artırır (Əliyev, 2010). Tələbələr öz müəllimlərinin onların rifahını və akademik uğurlarını düşündüklərini hiss etdikdə, dərslərə fəal şəkildə qatılmağa, tapşırıqları vaxtında yerinə yetirməyə və akademik mükəmməllik uğrunda çalışmağa daha çox meylli olurlar. Bundan əlavə, emosional dəstək, akademik performansa mane olan narahatlıq və stress hisslərini azaltmağa kömək edir (Hamre, Pianta, 2001, s. 38).

Müəllim gözləntiləri, müəllim-tələbə münasibətlərinin digər bir vacib komponentidir. Araşdırmalar göstərir ki, yüksək gözləntilərə sahib olan müəllimlər, tələbələrdə daha yüksək motivasiya və nailiyyət səviyyələrinə rast gəlirlər (Dweck, 2006). Müəllimlər tələbənin uğur qazanma qabiliyyətinə inamlarını ifadə etdikdə, bu, böyümə yönümlü bir düşüncə tərzi yarada bilər, yəni, zəka və bacarıqların əzmkarlıq və səy ilə inkişaf etdirilə biləcəyinə dair inam (Yavuzer, 2006, s. 77). Bu da öz növbəsində tələbənin öyrənmə tapşırıqlarına olan daxili motivasiyasını artırır. Əksinə, müəllimlər aşağı gözləntilər göstərdikdə və ya tələbələrinə olan inamlarını ifadə etmədikdə, tələbələr bu mənfi inanclara daxilləşərək öyrənmə prosesindən uzaqlaşa bilərlər (Rubinshteyn, 2003, 2003, s. 26). Buna görə də, müəllimin tələbələrini necə gördüyü və onlarla necə ünsiyyət qurduğu, tələbələrin akademik məqsədlərə çatmaq üçün motivasiyalarına birbaşa təsir edir (El'konin, 1989).

Effektiv ünsiyyət, müsbət müəllim-tələbə münasibətlərinin əsasıdır. Aydın, hörmətli və dəstəkləyici ünsiyyət, etibar və qarşılıqlı hörmət atmosferi yarada bilər ki, bu da akademik motivasiyanın təşviq edilməsi üçün vacibdir (Ekinci, 2011). Müəllimlər, tələbələrinə aktiv dinləyərək, müsbət rəylər verərək və akademik inkişafları haqqında mənalı dialoqlar apararaq tələbələrin motivasiyasına və öyrənmə prosesində müstəqillik hissinə kömək edirlər (Şimşek, 2007). Tərsinə, pis ünsiyyət yanlış anlamalar, rəylərin olmaması və ya laqeyd yanaşmalar tələbələrin özünə inamını zəiflədə və akademik iştirakı maneəyə çevirə bilər. Buna görə də, ünsiyyət üslubları, tələbələrin dərslərə qatılmaq və akademik məqsədlərini izləmək üçün necə motivasiya olduqlarında əsas rol oynayır (Davydov, 1996; Wentzel, 1997).

Öyrənmə fəaliyyətlərinə qatılmaq, motivasiya ilə sıx bağlıdır və müəllim-tələbə münasibətləri bu iştirakın təşviqində mühüm rol oynayır. Tələbələr müəllimlərindən hörmət və anlayış hiss etdikdə, məzmunla əlaqəli olmaq və öyrənməyə səy göstərmək üçün daha çox motivasiya olurlar (Kuruoğlu, 2012). Bundan əlavə, güclü müəllim-tələbə münasibətləri, tələbələrin akademik risklər almaq, suallar vermək və lazım olduqda kömək axtarmaq üçün rahat olduqları təhlükəsiz və inklüziv bir mühit yaradır. Nəticədə, tələbələr dərslərdə fəal iştirak etməyə, həmkarları ilə əməkdaşlıq etməyə və öyrənmələrini yaxşılaşdırmaq üçün əlavə resurslar axtarmağa daha çox meylli olurlar (Hüseynov, 2014, s. 89). Əksinə, zəif müəllim-tələbə münasibətləri səbəbindən iştirakın olmaması, akademik iştirakın olmaması ilə nəticələnə bilər ki, bu da tələbələrin tapşırıqları yerinə yetirməməsi, dərsləri keçməsi və akademik məqsədləri izləməməsi ilə nəticələnə bilər (Deci, Ryan, 2000).

Müəllim-tələbə münasibətlərinin akademik motivasiya üzərindəki mühüm rolu nəzərə alındıqda, müəllimlərin tələbələrlə güclü və dəstəkləyici münasibətlər qurmağa üstünlük verməsi vacibdir. Müəllimlər, empatik olmaqla, yüksək gözləntiləri qorumaqla və müsbət ünsiyyət strategiyalarından istifadə etməklə bu münasibətləri təşviq edə bilərlər (Mammadov, 2011). Bundan əlavə, müəllimlər üçün peşəkar inkişaf proqramları, xüsusilə tələbələrin emosional və sosial ehtiyaclarını nəzərə alan effektiv münasibət qurma texnikaları barədə təlimlər daxil etməlidir. Məktəblər və təhsil sistemləri, həmçinin müəllimlər və tələbələr arasında, eləcə də müəllimlər, valideynlər və geniş icma arasında əməkdaşlığı təşviq edən siyasətləri dəstəkləməlidir (Öztürk, 2013, s. 105). Müsbət və motivasiyaedici bir sinif mühiti yaratmaq üçün tələbələrin akademik və emosional ehtiyaclarını dəstəkləmək üçün kollektiv bir səylə çalışmaq lazımdır (Skinner, Belmont, 1993).

Emosional dəstək, yüksək gözləntilər və effektiv ünsiyyət vasitəsilə müəllimlər, tələbələrin fəal şəkildə öyrənməyə cəlb olunmasını və akademik uğura nail olmaq üçün səylərini təşviq edən müsbət bir mühit yarada bilərlər (Vygotsky, 1978).

## Nəticə

Bu günün təhsil sistemində tələbələrin üzləşdiyi artan təzyiqləri nəzərə alaraq, müəllimlərin tələbələrə motivasiya verməkdə münasibətlərin rolunu dərk etməsi daha da vacibdir. Müəllim-tələbə münasibətlərinə sərmayə qoymaqla, müəllimlər tələbələrin akademik məqsədlərinə çatmaq və təhsil yolunda uğur qazanmaq üçün lazım olan motivasiyanı və dözümlülüyü inkişaf etdirə bilərlər.

## Ədəbiyyat

1. Ahmadov, M. (2013). *Təhsilin psixologiyası*. Bakı: Elm və Təhsil.
2. Davydov, V. V. (1996). *Psikhologiya i pedagogika: Teoriya i praktika*. Moskva: VLADOS.
3. Deci, E. L., & Ryan, R. M. (2000). The "What" and "Why" of goal pursuits: Human needs and the self-determination of behavior. *Psychological Inquiry, 11*(4), 227–268. https://doi.org/10.1207/S15327965PLI1104_01
4. Dweck, C. S. (2006). *Mindset: The new psychology of success*. New York: Random House.
5. El'konin, D. B. (1989). *Psikhologiya razvitiya*. Moskva: Prosveshcheniye.
6. Ekinci, S. (2011). *Təhsil psixologiyası*. İstanbul: Nobel Nəşriyyatı.
7. Hamre, B. K., & Pianta, R. C. (2001). Early teacher–child relationships and the trajectory of children's school outcomes. *Developmental Psychology, 37*(3), 586–597 https://doi.org/10.1037/0012-1649.37.3.586
8. Hüseynov, A. (2014). *Tələbələrin motivasiyası və təhsil nəticələri*. Bakı: Nurlan.
9. Kuruoğlu, G. (2012). *Psixologiya və təhsil*. Ankara: Siyasal Kitabevi.
10. Leontyev, A. N. (1975). *Deyatel'nost', soznaniye, lichnost'*. Moskva: Pedagogika.
11. Mammadov, T. (2011). *Təhsil psixologiyasının əsasları*. Bakı: Elm və Təhsil Nəşriyyatı.
12. Öztürk, M. (2013). *Psixoloji məsləhət və rəhbərlik*. Ankara: Ani Yayınları.
13. Rzayeva, N. (2017). *Psixoloji dəstək və təhsil*. Bakı: Azərbaycan Universiteti.
14. Rubinshteyn, S. L. (2003). *Osnovy obshchey psikhologii*. Sankt-Peterburg: Piter.
15. Şimşek, H. (2007). *Təhsil psixologiyası*. Ankara: Pegem Akademiyası.
16. Skinner, E. A., & Belmont, M. J. (1993). Motivation in the classroom: Reciprocal effects of teacher behavior and student engagement across the school year. *Journal of Educational Psychology, 85*(4), 571–581. https://doi.org/10.1037/0022-0663.85.4.571
17. Vygotsky, L. S. (1978). *Myshleniye i rech'*. Moskva: Izdatel'stvo Akademii nauk SSSR.
18. Wentzel, K. R. (1997). Student motivation in middle school: The role of perceived pedagogical caring. *Journal of Educational Psychology, 89*(3), 411–419. https://doi.org/10.1037/0022-0663.89.3.411
19. Yavuzer, Y. (2006). *Uşaq psixologiyası*. İstanbul: Remzi Kitabevi.
20. Əliyev, R. (2010). *Müəllim-tələbə münasibətlərinin psixologiyası*. Bakı: Təhsil.

Daxil oldu: 18.12.2024
Qəbul edildi: 21.03.2025

DOI: https://doi.org/10.36719/2663-4619/115/17-21

**Arzu Abbasova**
Naxçıvan Dövlət Universiteti
filologiya üzrə fəlsəfə doktoru
https://orcid.org/0009-0005-3264-9538
arzu088@gmail.com

# Qədim türk qaynaqlarındakı Qərbi Azərbaycan toponimləri və onların erməniləşdirilmiş variantları

## Xülasə

Dilin lüğət tərkibindəki maraqlı söz qruplarından biri də toponimlərdir. Toponimlər hər bir xalqın tarixində xüsusi əhəmiyyət kəsb edir. Məhz buna görədir ki, dilin onomastik tərkibində toponimlər ən qədim leksik vahid hesab olunur. Müxtəlif dillərə məxsus toponimlərin bir çoxunun yaranma tarixi həmin dillərin yazılı abidələrinin tarixindən xeyli qədimdir.

Qədim türk qaynaqları üzrə toponimik araşdırmalar zamanı Qərbi Azərbaycanda mövcud olan tarixi toponimlərin tərkibində Azərbaycan dilinin qədim dialekt sözlərinə təsadüf olunur ki, bu sözlərin bir qismi dilimizdə işlənir, bir qismi isə mənasını dəyişərək dialektizm kimi dilimizdə işlənməkdədir.

Toponimik tədqiqatlar göstərir ki, Osmanlı dövrünün qaynaqlarında inzibati ərazi baxımından bütöv Azərbaycanın tərkib hissəsi olan Naxçıvan və onun ətraf bölgələrindən olan Qərbi Azərbaycan toponimlərinin əksəriyyəti bu günə qədər qorunub saxlanılsa da, təəssüflə qeyd etməliyik ki, tarixi proseslərin nəticəsi kimi itirilmiş ərazilərimizdəki coğrafi adların xeyli hissəsi siyasi-ideoloji məqsədlərlə dəyişdirilmiş və ya tamamilə aradan qaldırılmışdır.

***Açar sözlər:*** *Qədim türk qaynaqları, Qərbi Azərbaycan, toponimlər, leksik vahid, Osmanlı qaynaqları*

**Arzu Abbasova**
Nakhchivan State University
PhD in Philology
https://orcid.org/0009-0005-3264-9538
arzu088@gmail.com

# Toponyms of Western Azerbaijan in Ancient Turkic Sources and Their Armenianized Versions

## Abstract

One of the most intriguing groups of words in the language's vocabulary are toponyms. Toponyms hold special significance in the history of every nation. That is why, within the onomastic structure of a language, toponyms are considered among the oldest lexical units. The origins of many toponyms from various languages date back to times much earlier than the written monuments of those languages.

Toponymic research based on ancient Turkic sources reveals that the historical toponyms of Western Azerbaijan contain words from the ancient dialects of the Azerbaijani language. Some of these words are still in use today, while others have changed in meaning and continue to exist in the language as dialectisms.

Toponymic studies show that although the majority of toponyms from Western Azerbaijan — including Nakhchivan and its surrounding areas, which are mentioned in Ottoman sources as integral parts of a unified Azerbaijan — have been preserved to this day, it is unfortunate that, as a result of historical processes, many geographical names in the lost territories have been altered or completely erased for political and ideological purposes.

***Keywords:*** *ancient Turkic sources, Western Azerbaijan, toponyms, lexical unit, Ottoman sources*

## Giriş

Dilin lüğət tərkibindəki maraqlı söz qruplarından biri də toponimlərdir. Toponimlər hər bir xalqın tarixində xüsusi əhəmiyyət kəsb edir. Məhz buna görədir ki, dilin onomastik tərkibində toponimlər ən qədim leksik vahid hesab olunur. Müxtəlif dillərə məxsus toponimlərin bir çoxunun yaranma tarixi həmin dillərin yazılı abidələrinin tarixindən xeyli qədimdir.

S. Mollazadə yazır: «Toponimlər təkcə coğrafi obyektlərin ünvanı deyil, onlar həm də qədim dillərin, o dildə danışan xalqların canlı şahidləridir» (Quliyev, 2007, s. 6).

Toponimlərin bir qisminin zəngin informasiya yükünə malik olduğunu qeyd edən A. Qurbanov A. V. Superanskayanın fikri ilə razılaşaraq göstərir ki, toponimlər tarixin aynasıdır (Mollazadə, 1985, s. 362).

**Tədqiqat**

Tarixən qədim türk torpaqları olmuş, hazırda isə başqa xalqların müstəmləkəsinə çevrilmiş ərazilərimizdə – xüsusilə Güney Azərbaycanda (Iranda), indiki Ermənistan ərazisi olan Qərbi Azərbaycanda, Rusiyada, Gürcüstanda və bir çox başqa bölgələrdə fonetik dəyişikliyə uğramış onomastik vahidlərdə səsin əvəzlənməsi nəticəsində küllü miqdarda yer – yurd və şəxs adlarımızın mənası da dəyişdirilmişdir» (Hacıyeva, 2008, s. 115).

Qədim türk qaynaqları üzrə toponimik araşdırmalar zamanı Qərbi Azərbaycanda mövcud olan tarixi toponimlərin tərkibində Azərbaycan dilinin qədim dialekt sözlərinə təsadüf olunur ki, bu sözlərin bir qismi dilimizdə işlənir, bir qismi isə mənasını dəyişərək dialektizm kimi dilimizdə işlənməkdədir.

XVIII əsr İrəvan əyalətinin Xınzırək nahiyəsində Ağnadərə, Çaltəpə, Astadingil, Çatıqıran, Xəlilxarabası və s. bu kimi toponimlər Azərbaycan – türk dilinin qədim dialektal xüsusiyyəti kimi özünü göstərir (Hacıyeva, 2007, s. 307-310).

Toponimik tədqiqatlar göstərir ki, Osmanlı dövrünün qaynaqlarında inzibati ərazi baxımından bütöv Azərbaycanın tərkib hissəsi olan Naxçıvan və onun ətraf bölgələrindəki toponimlərin əksəriyyəti bu günə qədər qorunub saxlansa da, təəssüflə qeyd etməliyik ki, tarixi proseslərin nəticəsi kimi itirilmiş ərazilərimizdəki coğrafi adların xeyli hissəsi siyasi – ideoloji məqsədlərlə dəyişdirilmiş və ya tamamilə aradan qaldırılmışdır (Bayramov, 2002).

Vaxtı ilə İrəvan ərazisində mövcud olan türkmənşəli toponimlərin tarixi qaynaqlarda göstərilən qədim adlarının son dövrlərdə tamamilə kökündən dəyişdirilməsi faktı antitürk erməni siyasətinin və türklərə qarşı mənəvi soyqırımının bariz nümunəsidir. Bu barədə müxtəlif mənbələrdən, kitablardan, məqalə və sənədlərdən istənilən qədər tarixi fakt və məlumatlar əldə etmək mümkündür. İndiki Ermənistan ərazisindəki Azərbaycan – türk tarixinin izlərini tamamilə silmək və məhv etmək məqsədilə bu ərazidəki qədim türk toponimlərinin dəyişdirilməsinə hələ sovet dövründən xüsusi diqqət yetirilmişdir (Budaqov, Qeybullayev, 1998).

Erməniləşdirilmiş qədim türk toponimlərinin tədqiqində ən dəyərli qaynaqlardan biri akademik B. Budaqovun Q. Qeybullayevlə birgə hazırladığı «Ermənistanda Azərbaycan mənşəli toponimlərin izahlı lüğəti» əsəridirsə, digər qaynaqlardan biri də Ə. Ələkbərlinin «Qədim oğuz – türk yurdu Ermənistan» əsəridir ki, bu əsərdə də yüzlərlə erməniləşdirilmiş qədim toponimlərimiz haqqında rəsmi statistik məlumatlar öz əksini tapır. Ermənistan SSR Ali Sovetinin konkret tarixi rəsmi sənədləri – fərmanları əsasında yazılmış bu əsər ermənilərin son 70 ildə Ermənistandakı türk mənşəli qədim yer – yurd adlarını saxtalaşdırmaqla erməniləşdirmək kimi məkirli siyasətini ortaya qoyur. Əsərdən aydın olur ki, ermənilər Azərbaycan – türk toponimlərini müxtəlif prinsiplərlə dəyişdirmişlər. Belə prinsiplərin bir qismini qeyd etmək yerinə düşər (Məmmədov, 2001; Qurbanov, 1988):

1. Sovet ideologiyasını təbliğat bəhanəsi ilə toponimlərin dəyişdirilməsi:

Böyük Qarakilsə – Kirovakan (Böyük Qarakilsə rayonu).
Gümrü – Aleksandropol – Leninakan (Düzkənd rayonu).
Qaranlıqdərə – Lusadzor (tərcüməsi: Işıqlıdərə; Karvansaray rayonu).
Çanaxçı – Sovetaşen (Vedi rayonu).

2. Erməni millətindən olan ayrı – ayrı yazıçı, inqilabçı və başqa tarixi şəxsiyyətlərin adını əbədiləşdirmək bəhanəsi ilə toponimlərin dəyişdirilməsi:

3. Ellər – Abovyan (Ellər rayonu).

Kəvər – Yeni Bayazid – Kamo (Kəvər rayonu).

Böyük Şəhriyar – Nalbandyan (Sərdarabad rayonu).

Hərfi tərcümə (kalka) yolu ilə toponimlərin dəyişdirilməsi:

Daşqala – Karaberd (ermənicə «kar» - «daş», «berd» - «qala» deməkdir; Akin rayonu).

Gödəkbulaq – Karçaxpyur (ermənicə «karç» - «gödək», «axpyur» - «bulaq» deməkdir; Basarkeçər rayonu).

Göl – Liçk (ermənicə «liçk» - «göl» deməkdir; Aşağı Qaranlıq rayonu).

4. Bəzi adlardakı «böyük», «kiçik», «yuxarı», «aşağı» sözlərini ermənіləşdirməklə toponimlərin dəyişdirilməsi:

Böyük ayrım – Medzayrum (ermənicə «medz» – «böyük» deməkdir; Allahverdi rayonu).

Kiçik Vedi – Pokr Vedi (ermənicə «pokr» – «kiçik» deməkdir; Vedi rayonu).

Yuxarı Ağcaqala – Verin Ağcaqala (ermənicə «verin» – «yuxarı» deməkdir; Talin rayonu).

Aşağı Ağcaqala – Nerkin Ağcaqala (ermənicə «nerkin» – «aşağı» deməkdir; Talin rayonu).

5. Bəzi adlardakı «kənd» sözünü ermənicələşdirməklə toponimlərin dəyişdirilməsi:

Məlikkənd – Melikgyuğ (ermənicə «gyuğ» – «kənd» deməkdir; Abaran rayonu).

Lalakənd – Laligyuğ (Icevan rayonu).

Təzəkənd – Tazagyuğ (Zəngibasar rayonu).

6. Erməni tələffüzünə uyğunlaşdırılaraq toponimlərin dəyişdirilməsi:

Həkəri – Akori (Allahverdi rayonu).

Uzunlar – Odzun (Allahverdi rayonu).

Ərzəkənd – Arzakan (Axta rayonu).

Şınıx – Şnox (Allahverdi rayonu).

7. Bəzi yaşayış məntəqələrində ancaq azərbaycanlılar yaşadığı üçün onların adını tam şəkildə erməniləşdirmək mümkün olmasa da, tarixi coğrafi adları itirmək üçün müxtəlif bəhanələrlə keçmiş (əsl) adlar yeni azərbaycanlı adları ilə əvəz edilib:

Sultanabad – Şurabad (Amasiya rayonu).

Qaraçanta – Əzizbəyov (Amasiya rayonu).

Haqqıxlı – Səməd Vurğun (Icevan rayonu).

8. Tarixi adın itirilməsi üçün eyni bir yaşayış məntəqəsinin adı bir neçə dəfə dəyişdirilib:

Hacıqara – Makaraşen – Lernapat (Böyük Qarakilsə rayonu).

Qaradağlı – Tsaxkaşen – Mrqavet (Qəmərli rayonu).

Paşalı – Əzizbəyov – Zaritap (Soylan rayonu).

Sultanəliqışlaq – Canəhməd – Günəşli (Basarkeçər rayonu) (Ələkbərli, 1994, s. 66).

Erməni dili mütəxəssisləri M.X.Aberyan, R.A.Açaryan, A.A.Qriqoryan və başqalarının dediyinə görə, türk dillərinin, xüsusən də Azərbaycan dilinin erməni dilinə təsiri nəticəsində yeni erməni dilinin sintaktik quruluşu qədim dilin sintaktik quruluşundan kəskin surətdə fərqlənir (Abdullayev, 1992, s. 8).

Bu faktlar bir daha təsdiq edir ki, erməni dilinin başqa sahələrində olduğu kimi, onomastik sistemində fonetik baxımdan Türk dilinin güclü təsiri vardır. Qaynaqlar əsasında aparılan onomastik tədqiqatlar belə bir faktı əsaslandırır ki, qədim türk tayfaları və onların başçılarının adları, həmçinin bir çox türk sözləri erməni dilinə keçərək vətəndaşlıq hüququ qazanmış və erməniləşdirilmişdir. Ona görə də bu dil faktları əsasında elmi şəkildə öyrənmək vacib məsələlərdəndir (Əhmədov, 1991).

Osmanlı dövrü qaynaqları olan «Naxçıvan sancağının müfəssəl dəftəri» və «İrəvan əyalətinin icmal dəftəri»ndə qeydə alınmış bu etnosların adını daşıyan toponimlərin əksəriyyətinin eyni fonetik tərkibdə müasir dövrdə də işlənməsi faktı diqqəti cəlb edir (İrəvan əyalətinin icmal dəftəri, 1996).

Qədim türk qaynaqları üzrə aparılan araşdırmalardan bir daha aydın olur ki, qədim Azərbaycan – türk torpaqları olmuş indiki Ermənistan tarixi dövrlərdə Azərbaycan dövlətinin tərkib hissəsi olmaqla, daxili inzibati ərazi bölgüyə də malik olmuşdur (Kırzıoğlu, 1993).

Ermənistan Sovet Sosialist Respublikası Rəyasət Heyətinin qərarı ilə dəyişdirilmiş qədim Azərbaycan – türk mənşəli toponimlərdən bir qisminin adını əks etdirən cədvələ nəzər yetirək.

| S№ | Keçmiş ad | Dəyişdirilmiş yeni ad | Dəyişdirilmə tarixi |
|---|---|---|---|
| 1. | Alagöz | Araqats | 1950. |
| 2. | Almalı | Xndzorut | 12.11.1946. |
| 3. | Ağbulaq | Lusaxpyur | 26.04.19476. |
| 4. | Astazur | Şvanidzor | 22.04.1935. |
| 5. | Avdalağalı | Vavaşen | 03.01.1935. |
| 6. | Aşağı Adıyaman | Nerkin Getaşen | 07.12.1945. |
| 7. | Adamxan | Vardadzor | 03.07. 1968. |
| 8. | Aşağı Alçalı | Arsvanist | 27.09.1968. |
| 9. | Basarkeçər | Vardanes | 1969. |
| 10. | Başkənd | Geharkunik | 04.04.1946. |
| 11. | Bayandur | Vaqatur | 07.05.1969. |
| 12. | Birəli | Lancap | 03.07.1968. |
| 13. | Böyük Qarakilsə | Kirovakan | 03.01.1935. |
| 14. | Bəykənd | Medz Pərni | _ |
| 15. | Qarğabayar | Haykaşen | 25.05.1965. |
| 16. | Qoturbulaq | Tucur | _ |
| 17. | Qəmərli | Metsamor | 15.07.1946 |
| 18. | Qaraqoyun | Ferik | 25.01.1978. |
| 19. | Quşçu | Keçid | 12.11.1946. |
| 20. | Qaladərəsi | Qalidzor | _ |
| 21. | Qaraqala | Sevaberd | 21.06.1948. |
| 22. | Qarakilsə | Sisyan | 02.03. 1940. |
| 23. | Qaranlıqdərə | Xavaradzor | _ |
| 24. | Muğan | Hovdaliç | 25.01.1978. |
| 25. | Muğancıq | Haygedzor | 19.04.1950. |
| 26. | Muğan (Hacı Muğan) | Dzovazard | 25.01.1978. |
| 27. | Molladursun | Şaumyan | 03.01.1935. |
| 28. | Cadıqıran | Razdan | _ |
| 29. | Cul | Artavan | 19.04.1950. |
| 30. | Güney | Getaşen | 03.01.1935. |
| 31. | Göykilsə | Kanutan | 03.01.1935. |
| 32. | Güllücə | Zobk | 25.01.1978. |
| 33. | Göytur | Getan | 03.01.1935. |
| 34. | Güldüzü | Vardohovud | 1987. |
| 35. | Gorus | Qoris | _ |
| 36. | Yaşil | Kakavadzor | 12.11.1946. |
| 37. | Yelqovan | Kotyak | 03.01.1935. |
| 38. | Yanıqpəyə | Meşəkənd | 25.01.1978. |
| 39. | Xalisə | Korakert | 1991. |
| 40. | Düzkənd | Baroj | 03.01.1935. |
| 41. | Ortakənd | Qladzor | 10.09.1946. |
| 42. | Əlibəyli | Atarbeygaqn | 04.04.1946. |
| 43. | Uzuntala (poçt qəsəb.) | Kayan | 25.05.1967. |
| 44. | Muncuqlu | Tsilkar | 26.04.1946. |
| 45. | Haçasu | Aqaıur | _ |
| 46. | Həsənkənd | Şatin | 03.01.1935. |

| | | | |
|---|---|---|---|
| 47. | Tapanlı | Geğasar | 25.01.1978. |
| 48. | Kərimkənd | Tsixkaşen | 02.03.1940. |
| 49. | Küzəcik | Lancaxnyur | 19.04.1950. |
| 50. | Üçkilsə | Vağarşanat-Eçmiədzin | 12.03.1945. |
| 51. | Aşağı Türkmənli | Lusagyuğ | 03.01.1935. |
| 52. | Yuxarı Türkmənli | Anaqa | 03.01.1935. |
| 53. | Aşağı Qarxun | Çerarat | 04.04.1946. |
| 54. | Yuxarı Qarxun | Araks | 15.07.1946 |

## Nəticə

Onu da qeyd etmək lazımdır ki, tərcümə edilmiş və yeni adlarla əvəz edilmiş belə toponimlərin bir müddətdən sonra müəyyən rəsmi sənədlərdə bərpa edilməsi bir qədər çətinləşir və ya mümkünsüz olur. Məhz bu baxımdan toponimik tədqiqatlarda tarixi coğrafi adların müasir adlarla paralel verilməsi olduqca zəruridir.

## Ədəbiyyat

1. Abdullayev, Ə. Z. (1992). *Azərbaycan dili məsələləri*. Bakı Universiteti.
2. Bayramov, İ. (2002). *Qərbi Azərbaycanın Türk mənşəli toponimləri*. Elm.
3. Budaqov, B. Ə., & Qeybullayev, Q. Ə. (1998). *Ermənistanda Azərbaycan mənşəli toponimlərin izahlı lüğəti*. Oğuz eli.
4. Əhmədov, T. M. (1991). *Azərbaycan toponimikasının əsasları*. BDU.
5. Ələkbərli, Ə. (1994). *Qədim Türk – Oğuz yurdu – «Ermənistan»*.
6. Hacıyeva, Q. (2008). *Cənubi Azərbaycan toponimləri*. Elm.
7. Hacıyeva, Q. Ə. (2007). Ümumtürk dialekt leksikasında Azərbaycan və Türkiyə türkcəsinin yeri. I Uluslararası Türk Dili və Ədəbiyyatı Simpoziumu, Türkiyə - Isparta.
8. *İrəvan əyalətinin icmal dəftəri*. (1996). Elm.
9. Kırzıoğlu, F. (1993). *Osmanlıların Kafkas – İllerini Fethi (1451–1590)*. TTKB.
10. Məmmədov, H. (2001). *Naxçıvan sancağının müfəssəl dəftəri*. Elm.
11. Mollazadə, S. M. (1985). *Azərbaycan toponimləri*. Elm.
12. Quliyev, Ə. A. (2007). *Qədim Türk onomastikası*. ADPI.
13. Qurbanov, A. (1988). *Müasir Azərbaycan dilinin onomalogiyası*. Maarif.

Daxil oldu: 23.01.2025
Qəbul edildi: 01.05.2025

mövcuddur. Təbiətimiz zəngindir. Əlverişli iqlim şəraiti, məhsuldar torpaqlarımız təbii məhsulların həm çeşidinə, həm dadına öz təsirini göstərir (Qurbanov, 2011).

Qastronomiya turizminin inkişafı yalnız milli mətbəximizi deyil, həmçinin zəngin maddi-mədəni irsimizi, tarixi ənənələrimizi, mədəniyyətimizi də dünyaya tanıtmağa kömək edir. Ölkəmizin təmsil olunduğu bütün beynəlxalq tədbirlərdə milli kulinariyamız, bu sahədə olan turizm potensialı çox geniş şəkildə beynəlxalq ictimaiyyətə təqdim olunur və maraq doğurur.

**Mehriban Əliyevanın Mədəni İrsin təbliğatında, qorunmasında, o cümlədən UNESCO ilə əlaqələrin qurulmasında gördüyü işlərin əhəmiyyəti**

"Bu gün böyük mədəni irsə sahib çıxaraq onu bütün dünyada tanıtmaq və təbliğ etmək əsas prioritetlərdən biri olmalıdır", prinsipinə dayanaraq Azərbaycan hökuməti UNESCO ilə münasibətlərin davamlılığının və genişləndirilməsinin önəmliliyini anlayır. Çünki Azərbaycan hökuməti, xüsusilədə bu sahədə əvəzsiz rolu olan Azərbaycan Respublikasının I Vitse-Prezidenti Mehriban xanım Əliyevanın təşəbbüsləri təqdirəlayiqdir. Mehriban xanım Əliyevanın səyləri nəticəsində Azərbaycanın Maddi və Qeyri-maddi Mədəni irs nümunələri UNESCO-nun müvafiq siyahılarında yer almaqdadır. O hər zaman ölkəmizin Maddi və Qeyri-Maddi Mədəni İrsinin qorunub və gələcək nəsillərə ötürülməsi üçün UNESCO ilə əlaqələrin genişləndirilməsi və davamlı olmasını xüsusilə diqqətə çatdırır (Sümər, 1992).

Əgər UNESCO dan danışırıqsa Türk dövlətlərinin birgə bu siyahıya daxil edilən qastranomiya nümunələinin də adları çəkilməlidir. Azərbaycan, Türkiyə, Qırğızıstan və Qazaxıstanın 2016-cı ildə UNESCO-nun Qeyri-Maddi Mədəni İrsin qorunması üzrə Hökumətlərarası Komitəsinin Efiopiyanın paytaxtı Əddis Əbəbə şəhərində baş tutmuş 11-ci sessiyasında sırf Azərbaycanın təşəbbüsü ilə "Lavaş -nazik çörəyin hazırlanma və paylaşma mədəniyyəti" UNESCO-nun Qeyri-Maddi Mədəni İrs syahisına daxil edilmişdir. Daha sonra 2017-ci ildə Koreya Respublikasının Jeju adasında baş tutmuş UNESCO-nun Qeyri-Maddi Mədəni İrsin Qorunması üzrə Hökumətlərarası Komitənin 12-ci sessiyasında Azərbaycanın təqdim etdiyi "Mədəni kimliyin hissisi olan dolmanın hazırlanma və paylaşma ənənəsi" UNESCO-nun Qeyri- Maddi Mədəni İrs siyahısına daxil edilmişdir. Bunun necə böyük bir təşəbbüs olduğu qanında türkçülük, Azərbaycançılıq olan hər bir kəsə bəllidir. Çünki mənfur qonşularımız hər zaman dolmanı əsassız olaraq öz adları ilə dünyada təbliğ edir və bunu digər dünya xalqlarına da uydurma yalanlar ilə inandırmağa çalışırdılar (Ulusel, 2008). Hər əməllərinin yalan olduğu kimi təbii ki bu təşbbüsləri də artıq iflasa uğradı, artıq dünya qastronomiyasında və Mədəni İrs siyahısında dolmanın hansı millətə aid olduğu öz təsdiqini tapdı. Bu gün Türk xalqlarının qonaqpərvərliyini bilməyən inasnlar deməк olarki yoxdur. Dolma isə bütün mötəbər məclislərin sevilərək təqdim edildiyi təmalar arasında öz yerini tutmaqdadır. İstər bizim ölkəmizdə istərsədə qardaş Türkiyədə, o cümlədən digər Türk dövlətlərində dolma müxtəlif adlar ilə səfər edən turistlərə təqdim edilir və olduqca böyük maraq kəsb edir (Azərbaycanpro).

Turizmin inkişafına cavabdeh qurum olan Dövlət Turizm Agentli də bu sahədə son illərdə çox əhəmiyyətli işlərə imza atmışdır. Buna misal olaraq "Dövlət Turizm Agentliyi tərəfindən milli mətbəxin təbliğatında gənc nəsil aşpazların hazırlanması, milli kulinariya komandasının inkişafı və beynəlxalq yarışlarda iştirakın təmini istiqamətində məqsədyönlü tədbir" i göstərmək olar. Dövlət Turizm Agentliyinin tabeliyində olan Milli Kulinariya Mərkəzi tərəfindən bu günədək milli mətbəx nümunələrimizin tədqiqi, qorunması və tanıdılması üçün müəyyən vacib işlər görülüb. Hazırda kulinariya sahəsində təhsili inkişaf etdirməklə gənc, bu sahəni ürəkdən sevən, peşəkar aşpazların fəaliyyətinə dəstək verilməsi istiqamətində işlər davam etdirilir. Eyni zamanda, bununla zəngin kulinariya ənənələrimizi dünyaya çatdırmaq, bu istiqamətdə təbliğat işini gücləndirmək və beynəlxalq təşkilatlarla əməkdaşlığı genişləndirmək əsas fəaliyyət istiqamətlərindəndir (Suleymanova).

Yuxarıda sadalanan təbliğat təşviqat işləri ilə yanaşı son dövürlərdə araşdırmalar göstərir ki Türk dünyası qastronomiya sənətinə aid olan bir çox yemək növləri vardırki unudulmuş vəyaxud yaddan çıxmışdır. Əlbətdəki bu qastronomiya sənəti üçün böyük bir təhlükə hesab olunur (UNESCO üzrə Azərbaycan Respublikasının Milli Komissiyası).

Bəs yaxşı necə sahib çıxmalıyıq bu dəyərli mirasa? Necə qoruyub saxlmalı və gələcək nəsillərə ötürməliyik?

Təbii ki bununla əlaqəli ilk növbədə orta məktəblərdə, daha sonra orta isxtisas peşə məktəblərində, kolleclərdə və ən nəhayətində isə univerisitetlərdə qastranomiya sənəti ilə əlaqəli dərslər tədris olunmalı və təcrüblər keçirilməlidir. Bundan əlavə, əgər biz yeni nəsillər üçün davamlılıq, istehlak prioritetləri, kənd təsərrüfatı, istehsal imkanları kimi məsələlərin daha həyati əhəmiyyət kəsb edəcəyini nəzərə alsaq, artıq belə dərslərin fizika və kimya kimi əvəzsiz və lazımlı olacağını görərik (Xəlili).

Daha sonra atıla biləcək ən lazımi addımlar sırasında rəqəmsal mühitdə ən-ənəvi reseptləri və metodları, hazırlanma texniklarını qeyd etmək və böyük kütlələrə paylaşmaq üçün onlayın platformalar qurulmalıdır.

## Nəticə

Göründüyü kimi Azərbaycanda mətbəx turizminin inkişaf etdirilməsi üçün böyük potensial mövcuddur. Qastronomiya turizmi unikal qida tədarükü vasitəsilə destinasiyanın bu irsini araşdırmaq, ölkənin qida mədəniyyətinə yaxından bələd olmaq və bu irsi ölkə sərhədlərindən kənarda təbliğ etmək üçün ən yaxşı üsuldur.

Azərbaycan mədəniyyətinin və dəyərlərinin unikallığı ondadır ki, ənənələrlə yanaşı, həmdə innovasiyalara açıqlığı da özündə birləşdirir.

Sonda ümumiləşdirərək desək Türk xalqları tolerantlıqları, azadlıqsevərlikləri, vətənpərvərlikləri, sədaqətlilikləri, mərdlikləri, sözlə əməlin vəhdətinə riayət etmələri, mədəniyyətlərarası dialoqa hazırlıqları ilə fərqlənən millilik və ümumbəşəriliyin birliyini özlərində əks etdirməsi, təbiətə yaxınlıq, ekoloji şüurun inkişafı və.s bütün bunlar müasir dünya sivilizasiyası tərəfindən hörmətlə qarşılanan və tələb olunan dəyərlərə sahib olan nadir xalqlardır.

## Ədəbiyyat

1. Əhmədli, R. (2007). *Azərbaycan milli dövlətçilik məfkurəsi: Türçülük, müasirlik, islamçılıq*. Elm.
2. Gökalp, Z. (1991). *Türkçülük əsasları*. Maarif.
3. Gökalp, Z. (1976). *Türk töreleri*. İstanbul.
4. Heyət, C. (2009). *Türklərin tarix və mədəniyyətinə bir baxış (İslamdan əvvəl və islam dövrü)*. Aspoliqraf.
5. Həbibbəyli, Ə. (2011). *Sivilizasiyaların kəsişməsində türk dünyası*. Elm və təhsil.
6. Həbiboğlu, V. (1993). Qədim türklər üzərində düşüncələr. In L. N. Qumilyev, *Qədim türklər* (ön söz). Gənclik.
7. Kafesoğlu, İ. (1999). *Türk milli kültürü*. İstanbul.
8. Qumilyev, L. N. (1993). *Qədim türklər*. Gənclik.
9. Qurbanov, R. (2011). *Türk xalqlarının tarixi*. Bakı.
10. Sümər, F. (1992). *Oğuzlar*. Bakı: Yazıçı.
11. Ulusel, R. (2008). *Qloballaşma və harmoniya (Türk dilində)*. Elm.
12. Azərbaycanpro. (n.d.). *Qədim türk törələri: Ənənəvi xalq qanunları haqqında*. Azərbaycanda Miqrant və Məcburi Köçkünlərin Hüquqlarının Müdafiəsi İctimai Birliyi. https://azerbaycanpro.index.az/fastrans/1264n601
13. Suleymanova, S. (n.d.). *Türk xalqlarının tarixi*.
14. UNESCO üzrə Azərbaycan Respublikasının Milli Komissiyası. (n.d.). *YUNESKO-nun xoşməramlı səfiri Mehriban Əliyeva (2004–2022)*. https://www.unesco.az
15. Xəlili, A. (n.d.). *Kulinariya turizmi: Yemək və qastronomiya vasitəsilə mədəniyyətləri kəşf etmək*. https://vetennamine.az/kulinariya-turizmi-yemek-ve-qastronomiya-vasitesiyle-medeniyyetleri-kesf-etmek

Daxil oldu: 18.01.2025
Qəbul edildi: 27.04.2025

DOI: https://doi.org/10.36719/2663-4619/115/116-119

**Səadət Məhərrəmli**
Bakı Slavyan Universiteti
magistrant
https://orcid.org/0009-0002-1238-6054
meherremli515@gmail.com

# Feili bağlamanın semantik xüsusiyyətləri

## Xülasə

Feili bağlamalar Azərbaycan dilində əsas hərəkəti izah edən və ya tamamlayan qeyri-müstəqil söz birləşmələridir. Bu bağlamalar əsasən müxtəlif semantik funksiyalarla çıxış edir, məsələn, zaman, səbəb, tərzi-hərəkət və hal-vəziyyət mənalarını ifadə edir. Feili bağlamalar həm də çoxmənalıdır və onların semantik əlaqələri müasir Azərbaycan dilində geniş şəkildə işlənir. Məsələn, -ıb⁴ feili bağlama şəkilçisi, - araq² ilə sinonimlik münasibətində olub, həm şifahi, həm də yazılı dilin müxtəlif üslublarında fərqli funksiyalar yerinə yetirir. Feili bağlamalar, dilin qrammatik quruluşunda müxtəlif mənaların təzahürünə şərait yaradır və sinonimlik münasibətləri yaradır. Bu xüsusiyyətlər onların dilin zənginliyini artırır və müxtəlif dil üslublarında fərqli məna çalarları ifadə etməyə imkan verir.

***Açar sözlər:*** *feili bağlamalar, sinonimlik, semantik xüsusiyyətlər, qrammatik quruluş, dil üslubları*

**Saadat Maharramli**
Baku Slavic University
Master student
https://orcid.org/0009-0002-1238-6054
meherremli515@gmail.com

# Semantic Features of Verb Conjunction

## Abstract

In Azerbaijani grammar, verb conjunctions play a crucial role in linking two or more actions within complex syntactic structures. These conjunctions, which are non-independent and subordinate, provide additional meanings to the main verb, either completing or elaborating on it. Azerbaijani verb conjunctions are characterized by their rich system of morphemes, which allow for various grammatical nuances in the language. Among them, the suffix -ıb⁴ is particularly significant due to its broad semantic scope. It conveys meanings related to state, manner of action, cause, and time, with some overlapping in its usage with other conjunctions like -araq². These suffixes are distinguished not only by their meanings but also by their stylistic use in different contexts, such as in formal written language versus everyday speech. Furthermore, some verb conjunctions in Azerbaijani exhibit synonymic relationships, especially when the meanings are similar, even though the forms differ in usage and stylistic register.

***Keywords:*** *verb conjunctions, synonymy, semantic features, grammatical structure, language styles*

## Giriş

Dildə feili bağlamaların bir kateqoriya kimi funksional dəyəri müxtəlif quruluşlu sintaktik tərkiblər daxilində iki və ya çox hərəkət arasında əlaqə yaratmaqda müxtəlif morfoloji mənalar ifadə etməkdir. Bu vəziyyətdə bütün feili bağlamalar qeyri-müstəqil, əlavə hərəkət kimi, əsas hərəkətə tabe olur və əsas hərəkəti müxtəlif cəhətdən izah edir, tamamlayır (Dəmirçizadə, Quliyev, 1938) Azərbaycan dili zəngin şəkilçilərə malik olan və bütün feil köklərindən düzələ bilən feili bağlamalar dildəki əsas vəzifəsi etibarı ilə uyğunluq təşkil edir. Bu uyğunluq əsas vəzifə eyniliyi və feili bağlama

 

şəkilçilərinin əksəriyyətinin çoxmənalı olması müasir Azərbaycan dilində işlənən feili bağlama şəkilçiləri arasında xüsusi semantik münasibətin yaranmasına imkan verir (Abdullayev, 1992).

Müasir Azərbaycan dilində işlənmə genişliyinə və semantik tutmuna görə -ıb$^4$ feili bağlama şəkilçisi xüsusi yer tutur. Feili bağlamalar qrammatik cəhətdən əsas feilin fonunda müxtəlif məna çalarlıqları ifadə edir, feili bağlama ümumi şəkildə mövcud olan mənaları mətndə konkretləşərək müəyyən məzmunun ifadə olunmasına xidmət edir (Dəmirçizadə, 1978). Feili bağlamanın malik olduğu potensial mənalardan biri xüsusi sintaktik şəraitdə qabarıq ifadə olunaraq digər mənaların təzahürünə imkan vermir. Azərbaycan dili feili bağlamalarına xas olan bu xüsusiyyət (ümumi mənadan birinin konkret şəraitdə təzahür və başqa feili bağlamaların da həmin mənaya potensial şəkildə malik olması) onların arasında sinonimlik münasibətinin yaranmasına təsir edən başlıca amildir. -ıb$^4$ feili bağlama şəkilçisi müasir dilimizdə hal-vəziyyət, tərzi-hərəkət, səbəb və zaman mənaları iafə edir. Bu mənalardan bir qismi (tərzi-hərəkət, hal-vəziyyət) -araq$^2$ feili bağlama şəkilçisində də vardır (Cəfərov, 1959).

Kərbala yalvarıcı bir əda ilə irəliyə gəlib göyərçinin qabağında əli döşündə dayanar, tam müqəssir kimi boyunu bükərdi (S. Rəhimov); Uşaq gülümsədi, bir söz deməyərək qapını açıb həyətə girdi, xonçanı verib məsələni yavaşca anlatdı (Y. V. Çəmənzəminli).

Müasir dilimizdə paralel şəkildə işlənən bu feili bağlama şəkilçilərinin məna vahidliyi, onların dubletliyi barədə fikir söyləməyə haqq qazandırmır.

**Tədqiqat**

-ıb$^4$ və -araq$^2$ formaları mənaca xüsusi hallarda eyniyyət təşkil etsə də, işlənmə üslublarına görə fərqlənir (Azərbaycan Milli Elmlər Akademiyası Nəsimi adına Dilçilik İnstitutu, 1980) -ıb$^4$ şəkilçisi bir qayda olaraq ümumxalq danışıq dilində, şifahi nitqdə, - araq$^2$ şəkilçisi isə yalnız yazılı dildə (elmi, bədii üslub) işlənir. Şifahi nitqdə bütün vəziyyətlərdə -ıb$^4$ şəkilçisi, -araq$^2$ şəkilçisinin vəzifəsini daşıyır. Lakin -araq$^2$ şəkilçisindən fərqli olaraq, -ıb$^4$ şəkilçisi yazılı dildə də geniş şəkildə işlənir. Bu şəkilçini işlənmə tarixinin qədimliyi ilə bağlıdır.

-ıb$^4$ formasının məna çevikliyi onun işlənmə parametrinin genişləndirir, bir sıra morfoloji vahidlərdə yeni semantik münasibətini müəyyənləşdirir.

a) -ıb$^4$ şəkilçisi -an$^2$ feili sifət şəkilçisinin sinonimi kimi işlənir:

Həmişə gülüb-danışan Mərcan xala da son vaxtlar qaradinməz olmuşdu (Ə. Əylisli).

-Dayan bu da çilçırağın lampoçkaları.. Gəlib-gedən görən bizə nə deyir, ay xala, diqqət yetirin. (Mir Cəlal)

b)-ıb$^4$ şəkilçisi -mış$^4$ feili sifət şəkilçisinin sinonimi kimi işlənir:

Düşünmək olar ki, Vahid müəllim əsrinin mürəkkəb, keşməkeşli həyatını yaşamış, qalxıb-enmiş, düşüb-çıxmış, məhrumiyyətlər, zülmətlər, işıqlar görmüş (Mir Cəlal)

c) -ıb$^4$ şəkilçisi -dıq$^4$+mənsubiyyət feili şəkilçisinin sinonimi kimi işlənir.

Bəyimiz içəri girdi. Qayış-quyuşdan düzələn cilovu hara atıb-atmadığını bilmədik (S. Rəhimov)

2. -ınca$^4$ feili bağlama şəkilçisi. Bu feili bağlama şəkilçisinin qrammatik mənası zaman və zaman kəmiyyət ifadə etməkdir. Bundan əlavə -ınca$^4$ feili bağlama şəkilçisi Müasir Azərbaycan dilinda bir sıra formaların mənasını ifadə edərək, onların qrammatik sinonimi olur (Hüseynzadə,1983).

a) -ınca$^4$ feili bağlama şəkilçisi -caq$^2$ şəkilçisinin və -an$^2$ feili sifət şəkilçisi ilə "kimi" qoşmasının birləşməsindən əmələ gələn formanın sinonimi kimi işlənir. Məsələn:

Dünya müharibəsindən başlayıb bu çovğunlar iki ilə gələn xabərlər ucqar dağlar arasından keçib şehliyə çatınca yenə də nağıla və əqilli-başlı əfsanəyə çevrilirdi (S. Rəhimov)

Müştərək semantikalı formaların işlənmə üslublarında ciddi fərqlə qarşılaşırıq (Xəlilov, 2003):

-ınca$^4$ feili bağlama şəkilçisi əsasən, ədəbi dilin yazılı qolunda -caq$^2$ forması dialektlərdə "-an$^2$+ kimi" isə ümumxalq danışıq dilində daha çox işlənir.

"-an$^2$+kimi" və "-ınca$^4$" feili bağlama şəkilçisinin sinonimlik münasibəti diqqəti xüsusi cəlb edir. Necə olmuşdur ki, feili bağlama şəkilçisi qeyri-feili bağlama şəkilçisi ilə, həm də feili sifətlə qoşmanın birləşməsindən təşkil olunmuş analitik forma arasında sinonimlik münasibəti yaranmışdır? -ınca$^4$ feili bağlama şəkilçisi -ın$^4$ və -ca$^2$ tərkib hisslərindən ibarətdir. M. Hüseynzadə qeyd edir ki, -ınca$^4$ feili bağlama şəkilçisinin birinci yərkib hissəsi (-ın$^4$) qədim feili sifət şəkilçisi olan -qan$^2$ formasından törəmişdir. Qeyd edək ki, türk dillərində, eləcə də Azərbaycan dilində sonrakı feili

bağlama şəkilçilərinin birinci hissəsi feili sifət şəkilçisindən ibarət olur. Məsələn, -armaz², -anda², -arkən² və sair (Hüseynzadə, 1973).

Bizcə, feili bağlama şəkilçisinin ikinci tərkib hissəsi, yəni -ca² şəkilçisi müasir ədəbi dilimizdə işlənən "can" qoşmasının qalığıdır. Çünki:

a) -ınca⁴ feili bağlama şəkilçisinin müasir danışıq dilində, dialekt və şivələrdə -ıncanə² formasında işlənir;

b) -ınca⁴ feili bağlama şəkilçisinin mənalarından biri "can" qoşmasının mənası ilə eyniyyət təşkil edir. "can" qoşması adlıq halda işlənən feili sifətə, yönlük halda işlənən başqa sözlərə qoşulduqda zaman mənası ifadə edir; "icranın, hadisənin ya dəqiq zamanını, ya da zaman məsafəsi ilə birlikdə son nöqtəsini bildirir.

c) "can" qoşması müasir ədəbi dilimizdə "kimi" və "dək" qoşmalarının sinonimidir. Məhz "-ınca⁴" feili bağlama şəkilçisinin ikinci tərkib hissəsinin "can" qoşmasından törəməsinin nəticəsidir ki, -ınca⁴ feili bağlama şəkilçisinin tərkibində daşlaşaraq yeni funksiya ifadə edən qoşma ("can"), özünün əvvəlki semantikasını tamamilə itirməyib, başqa strukturda olsa da, "-an²+kimi" formasına sinonim olaraq işlənir. Deməli, yuxarıda qeyd etdiyimiz, sinonimlik münasibəti (-ınca⁴(-an²+kimi)) feili bağlama şəkilçisinin mənşəyi ilə əlaqədardır.

d) Azərbaycan dilində -ınca⁴ feili bağlama şəkilçisinin mənası bəzən şühudi keçmiş zaman şəkilçisi ilə -mı⁴ "sual şəkilçisinin" birləşməsindən yaranmış -dımı⁴ forması ilə ifadə olunur. Şübudi keçmiş zamanın əlaməti bu vəziyyətdə heç bir keçmiş zaman anlayışı ifadə etməyib, xüsusi modallıq yaranmağa xidmət edir, həm də potensial şəkildə olsa da, şərt mənası ifadə edir (Cəfərov, 1983). Bu formanın (-dımı⁴) məna ekvivalenti kimi qeyd etdiyimiz vəziyyətdə müasir Azərbaycan dilində demək olar ki, -ınca⁴ feili bağlama şəkilçisi işlənmir. -dımı⁴ forması vasitəsilə ilə ifadə olunan məna, bəzən də anlitik şəkildə reallaşır (-an²) kimi. Müqayisə edək:

1) Sən gəldinmi, mən gedəcəm.
2) Sən gələn kimi, mən gedəcəm.
3) Sən gəlincə, mənə gedəcəm.

Lakin məclis qızışdımı, başlandımı vurhavurdur,
Öz-özünə: "Daha vaxtdır..tez götürül..yol budur
Zaman özü sənsiz belə öz hökmünü verəcək,
Bəlkə bütün vicdanlara min bir iblis girəcək.."
(S. Vurğun)

3. -alı² feili bağlama şəkilçisi. Bu feili bağlama şəkilçisi vasitəsilə iş və hadisənin hansı zamandan başlandığı, ikinci dərəcəli hərəkətlə (feili bağlama ilə) əsas iş (feil) arasında nə qədər zaman kəmiyyəti olduğu ifadə olunur. (Xəlilov, 2003) Ümumxalq danışıq dilində az işlənən, lakin bədii üslubda yeri gəldikcə istifadə olunan bu feili bağlama şəkilçisi bir sıra formalarla sinonimlik münasibətində çıxış edir. -alı² feili bağlama şəkilçisi zaman, vaxt anlayışının başlanğıc, çıxış nöqtəsini bildirir. Eyni məna -an² feili sifət şəkilçisi ilə çıxışlıq halın əlamətini birləşməsi ilə də ifadə olunur:

a) Sən gələli mənim işlərim düz getmir.
b) Sən gələndən (sən gələndən bəri) mənim işlərim düz getmir.

Çıxışlıq hal şəkilçisinin sayəsində -andan² forması vasitəsilə hərəkətin, zamanın başlanğıc və çıxış nöqtəsi daha qabarıq ifadə olunur və hərəkətin özü -alı² formasından fərqli olaraq arxa plana keçir (Hüseynzadə, 1973). Maraqlısı odur ki, -anda² formasından sonra "bəri" qoşması da işlənir ki, bu da zaman başlanğıcının ifadəsini daha da qabarıqlaşdırır.

4. -anda² feili bağlama şəkilçisi. Bu feili bağlama şəkilçisi vasitəsilə əsasən, bəzən də hal-vəziyyət mənası ifadə edən feili bağlamalar əmələ gətirilir.

-anda² feili bağlama şəkilçisi xüsusi kontekstual şəraitdə şərt mənası ifadə edərək -sa² şəkilçisinin sinonimi kimi işlənir. Meymunun su boğazına çıxanda, balasını ayağının altına qoyar. Can xirtdəyə yığılanda, adam nəyə desən gedər (S. Rəhimov)

Feili bağlama şəkilçisi ilə ifadə olunan şərt mənasında qabarıq şəkildə zaman anlayışı da nəzərə çarpır (Azərbaycan Milli Elmlər Akademiyası Nəsimi adına Dilçilik İnstitutu, 1960). Elə buna görə də şərt mənalı -anda² feili bağlama şəkilçisi ilə işlənmiş tərkib, bir qayda olaraq şərt budaa cümləsinə

deyil, zaman budaq cümləsinə uyğun gəlir. Lakin bu, -anda² feili bağlama şəkilçisinin şərt çalarına malik olması qətiyyən inkar etmir. Formanın şərt şəklinin mənasına uyğun gəlməsi ümumi mətindən asanlıqla aydın olur (Cəfərov, Abdullayev, 2004).

## Nəticə

Bu məqalədə feili bağlamaların semantik xüsusiyyətləri və Azərbaycan dilindəki qrammatik funksiyaları araşdırılmışdır. Müasir Azərbaycan dilində feili bağlamalar, xüsusilə -ıb⁴, -araq², -ınca⁴, -alı² və -anda² şəkilçiləri müxtəlif məna çalarlıqları ilə istifadə edilir (Abasov, 1958). Bu bağlamalar əsas hərəkəti tamamlayır və ona əlavə məna qatır, xüsusən zaman, səbəb, hal-vəziyyət və tərzi-hərəkət kimi semantik münasibətləri ifadə edir. Feili bağlamalar həmçinin sinonimlik münasibətləri ilə də diqqət çəkir. Bu xüsusiyyətlər onların dilin müxtəlif üslublarında istifadəsini zənginləşdirir və dilin qrammatik çevikliyini artırır.

## Ədəbiyyat

1. Abasov, Ə. (1958). *Azərbaycan dilinin qrammatikası*. Azərnəşr.
2. Abdullayev, Ə. (1992). *Azərbaycan dili məsələləri*. Bakı Universiteti mətbəəsi.
3. Azərbaycan Milli Elmlər Akademiyası Nəsimi adına Dilçilik İnstitutu. (1980). *Müasir Azərbaycan dili* (3 cilddə). Elm.
4. Azərbaycan Milli Elmlər Akademiyası Nəsimi adına Dilçilik İnstitutu. (1960). *Azərbaycan dilinin qrammatikası* (I cild). Azərb. SSR EA nəşriyyatı.
5. Cəfərov, C., & Abdullayev, N. (2004). *Müasir Azərbaycan dilinin morfologiyası*. Bakı.
6. Cəfərov, C. Ə. (1983). *Nitq hissələrində keçid prosesləri*. Bakı.
7. Cəfərov, S. Ə. (1959). *Azərbaycan dilinin qrammatikası: Fonetika, morfologiya, 5–6-cı siniflər üçün*. Azərnəşr.
8. Dəmirçizadə, Ə., & Quliyev, D. (1938). *Qrammatika*. Bakı.
9. Dəmirçizadə, Ə. M. (1978). *Müasir Azərbaycan dili. I hissə*. Bakı.
10. Hüseynzadə, M. H. (1973). *Müasir Azərbaycan dili*. Maarif.
11. Hüseynzadə, M. H. (1983). *Müasir Azərbaycan dili: Ali məktəblər üçün dərslik; 3-cü hissə*. Maarif.
12. Xəlilov, B. Ə. (2003). *Müasir Azərbaycan dilinin morfologiyası. II hissə*. Bakı.

Daxil oldu: 20.12.2024
Qəbul edildi: 13.03.2025

DOI: https://doi.org/10.36719/2663-4619/115/120-125

**Samirə Babayeva**
Bakı Slavyan Universiteti
magistrant
https://orcid.org/0009-0007-0208-7903
samirababaeva@gmail.com

# İnternet resurslardan istifadə zamanı didaktik prinsiplər və strategiyalar

## Xülasə

Müasir təhsil sistemində veb resursların tətbiqi dərs prosesinin daha effektiv və interaktiv şəkildə təşkili üçün geniş imkanlar yaradır. Bu məqalədə veb resursların təhsildə istifadəsinin nəzəri və praktiki aspektləri, onların üstünlükləri, tətbiq strategiyaları, qarşıya çıxan çətinliklər və gələcək perspektivləri araşdırılmışdır.

Əsas məqamlar olan:veb resursların təhsildə rolu və üstünlükləri – İnteraktiv öyrənmə, fərdiləşdirilmiş yanaşma və rəqəmsal tədris alətlərinin təhsilə müsbət təsiri təhlil edilmiş, effektiv tətbiq strategiyaları – veb resursların dərs prosesinə uğurla inteqrasiya olunması üçün metodoloji yanaşmalar, fərdi və adaptiv öyrənmə modelləri və müəllimlərin rolu vurğulanmış, rəqəmsal transformasiya – süni intellekt, virtual və artırılmış reallıq texnologiyalarının təhsil prosesində istifadəsi, həmçinin blokçeyn texnologiyası ilə sertifikatlaşdırmanın potensialı müzakirə olunmuş, mövcud çətinliklər və həll yolları – infrastruktur problemləri, müəllimlərin rəqəmsal bacarıqlarının yetərsizliyi və şagirdlərin motivasiya məsələləri analiz edilmiş, bu problemlərin aradan qaldırılması üçün praktiki həll yolları təklif olunmuşdur.

Nəticə etibarilə, veb resursların təhsildə istifadəsi gələcəkdə daha da genişlənəcəyi və onların effektiv tətbiqi üçün strateji planlaşdırma, pedaqoji innovasiyalar və müəllim hazırlığı vacib rol oynayacağı qənaətinə gəlinmişdir.

***Açar sözlər:*** *veb resurslar, rəqəmsal təhsil, interaktiv öyrənmə, adaptiv öyrənmə, tədris strategiyaları, süni intellekt təhsildə, blokçeyn və sertifikatlaşdırma, onlayn təhsil platformaları, müəllimlərin rəqəmsal bacarıqları*

**Samira Babayeva**
Baku Slavic University
Master student
https://orcid.org/0009-0007-0208-7903
samirababaeva@gmail.com

# Didactic Principles and Strategies When Using Internet Resources

## Abstract

The use of web resources in the modern education system creates wide opportunities for more effective and interactive organisation of the educational process. This article discusses theoretical and practical aspects of the use of web resources in education, their advantages, application strategies, difficulties encountered and future prospects.

The main points are: the role and benefits of web resources in education - the positive impact of interactive learning, personalised approach and digital learning tools on education is analysed, effective application strategies are discussed - methodological approaches for successful integration of web resources into the learning process, individual and adaptive learning models and the role of teachers, digital transformation - the use of artificial intelligence, virtual and augmented reality technologies in the educational process, as well as the potency of web resources in the educational process.

 

It was concluded that the use of web-based resources in education will increase in the future and strategic planning, pedagogical innovation and teacher training will play an important role for their effective use.

***Keywords:*** *web resources, digital education, interactive learning, adaptive learning, teaching strategies, artificial intelligence in education, blockchain and certification, online education platforms, digital skills of teachers*

## Giriş

Müasir dövrdə informasiya və kommunikasiya texnologiyalarının (İKT) sürətli inkişafı təhsil sistemində fundamental dəyişikliklərə səbəb olmuşdur. Rəqəmsal alətlərin və veb resursların tədris prosesinə inteqrasiyası ənənəvi təhsil metodlarına alternativ yanaşmaların formalaşmasına gətirib çıxarmışdır. Xüsusilə pandemiya dövründə onlayn tədrisin geniş yayılması veb resursların təhsildə rolunu daha da artırmış və onların effektiv tətbiqi ilə bağlı yeni tədqiqatların aparılmasına ehtiyac yaratmışdır (Selwyn, 2016).

Veb resurslar təhsil prosesinin daha interaktiv, əhatəli və tələbəyönümlü olmasına şərait yaradır. Bu resurslar vasitəsilə müəllimlər və tələbələr dərs materiallarını rahatlıqla əldə edə, öyrənmə tempini fərdiləşdirə və müxtəlif multimedia vasitələri ilə biliklərini daha yaxşı mənimsəyə bilərlər. Eyni zamanda, rəqəmsal platformalar tələbələrin özünütəhsil imkanlarını genişləndirir və onların aktiv iştirakını təmin edir (Anderson, Dron, 2019).

Bununla belə, veb resursların təhsildə istifadəsi müəyyən didaktik prinsiplərə əsaslanmalı və düzgün metodiki yanaşmalar tətbiq edilməlidir. Effektiv öyrənmə mühiti yaratmaq üçün veb resursların məqsədəuyğunluğu, əlçatanlığı və interaktivliyi nəzərə alınmalı, eyni zamanda motivasiyaedici və praktik yanaşmalar tətbiq olunmalıdır. Didaktik prinsiplərə əməl olunmadıqda, veb resursların istifadəsi gözlənilən nəticələri verməyə və hətta təlim prosesini çətinləşdirməyə səbəb ola bilər (Qasımova, 2020).

Bu məqalənin məqsədi veb resursların təhsildə istifadəsinin tələbələrin akademik nailiyyətlərinə təsirini araşdırmaq, onların tətbiqində nəzərə alınmalı olan əsas didaktik prinsipləri və tədris strategiyalarını müəyyənləşdirməkdir. Məqalədə həm beynəlxalq, həm də yerli təcrübələr əsasında veb resursların effektiv istifadəsi üçün metodiki tövsiyələr təqdim olunacaq.

Bu tədqiqatın nəticələri müəllimlər, təhsil siyasəti formalaşdıran qurumlar və tələbələr üçün faydalı ola bilər. Məqalədə müasir təhsil texnologiyalarının ən yaxşı praktikalarına əsaslanaraq, rəqəmsal alətlərin öyrənmə prosesində necə optimal tətbiq edilə biləcəyi və onların səmərəliliyinin necə ölçüləcəyi təhlil ediləcəkdir (Əliyev, Məmmədova, 2022).

İnternetə çıxışın genişlənməsi və rəqəmsal texnologiyaların inkişafı tədris prosesinin daha effektiv, əlçatan və fərdiləşdirilmiş hala gəlməsinə şərait yaratmışdır. Veb resursların istifadəsi bir çox üstünlüklər təqdim edir ki, bunlar arasında interaktiv və vizual öyrənmənin faydaları, rəqəmsal alətlərin tədrisdə effektivliyi və fərdiləşdirilmiş, adaptiv öyrənmə imkanları xüsusi yer tutur (Təlim prosesində İKT-dən istifadə (Mühazirələr), 2020).

**Tədqiqat**

Tədqiqatlar göstərir ki, interaktiv və vizual materiallardan istifadə edən tələbələr mövzuları daha sürətli və effektiv şəkildə mənimsəyirlər. Ənənəvi mətn əsaslı öyrənmə metodları ilə müqayisədə interaktiv və vizual yanaşmalar daha çox hissi və koqnitiv (idrak) aktivliyə səbəb olur ki, bu da uzunmüddətli yaddaşın möhkəmlənməsinə kömək edir. Vizual öyrənmənin əsas üstünlüklərinə nəzər salsaq aydın olur ki şəkillər, diaqramlar, infoqrafikalar və video məzmunlar tələbələrin beynində daha güclü assosiasiyalar yaratmağa kömək edir. Bu da öz növbəsində məlumatın daha yaxşı yadda qalmasına xidmət edir. Riyaziyyat, fizika, kimya kimi fənlərdə abstrakt anlayışlar animasiyalar və interaktiv simulyasiyalar vasitəsilə izah edilə bilməsi isə çətin konseptlərin sadələşdirilməsinə şərait yaradır. Xüsusilə gənc tələbələr üçün vizual materiallar dərsə marağı artırır və diqqətin yayılmasının qarşısını alır, bu da öz növbəsində diqqətin artırılması və motivasiyanı təmin edir (Selwyn, 2016). İnteraktiv öyrənmənin əsas üstünlüklərinə gəldikdə isə onlayn testlər, simulyasiyalar və oyun əsaslı platformalar tələbələri passiv dinləyici olmaqdan çıxararaq onları öyrənmə prosesinin fəal

iştirakçısına çevirir, interaktiv veb resurslar tələbələrə çətin anlaşılan mövzuları istədikləri qədər təkrarlamaq və praktiki tapşırıqları icra edərək daha yaxşı mənimsəmək imkanı yaradır, həmçinin, tələbələr real həyatda tətbiq edilə bilən bacarıqları inkişaf etdirmək üçün praktiki tapşırıqlar üzərində işləyə bilirlər ki, bu da onlarda problemlərin həllinə yönəlmiş yanaşma vərdişləri formalaşdırır. Sadalananlara nümunə olaraq riyazi anlayışları interaktiv qrafiklər və animasiyalarla izah edən GeoGebra və Desmos, müxtəlif fənlər üzrə vizual və maraqlı izahatlar təqdim edən YouTube Education və TED-Ed, fizika, kimya və digər elmi fənlərdə laboratoriya təcrübələrini virtual şəkildə həyata keçirməyə imkan yaradan PhET Interactive Simulations kimi tətbiq və rəqəmsal alətləri göstərə bilərik. Bu qəbildən olan rəqəmsal alətlərin və ya veb resursların istifadəsi təhsil prosesini daha sistemli, səmərəli və əhatəli edir. Müasir təhsil platformaları və proqram təminatları dərsləri planlaşdırmaq, qiymətləndirmək və fərdiləşdirmək üçün geniş imkanlar yaradır. Rəqəmsal alətlərin effektivliyini artıran əsas faktorlar dərs materiallarının toplanması, tapşırıqların hazırlanması və qiymətləndirmə proseslərini daha çevik edərək müəllimlər üçün dərs planlaşdırmanın asanlaşması (onlayn təhsil platformaları), canlı dərslər, forumlar və mesajlaşma sistemləri müəllimlər və tələbələr arasında effektiv kommunikasiya yaratması (real vaxt rejimində aktiv ünsiyyət), süni intellekt əsaslı alətlər vasitəsilə tələbələrin zəif və güclü tərəflərini analiz edərək onlara fərdi öyrənmə planı təqdim edilməsidir (inkişafın izlənilməsi və fərdi tövsiyyələr). Məsələn, dərs materiallarının paylaşılması, tapşırıqların verilməsi və qiymətləndirilməsi üçün istifadə edilən Google Classroom və Moodle, canlı dərslərin keçirilməsi və interaktiv ünsiyyət üçün effektiv platformalardan olan Microsoft Teams və Zoom, yazılı işlərin yoxlanması və akademik dürüstlüyün təmin olunması üçün geniş yayılmış alətlər hesab olunan Grammarly və Turnitin bu resurslara bariz nümunədirlər (İnformasiya-kommunikasiya texnologiyalarından istifadə vasitəsilə təlim prosesinin idarə olunması, 2021).

Fərdiləşdirilmiş və adaptiv öyrənmə imkanlarına gəldikdə isə təhsil prosesində belə yanaşmaların tətbiqi mühüm əhəmiyyət daşıyır. Belə ki, hər bir tələbənin öyrənmə üslubu, bilik səviyyəsi və sürəti fərqlidir. Məhz bu xüsusiyyətləri nəzərə alaraq veb resurslar tələbələrə uyğun öyrənmə mühiti təqdim edə bilir. Fərdiləşdirilmiş öyrənmənin üstünlüklərindən danışarkən məhz bu yanaşmada adaptiv sistemlər vasitəsilə tələbənin bacarıqlarına uyğun tapşırıqlar təqdim etməklə şəxsi öyrənmə tempinə uyğunlaşma, süni intellekt əsaslı tədris platformaları tələbələrin inkişafını izləyərək fərdi tövsiyələr verməklə daha dəqiq zəif və güclü tərəflərin müəyyənləşdirilməsi, veb resurslar sayəsində tələbələr coğrafi və fiziki məhdudiyyətlər olmadan istənilən fənn üzrə bilik əldə edə bilməklə istənilən vaxt və məkanda öyrənmə imkanı əldə olunması üstünlük kimi qeyd oluna bilər. Adaptiv öyrənmə texnologiyaları və platformalarının ən məşhur nümunələri fərdi irəliləyişə əsaslanan təhsil platforması olan Khan Academy, xarici dillərin adaptiv metodlarla öyrədilməsi üçün populyar tətbiqlərdən olan Duolingo, tələbələrin bilik səviyyəsinə uyğun kurslar və tapşırıqlar təqdim edən Coursera və edX platformaları hesab oluna bilər (Məmmədov, 2019).

Həmçinin yaxın gələcəkdə böyük ehtimalla aktiv tətbiq oluna biləcək süni intellekt və adaptiv öyrənmə AI (Artificial Intelligence) texnologiyaları şagirdlərin bilik səviyyəsini təhlil edərək, onlara uyğun fərdi tədris proqramları təqdim edə bilər. Məsələn, ChatGPT və digər AI tutorları şagirdlərə suallarını cavablandıraraq fərdi yanaşma təmin edirsə, DreamBox və Smartick riyaziyyat öyrənən şagirdlər üçün adaptiv öyrənmə alətləri təklif edir (Şagirdlərdə media savadlılığını formalaşdırmaq: Haradan başlamalı?, 2024).

VR və AR texnologiyaları şagirdlərin fənləri daha real və interaktiv şəkildə mənimsəmələrinə kömək edir. Biologiya laboratoriyalarında virtual təcrübələrin aparılması ,tarix dərslərində tarixi hadisələrin VR vasitəsilə canlandırılması, blokçeyn texnologiyası vasitəsilə tələbələrin akademik göstəriciləri və sertifikatları təhlükəsiz və dəyişdirilməz şəkildə saxlanıla bilməsi, blokçeyn əsaslı diplom və sertifikat sistemlərinin yaradılması, ali təhsil müəssisələrində şəffaf və etibarlı qiymətləndirmə sistemlərinin tətbiq olunması effektiv tətbiq zamanı veb resursların təhsildə yaradacağı üstün fərqlər sırasına daxil edilə bilər (STEAM təhsil metodu: Təhsildə innovasiyanın zərurəti və beynəlxalq təcrübələr, 2024).

Veb resursların tədrisdə istifadəsi yalnız texnoloji yeniliklərin tətbiqi ilə məhdudlaşmır; onların effektivliyi üçün müvafiq *didaktik prinsiplər* nəzərə alınmalıdır. Bu prinsiplər tələbələrin təlim nəticələrini optimallaşdırmağa, öyrənmə prosesini daha sistemli və məqsədyönlü qurmağa kömək

edir. Didaktik prinsiplərin düzgün tətbiqi veb resursların səmərəliyini artırır və onların təhsil prosesinə real töhfə verməsinə şərait yaradır. Bu prinsiplərə aşağıda aydınlıq gətirməyə çalışaq (Metavers texnologiyalarının təhsildə rolu – Araşdırma, 2024).

Veb resursların seçimi və tətbiqi zamanı şagirdyönümlü yanaşma (və ya şagirdyönümlülük prinsipi) əsas tutulmalıdır. Bu, tələbələrin yalnız məlumatı passiv şəkildə qəbul etməsi deyil, eyni zamanda bilikləri aktiv şəkildə mənimsəməsi və tətbiq etməsi deməkdir.Əsas xüsusiyyətləri fərdi öyrənmə tempinə uyğun adaptiv sistemlərin istifadəsi, praktiki tapşırıqlar və simulyasiyalarla öyrənmənin dəstəklənməsi, özünütəhsili və tənqidi düşüncəni inkişaf etdirən açıq suallar və diskussiyalar olan bu yanaşmanı veb resurslardan Khan Academy (tələbələrin bilik səviyyəsinə uyğun dərs modullarını fərdiləşdirən platforma), PhET Interactive Simulations (Riyaziyyat və təbiət elmləri üzrə interaktiv laboratoriyalar) kimi resurslarda müşahidə edə bilirik (Təhsildə İKT, 2021).

Veb resurslardan istifadə zamanı təqdim olunan məlumatın açıq, konkret və yaş səviyyəsinə uyğun olması vacibdir. Bu öz növbəsində aydınlıq və uyğunluq prinsipinin göstəricisidir. Əks halda, tələbələrin anlaması çətinləşər və öyrənmə prosesinə mənfi təsir göstərər. Bu yanaşmada əsas tələblər: məlumatın strukturlaşdırılmış və sistematik olması, mövcud kurikulum və standartlara uyğun seçilməsi, səhih və etibarlı mənbələrə əsaslanmasıdır. Bu prinsipi özündə ən yaxşı əks etdirən veb resurslara Coursera və edX (Universitet professorları tərəfindən hazırlanmış akademik cəhətdən etibarlı kurslar) və Wikipedia Education Program-ı (etibarlı mənbələr əsasında yaradılmış elmi məqalələr) misal gətirmək olar (Fizikanın tədrisində yeni təhsil texnologiyalarından istifadə, 2025).

Növbəti prinsip motivasiya və konstruktiv öyrənmə prinsipidir ki, tələbələrin öyrənməyə davamlı marağını saxlamaq üçün motivasiyaedici yanaşmalar tətbiq olunmasını tələb edir. Veb resurslar vasitəsilə konstruktiv öyrənmə mühiti yaradılmalı və tələbələr bilikləri tədqiqat, layihə və problem həlli yolu ilə mənimsəməlidirlər. Bu zaman tətbiq olunan metodlar qamifikasiya (öyrənmə prosesinə oyun elementlərinin əlavə edilməsi), problem əsaslı öyrənmə (PBL – Problem-Based Learning) və layihə əsaslı öyrənmədir. (PjBL – Project-Based Learning). Bu yanaşma və müvafiq metodları özündə birləşdirən Duolingo (xarici dil öyrənmədə gamifikasiya metodu tətbiq etməklə), Scratch və Code.org (İnformatika və proqramlaşdırma öyrənmək üçün interaktiv platformalardır) platformalarını nümunə göstərə bilərik (Təhsildə İKT-nin pedaqoji-psixoloji imkanları, 2019).

Bu didaktik prinsiplərin nəzərə alınması veb resursların effektiv istifadəsini təmin edir və tələbələrin öyrənmə nəticələrini maksimum dərəcədə artırır (Magistrant dövri-elmi jurnal, 2024 №5(17), 2024).

Veb resursların təhsilə uğurla inteqrasiya edilməsi üçün onların kurikulumun tələblərinə və təhsil səviyyəsinə uyğunlaşdırılması əsas şərtlərdən biridir. Müəllimlər bu resursları seçərkən onların şagirdlərin idrak fəaliyyətini necə stimullaşdıra biləcəyini nəzərə almalıdırlar. Bu resursların sadəcə mövcudluğu yetərli deyil; onların effektiv tətbiqi üçün düzgün metodoloji yanaşmalar və pedaqoji strategiyalar tələb olunur. Veb resursların tədris prosesində uğurlu istifadəsi üçün vacib istiqamətlərdən biri də həmin resursların effektif inteqrasiyasıdır. Effektiv inteqrasiyanın əsas şərtləri kimi : fənnin xüsusiyyətlərinə uyğun seçim (riyaziyyat üçün GeoGebra, dil fənləri üçün Duolingo, təbiət elmləri üçün PhET simulyasiyaları kimi uyğun platformalardan istifadə), modulyar yanaşma(veb resursların dərsin müxtəlif mərhələlərində (motivasiya, izah, möhkəmləndirmə və qiymətləndirmə) tətbiqi), əyani və interaktiv materialların istifadəsi (şagirdlərin nəzəri bilikləri praktik tapşırıqlarla birləşdirə bilməsi üçün multimedia və simulyasiyalardan istifadə) qeyd oluna bilər. Məsələn, riyaziyyat dərsində GeoGebra ilə qrafiklərin vizual analizi, biologiya dərsində interaktiv simulyasiyalarla laboratoriya təcrübələrinin aparılması, dil dərslərində Google Translate və ChatGPT-dən ünsiyyət bacarıqlarının inkişafı üçün istifadə olunması effektiv inteqrasiya nümunələridir (Mishra, Koehler, 2006).

Digər diqqət yetirilməli məqamlardan biri də texnologiyaların tədris prosesinə inteqrasiyası zamanı müəllimin roludur. Mövcud vəziyyətdə müəllimin rolunun dəyişməsinə baxmayaraq, onların pedaqoji rəhbərliyi və metodiki yanaşmaları həlledici olaraq qalır. Müəllim yalnız resursları təqdim edən deyil, eyni zamanda onları düzgün idarə edən, yönləndirən və qiymətləndirən bir bələdçidir. Texnologiya əsaslı tədris prossesində müəllimin əsas vəzifələri öyrənmə prosesinin idarə edilməsi və strukturlaşdırılması, düzgün resurs seçimi və onların məqsədəuyğun istifadəsi, şagirdlərin rəqəmsal

savadlılığının inkişaf etdirilməsi, həmçinin veb resurslardan etik və təhlükəsiz istifadəyə nəzarət kimi xarakterizə oluna bilər. Qeyd olunanlara real nümunə əsasında nəzər yetirsək, məsələn, layihə əsaslı öyrənmə (PjBL) metodundan istifadə edərək şagirdlərə onlayn resurslar əsasında araşdırmalar aparmaq üçün istiqamət vermək, qamifikasiya strategiyaları ilə motivasiyaedici tapşırıqlar təqdim etmək, onlayn forumlar və müzakirə qrupları yaradaraq, şagirdlərin interaktiv iştirakını təşviq etmək müəllimin bu qəbildən olan dərs prosesində rolunu aydın görməyə imkan yaradır (Garrison, Vaughan, 2008).

Rəqəmsal alətlərin istifadəsinin səmərəliliyini artırmaq üçün onların təsirini mütəmadi olaraq qiymətləndirmək vacibdir. Bu prosesdə müxtəlif statistik metodlar və analitik platformalar müəllimlərə kömək edə bilər. Əsas qiymətləndirmə metodları olan formativ qiymətləndirmə üçün davamlı rəy və monitorinq məqsədilə Google Forms, Quizizz və Kahoot kimi alətlərdən istifadə, summativ qiymətləndirmə üçün bilik və bacarıqların yekun qiymətləndirilməsi məqsədilə onlayn imtahan sistemləri (məsələn, Socrative) və həmçinin öyrənmə analitikası üçün tədris prosesinin statistik göstəricilərini təhlil edən platformalar (məsələn, Learning Management Systems – LMS) müəllimlərə bu sahədə də geniş imkanlar yaradaraq prossesi asanlaşdırır. Məhz bu məqsədlər üçün nəzərdə tutulmuş Google Forms ilə sorğular apararaq şagirdlərin öyrənmə səviyyəsini təhlil etmək, Moodle və Blackboard vasitəsilə interaktiv tapşırıqların nəticələrini izləmək, BigBlueButton və Microsoft Teams kimi sistemlərdə tələbələrin iştirak səviyyəsini qiymətləndirmək müəllimlərin vaxt və səmərəlilik baxımından üstünlük verdikləri veb resurslar siyahısındadırlar (UNESCO, 2023).

Yuxarıda qeyd olunan məqamları ümumiləşdirsək , veb resursların təhsil prosesində effektiv istifadəsi onların məqsədəuyğun seçilməsindən, didaktik prinsiplərə uyğun tətbiqindən və sistemli qiymətləndirilməsindən asılıdır. Yəni, müəllimlər veb resursları dərs prosesinə inteqrasiya edərkən, onları şagirdlərin fərdi ehtiyaclarına uyğunlaşdırmalı, rəqəmsal alətlərin istifadəsi zamanı interaktivlik və motivasiyaedici elementlər nəzərə alınmalı,veb resursların effektivliyi davamlı olaraq qiymətləndirilməli və nəticələrə əsasən metodiki yanaşmalar təkmilləşdirilməli, şagirdlərin rəqəmsal savadlılığı artırılmalı və onlara onlayn resurslardan düzgün istifadə etməyi öyrətmək üçün təlimlər keçirilməlidir (Laurillard, 2012).

Bütün sadalanan müsbət keyfiyyət və effektivliyi ilə yanaşı veb resursların tədris prosesinə effektiv inteqrasiyası müəyyən çətinliklərlə müşayiət oluna bilər. Məsələn, bəzi regionlarda internet bağlantısının zəifliyi və kompüterlərin çatışmazlığı veb resursların istifadəsini çətinləşdirir (OECD, 2021). Bu kimi problemlərin həll yolları kimi alternativ resurslardan istifadə (məsələn, oflayn istifadə üçün yüklənən materiallar) və ya təhsil müəssisələrinin texnoloji avadanlıqlarla təmin edilməsinə yönəlmiş dövlət proqramlarının tətbiqini təklif etmək olar. Yaxud müəllimlərin rəqəmsal bacarıqlarının yetərsizliyi kimi problemi müəllimlər üçün davamlı təlim proqramlarının təşkil edilməsi və təcrübəli pedaqoqlar və metodistlərin mentorluq sisteminin yaradılması yolları ilə aradan qaldırmaq mümkündür. Digər problem kimi meydana çıxan bəzi tələbələrin veb resurslardan səmərəli istifadə edə bilməməsini və dərs prosesində diqqətlərini yayındırmasını qamifikasiya və interaktiv metodların tətbiq, həmçinin fərdiləşdirilmiş öyrənmə strategiyalarının hazırlanması ilə aradan qaldırmaq olar. Bu çətinliklərin aradan qaldırılması üçün problemin həllinə yönəlmiş müvafiq strategiyaların tətbiqi vacibdir. Çünki ,gələcəkdə veb resursların daha da inkişaf edəcəyi və süni intellektin, virtual reallığın (VR) və artırılmış reallığın (AR) təhsil prosesində daha geniş tətbiq olunacağı gözlənilir.

## Nəticə

Beləliklə, veb resursların tədris prosesinə inteqrasiyasının təhsilin keyfiyyətini artırmaqla yanaşı, fərdi öyrənməyə və interaktiv metodlara geniş imkanlar yaratdığı qənaətinə gəlirik. Bununla belə, effektiv nəticə əldə etmək üçün müəyyən çətinliklərin həlli və strateji planlama vacibdir. Belə ki, təhsil müəssisələri veb resurslardan istifadəyə dair vahid strategiya formalaşdırılmalı, müəllimlərə davamlı rəqəmsal bacarıq təlimləri keçirilməli, şagirdlərin fərdi ehtiyaclarına uyğun adaptiv və interaktiv tədris metodlarından istifadə edilməlidir. Yeni texnologiyaların təhsil sahəsinə inteqrasiyası üzrə innovativ layihələr dəstəklənməlidir.

**Ədəbiyyat**

1. Anderson, T., & Dron, J. (2019). Learning in online environments: A theoretical framework. *Educational Technology & Society, 22*(2), 38–49.
2. Əliyev, A., & Məmmədova, T. (2022). *Təhsildə rəqəmsal texnologiyalar və onların tətbiqi*. Təhsil Nəşriyyatı.
3. *Fizikanın tədrisində yeni təhsil texnologiyalarından istifadə*. (2025). *Azərbaycan müəllimi* qəzeti.
4. Garrison, D. R., & Vaughan, N. (2008). *Blended learning in higher education: Framework, principles, and guidelines*. Jossey-Bass.
5. *İnformasiya-kommunikasiya texnologiyalarından istifadə vasitəsilə təlim prosesinin idarə olunması*. (2021). *Azərbaycan məktəbi* jurnalı.
6. Laurillard, D. (2012). *Teaching as a design science: Building pedagogical patterns for learning and technology*. Routledge.
7. *Magistrant dövri-elmi jurnal*, 2024, №5(17). (2024). Azərbaycan Dövlət Pedaqoji Universiteti.
8. Məmmədov, S. (2019). *Təhsildə innovasiyalar və müasir metodologiya*. Elm və Təhsil.
9. *Metavers texnologiyalarının təhsildə rolu – Araşdırma*. (2024). *Azərbaycan müəllimi* qəzeti.
10. Mishra, P., & Koehler, M. J. (2006). Technological pedagogical content knowledge: A framework for integrating technology in teacher knowledge. *Teachers College Record, 108*(6), 1017–1054.
11. OECD. (2021). *Digital education outlook 2021: Pushing the frontiers with artificial intelligence, blockchain, and robots*. OECD Publishing.
12. Qasımova, R. (2020). *İKT-nin tədris prosesində istifadəsi və pedaqoji yanaşmalar*. ADPU Nəşriyyatı.
13. *Şagirdlərdə media savadlılığını formalaşdırmaq: Haradan başlamalı?* (2024). *Azərbaycan müəllimi* qəzeti.
14. Selwyn, N. (2016). *Education and technology: Key issues and debates*. Bloomsbury Publishing.
15. *STEAM təhsil metodu: Təhsildə innovasiyanın zərurəti və beynəlxalq təcrübələr*. (2024). *Azərbaycan müəllimi* qəzeti.
16. *Təhsildə İKT*. (2021). Bakı: Naxçıvan Müəllimlər İnstitutu.
17. *Təhsildə İKT-nin pedaqoji-psixoloji imkanları*. (2019). Azərbaycan Dövlət Pedaqoji Universiteti Quba filialı. https://adpuquba.edu.az/wp-content/uploads/2020/12/Ruhiyya_Mehdiyeva-IKT-nin-pedaqoji-psixoloji-imkanlari.pdf
18. *Təlim prosesində İKT-dən istifadə (Mühazirələr)*. (2020). Lənkəran Dövlət Humanitar Kolleci.
19. UNESCO. (2023). *Digital learning strategies for the future: Global trends and best practices*. UNESCO Publishing.

Daxil oldu: 06.01.2025
Qəbul edildi: 17.04.2025

DOI: https://doi.org/10.36719/2663-4619/115/126-131

**Orxan Əliyev**
Azərbaycan Respublikasının Prezidenti yanında
Dövlət İdarəçilik Akademiyası
magistrant
https://orcid.org/0009-0000-4352-5200
orxan.eliyev89@icloud.com

# Yetkinlik yaşına çatmayanların işləri və hüquqlarının müdafiəsi üzrə komissiyaların inzibati-hüquqi statusu

## Xülasə

Məqalənin nəzəri və metodoloji əsasını yetkinlik yaşına çatmayanların işləri və hüquqlarının müdafiəsi üzrə komissiyaların inzibati-hüquqi statusu, fəaliyyətinin təşkilati və hüquqi əsasları, yuxarı komissiyalarla yerli komissiyalar arasındakı qarşılıqlı münasibətlərin xarakteri, səlahiyyətlərin bölünmə pirinsipləri barədə praktik işlərin nəticələri, yetkinlik yaşına çatmayanların hüquq və azadlıqlarının müdafiəsinə dair elmi – nəzəri konsepsiyalar, müvafiq mövzulu tədqiqatlardan əldə olunmuş elmi ideyalar və tövsiyələr, beynəlxalq elmi-praktiki konfransların materialları və s. təşkil edir. Tədqiqat zamanı nəzəri müşahidə, kompleks və sistemli yanaşma, müqayisəli təhlil, məntiqi ümumiləşdirmə, analiz və sintez və s. metodlardan istifadə olunmuşdur. Ümumi müddəaların məcmusu komissiyanın məqsədli və sistemli fəaliyyəti, iş üsulları və formaları haqqında təsəvvür yaratmaqla qarşıda duran vəzifələri xarakterizə edir.

***Açar sözlər:*** *komissiyalar, inzibati-hüquqi status, təşkilati və hüquqi əsaslar, normativ-hüquqi aktlar, komissiyaların fəaliyyətinin təkmilləşdirilməsinə dair məsələlər*

**Orkhan Aliyev**
The Academy of Public Administration under the
President of the Republic of Azerbaijan
Master student
https://orcid.org/0009-0000-4352-5200
orxan.eliyev89@icloud.com

# Administrative-Legal Status of Commissions For the Protection of Minors' Affairs and Rights

## Abstract

Theoretical and methodological basis of the article contains the administrative-legal status of the commissions on affairs and protection of the rights of minors, organizational and legal bases of their activity, the nature of the relationship between the higher commissions and local commissions, the results of practical work on the principles of separation of powers. scientific-theoretical concepts, scientific ideas and recommendations obtained from relevant research, materials of international scientific-practical conferences, etc. Theoretical observation, complex and systematic approach, comparative analysis, logical generalization, analysis and synthesis, etc. during the research. methods were used. The set of general provisions characterizes the forthcoming tasks by creating an idea of the purposeful and systematic activity, methods and forms of work of the commission.

***Keywords:*** *Commissions, administrative-legal status, organizational and legal bases, normative-legal acts, issues on improving the activity of commissions*

 

## Giriş

İnsan hüquqları – şəxsiyyət varlığının azadlığını ifadə edən müəyyən normativ strukturlu xassə və xüsusiyyət olaraq, onun həyatının, o cümlədən cəmiyyət, dövlət və digər fərdlərlə qarşılıqlı münasibətlərinin ayrılmaz və zəruri vasitəsidir. Müasir dövrdə vətəndaşların hüquq və azadlıqlarının təmin olunmasında və onların müdafiəsində siyasi sistemin ən əhəmiyyətli institutu kimi dövlətin rolu əvəzedilməzdir. İnsan hüquqlarının müdafiəsinin dövlətdaxili mexanizmlərinin beynəlxalq mexanizmlərlə vəhdəti həmin dövlətin beynəlxalq hüquq normalarına yanaşma tərzi ilə müəyyən olunur. Sürətlə inkişaf edən dünyamızda labüd hal kimi dövlətlərin qanunvericiliyində beynəlxalq hüquq normalarının prioritetliyi əks olunmuşdur. Qanunvericiliyimizdə dövlət hakimiyyəti orqanlarının öz səlahiyyətlərini həyata keçirdiyi zaman Konstitusiyamızla və qanunvericiliyimizlə yanaşı, beynəlxalq hüquq normalarına riayət etmələri və onu əsas götürmələri ilə bağlı kifayət qədər normalar mövcuddur. Azərbaycan Respublikası insan hüquqları sahəsində bir çox Konvensiyalara, eləcə də BMT-nin Uşaq Hüquqları Konvensiyasına qoşulmuş, bu sahədə yeni qanunlar qəbul edilmiş, qanunvericilik bazamız müasir dövrün tələblərinə uyğun olaraq təkmilləşdirilmiş, o cümlədən də yetkinlik yaşına çatmayanların hüquq və azadlıqlarının müdafiəsi ilə bağlı normativ – hüquqi baza formalaşdırılmışdır (Azərbaycan Respublikasının Ailə Məcəlləsi, 1999).

Hal-hazırda Azərbaycan Respublikasında insan hüquqlarının müdafiəsinin aşağıdakı formaları mövcuddur:

- məhkəmə müdafiəsi;
- inzibati müdafiə;
- İnsan hüquqları üzrə müvəkkil (ombudsman) tərəfindən müdafiə;
- xüsusi yaradılmış orqanlar (komissiyalar) tərəfindən müdafiə.

İnsan hüquqlarının və azadlıqlarının məhkəmə müdafiəsi cinayət, mülki və inzibati işlər üzrə məhkəmələr tərəfindən işlərin baxılmasını və pozulmuş hüquqların məhkəmə qaydasında bərpasını nəzərdə tutur.

İnzibati müdafiə aşağı icra hakimiyyəti orqanları tərəfindən pozulmuş hüquqları barədə vətəndaşların şikayətlərinin yuxarı icra hakimiyyəti orqanları tərəfindən qanunvericiliklə müəyyən edilmiş qaydada baxılmasını və bu hüquqların bərpasını nəzərdə tutur.

### Tədqiqat

İnsan hüquqları üzrə müvəkkil (ombudsman) tərəfindən insan hüquqlarının müdafiəsi Azərbaycan Respublikasının Konstitusiyasında və Azərbaycan Respublikasının tərəfdar çıxdığı beynəlxalq müqavilələrdə təsbit olunmuş və Azərbaycan Respublikasının dövlət və yerli özünüidarəetmə orqanları və vəzifəli şəxsləri tərəfindən pozulmuş insan hüquqlarının və azadlıqlarının bərpasını nəzərdə tutur.

Xüsusi yaradılmış orqanlar (komissiyalar) tərəfindən insan hüquqlarının müdafiəsi dedikdə, bir qayda olaraq, yetkinlik yaşına çatmayanların işləri və hüquqlarının müdafiəsi üzrə komissiyalar tərəfindən yetkinlik yaşına çatmayanların hüquqlarının müdafiəsinə dair səlahiyyətlərin həyata keçirilməsi başa düşülür (Uşaq hüquqları haqqında Azərbaycan Respublikasının Qanunu, 1998).

Yetkinlik yaşına çatmayanların tərbiyə olunmasının və onların hüquqlarının müdafiəsinin əsas formalarından biri də yerli icra hakimiyyəti orqanları yanında yaradılan və fəaliyyət göstərən komissiyalardır. Bu komissiyalar hələ Azərbaycanda sovet hakimiyyəti dövründə inzibati-hüquq islahatlarının məntiqi nəticəsi olaraq RSFSR XKS-nin 1918-ci il 14 yanvar tarixli dekreti ilə formalaşdırılmışdır. Xalq Komissarları Sovetinin növbəti 1925-ci il 22 may tarixli dekreti ilə yaradılmış RSFSR Xalq Maarifi komissarlığının nəzdində yetkinlik yaşına çatmayanların işləri üzrə Mərkəzi komissiyanın əsas təyinatı yetkinlik yaşına çatmayanlar tərəfindən törədilən hüquq pozuntularına qarşı planlı şəkildə mübarizəni təşkil etmək və bu sahədə maraqlı olan təşkilatların fəaliyyətini əlaqələndirmək olmuşdur. Məhz həmin vaxtdan komissiyaların əlaqələndirici və profilaktik işlərlə bağlı təşkilati rolu müəyyən edilmişdir (Uşaqların ədliyyə sisteminə çıxışı baxımından Azərbaycan qanunvericiliyinin təhlili, 2014).

Azərbaycan SSR-də isə "Həddi-buluğa çatmamışların işinə baxan komissiyalar haqqında" Əsasnamə Azərbaycan SSR Ali Soveti Rəyasət Heyətinin 1962-ci il 27 yanvar tarixli fərmanı ilə

təsdiq edilmişdir. "Həddi-buluğa çatmamışların işləri üzrə komissiyalar haqqında" daha bir Əsasnamə Azərbaycan SSR Ali Soveti Rəyasət Heyətinin 1967-ci il 10 oktyabr tarixli fərmanı ilə təsdiq edilmişdir. Belə bir Əsasnamənin qəbul edilməsi, hər şeydən əvvəl, tərbiyə və profilaktika işlərin səmərəliliyinin yüksəldilməsi, habelə yetkinlik yaşına çatmayanların yenidən tərbiyə olunması üsullarının təkmilləşdirilməsi zərurətindən irəli gəlirdi (Lundy, 1997).

Dövlət müstəqilliyini bərpa etdikdən sonra ölkədə həyata keçirilən hüquqi islahatlar və dövlət aparatının yeni iqtisadi-siyasi şəraitə uyğun qurulması yetkinlik yaşına çatmayanların işləri və hüquqlarının müdafiəsi üzrə komissiyalarının əhəmiyyətini artırmışdır. Azərbaycan Respublikası Konstitusiyasının 17-ci maddəsinə əsasən, uşaq hüquqlarının həyata keçirilməsinə dövlət nəzarət edir. 1997-ci il 17 yanvar tarixində Azərbaycan Respublikası Prezidentinin 537 saylı fərmanı ilə "Yetkinlik yaşına çatmamışların işləri üzrə Komissiyalar haqqında" Əsasnamə təsdiq edilmişdir. Həmin Əsasnamənin 1-ci bəndində deyilir: "Yetkinlik yaşına çatmamışların işləri üzrə komissiyaların başlıca vəzifələri yetkinlik yaşına çatmamışların hüquqlarını qorumaqdan və təmin etməkdən, onların baxımsızlığının və qayda-qanunu pozma hallarının qarşısını almaq işini təşkil etməkdən, göstərilən məsələlərdə dövlət orqanlarının və ictimai təşkilatların səylərini əlaqələndirməkdən, yetkinlik yaşına çatmamışlarla əlaqədar işlərə baxmaqdan və Ədliyyə Nazirliyi müəssisələrində yetkinlik yaşına çatmamışların saxlanması şəraitinə və tərbiyə işinə nəzarət etməkdən ibarətdir" (Dəmirçiyeva, 2020). Oxşar müddəalara Azərbaycan Respublikasının 2002-ci il 31 may tarixli qanunu ilə təsdiq edilmiş "Yetkinlik yaşına çatmayanların işləri və hüquqlarının müdafiəsi üzrə komissiyalar haqqında" Əsasnamədə də rast gəlmək olar. Dörd fəsil və 18 maddədən ibarət olan bu Əsasnamə əvvəlki əsasnamələrdən fərqli olaraq yetkinlik yaşına çatmayanların hüquqlarının müdafiəsi ilə əlaqədar komissiyalara geniş səlahiyyətlər verir (Azərbaycan Respublikasının Konstitusiyası, 1995).

Komissiyalar haqqında mövcud Əsasnamənin müddəalarının məntiqi ümumiləşdirmə və müqayisəli təhlili əsasında aşağıdakı nəticələrə gəlmək olar:

- əvvəlki əsasnamələrdən fərqli olaraq yeni Əsasnamədə yetkinlik yaşına çatmayanların işlərinə baxmaqla yanaşı, komissiyaların fəaliyyətinin daha bir istiqaməti - yetkinlik yaşına çatmayanların hüquqlarının müdafiə edilməsi təsbit edilmişdir.
- insan və vətəndaş hüquqları ilə əlaqədar Azərbaycan Respublikasının Konstitusiyası və Azərbaycan Respublikasının tərəfdar çıxdığı beynəlxalq aktların müddəalarından irəli gələn öhdəliklərin yerinə yetirilməsi qeyd edilən Əsasnamənin prioritet vəzifələrindəndir.
- Əsasnamənin prezident fərmanı ilə təsdiq edilməsi normativ-hüquqi aktların iyerarxiyasında onun hüquqi qüvvəsinin daha da təsirli olmasına və idarəçilik sistemində komissiyaların bir orqan kimi hüquqi əhəmiyyətinin artmasına dəlalət edir ("Yetkinlik yaşına çatmayanların işləri və hüquqlarının müdafiəsi üzrə komissiyalar haqqında" Əsasnamə (Azərbaycan Respublikasının 31 may 2002-ci il tarixli qanunu).

Dövlət vəzifələrinin icrası ilə əlaqədar ortaya çıxan müəyyən məsələlərin daha səmərəli və operativ həlli çox vaxt dövlət orqanları sistemində yeni bir orqanın formalaşdırılması zərurətini doğurur. Bu baxımdan komissiyanın yaradılması və onun fəaliyyət istiqamətlərinin müəyyən edilməsi dövlətin yetkinlik yaşına çatmayanların hüquqlarının müdafiə olunması vəzifəsindən irəli gəlir. Komissiyanın fəaliyyət istiqamətinin məzmununu təşkil edən əsas məqsədi dövlətin ali məqsədindən doğmaqla aşağıdakılardan ibarətdir (Azərbaycan Respublikası Ailə Məcəlləsinin yozumu / Əsədov, B. H. və b., 2012):

- yetkinlik yaşına çatmayanlara tərbiyəvi təsir göstərmək;
- yetkinlik yaşına çatmayanların hüquqlarını və qanuni mənafelərini qorumaq;
- yetkinlik yaşına çatmayanların davranışına nəzarət etmək;
- yetkinlik yaşına çatmayanların qanunazidd əməllərinin qarşısını almaq;
- qeyd edilən məsələlərlə bağlı dövlət və yerli özünüidarəetmə orqanlarının, mülkiyyət formasından asılı olmayaraq müəssisələrin, idarələrin və təşkilatların fəaliyyətini əlaqələndirmək ("Yetkinlik yaşına çatmamışların işləri üzrə komissiyalar haqqında" Əsasnamə (Azərbaycan Respublikası Prezidentinin 17 yanvar 1997-ci il tarixli fərmanı).

Komissiyaların təşkilinin və tərkibinin xüsusiyyətləri, o cümlədən geniş səlahiyyətləri onun bir neçə istiqamətdə fəaliyyət göstərməsinə imkan yaradır. Tərkibində müxtəlif dövlət orqanlarını təmsil edən müəssisələrin rəhbərlərinin olması yetkinlik yaşına çatmayanların pozulmuş hüquqlarının qısa bir müddətdə bərpasına imkan yaratmaqla bərabər, həmin hüquqları pozmuş şəxslərin məsuliyyətə cəlb olunması işini asanlaşdırır. Pozulmuş hüquqların bərpası məhkəmənin səlahiyyətinə aid olduğu təqdirdə isə komissiyalar bununla bağlı öz təşəbbüsü ilə məhkəməyə müraciət edə və həmin müraciətə məhkəmədə baxılması zamanı iştirak edə bilər. Göründüyü kimi, komissiyalar yetkinlik yaşına çatmayanların hüquqlarının və qanuni mənafelərinin qorunması sahəsində həm müstəqil, həm də vasitəçi orqan qismində iştirak edirlər (Uşaqların hüquqlarının cinayət, inzibati və mülki instansiyalarda müdafiəsində vəkilin fəaliyyətinə dair Təlimat / Alışov, R. və UNICEF-in ekspertləri, 2020).

Dövlət orqanlarının təşkilati quruluşu müəyyən olunmadan onların səmərəli fəaliyyətinin təmin edilməsindən söhbət gedə bilməz. Komissiyaların sistem kimi mövcudluğu eyni funksiyanı və vəzifələri həyata keçirən həmin orqanların təşkilati vahidləri arasında səlahiyyətlərin düzgün bölüşdürülməsinə imkan yaradır, onların fəaliyyətinin əlaqələndirilməsi və istiqamətləndirilməsi işini asanlaşdırır. Komissiyanın Əsasnaməsinin 2-ci maddəsinə əsasən, Azərbaycan Respublikasının dövlət quruluşunun xüsusiyyətlərindən, inzibati ərazi bölgüsündən, habelə tabelilik qaydasından asılı olaraq yetkinlik yaşına çatmayanların işləri və hüquqlarının müdafiəsi üzrə komissiyalar sistemi yerli və yuxarı komissiyalara bölünməklə aşağıdakılardan ibarətdir (Azərbaycan Respublikasının Cinayət Məcəlləsi, 1999):

- rayon (şəhər) komissiyaları – yerli komissiyalar;
- müvafiq icra hakimiyyəti orqanı yanındakı komissiya (Bakı şəhərinin icra hakimiyyəti yanındakı komissiya);
- Naxçıvan Muxtar Respublikasının müvafiq icra hakimiyyəti orqanı yanındakı komissiya;
- Azərbaycan Respublikasının müvafiq icra hakimiyyəti orqanı yanındakı komissiya (Azərbaycan Respublikasının Nazirlər Kabineti yanındakı komissiya) (Uşaqların ədliyyə sisteminə çıxışı baxımından Azərbaycan qanunvericiliyinin təhlili, 2014).

Komissiyalar sisteminin nəzəri və praktiki əhəmiyyəti ondan ibarətdir ki, *birincisi*, bu, dövlət orqanları sistemində komissiyaların yerini müəyyənləşdirir; *ikincisi*, bu, komissiyalar arasında işgüzar əlaqələrin qurulmasına, qarşılıqlı əlaqələrin inkişafına kömək edir; *üçüncüsü*, bu, komissiyaların fəaliyyətinin sistem halında öyrənilməsinə kömək edir, iş prosesində üzə çıxan məsələlərin təhlil edilməsi və mövcud problemlərin aradan qaldırılması işini asanlaşdırır (“Uşaq hüquqlarının həyata keçirilməsinə dövlət nəzarəti Qaydası” (Azərbaycan Respublikası Prezidentinin 8 may 2012-ci il tarixli fərmanı).

Komissiyalar müvafiq icra hakimiyyəti orqanları yanında həmin orqanlar tərəfindən sədr, məsul katib (katib) və uşaqlarla iş üzrə məsləhətçi-psixoloq da daxil olmaqla 9-11 üzvdən ibarət tərkibdə yaradılır. Komissiyanın tərkibinə daxil edilən digər orqanların: təhsil, daxili işlər orqanlarının, tibb müəssisələrinin, mədəniyyət təsisatlarının rəhbərləri, habelə komissiyanın öz mülahizəsinə görə müəyyən edilən müəssisələrin rəhbərlərinin üzv kimi təmsil olunması uşaqlara münasibətdə dövlətin qarşısında duran vəzifələrin komissiyalar vasitəsilə həyata keçirilməsinə, düzgün qərarların qəbul edilməsinə, yetkinlik yaşına çatmayanlarla bağlı müxtəlif dövlət proqramlarının icra edilməsinə, aidiyyəti orqanların fəaliyyətinin əlaqələndirilməsinə və səylərin müəyyən istiqamətə yönəldilməsinə imkan yaradır (Azərbaycan Respublikasının Cinayət Prosessual Məcəlləsi, 2000).

Komissiyalar Azərbaycan Respublikasının İnzibati Xətalar Məcəlləsinin normalarında nəzərdə tutulmuş uşaqların təlim-tərbiyəsi vəzifələrinin valideynlər və ya onları əvəz edən şəxslər tərəfindən yerinə yetirilməməsi (m.189), yetkinlik yaşına çatmayanların xırda xuliqanlığına görə valideynlərinin və ya onları əvəz edən şəxslərin məsuliyyəti (m.512) və yetkinlik yaşına çatmayanın sərxoşluq vəziyyətinə gətirilməsi (m.522) ilə bağlı inzibati xətalar haqqında işlərə baxır və inzibati xəta törətmiş şəxslər barəsində inzibati tənbeh tətbiq edirlər. İnzibati xətalar haqqında işlərə baxarkən komissiyalar inzibati münasibətlərin subyekti kimi Azərbaycan Respublikasının İnzibati Xətalar Məcəlləsində müəyyən edilmiş hüquqlara malikdirlər və vəzifələr daşıyırlar (Lundy, 1997).

Komissiyaların səmərəli fəaliyyəti onların statusunu ilə birbaşa bağlıdır. "Yetkinlik yaşına çatmayanların işləri və hüquqlarının müdafiəsi üzrə komissiyalar haqqında" Əsasnamənin 5-ci, 6-cı və 7-ci maddələrində sözügedən komissiyaların xüsusi səlahiyyətləri təsbit edilmiş, habelə onların fəaliyyət istiqamətlərini müəyyən olunmuşdur. Yuxarı icra orqanı kimi Azərbaycan Respublikasının Nazirlər Kabineti yanındakı yetkinlik yaşına çatmayanların işləri və hüquqlarının müdafiəsi üzrə komissiyanın səlahiyyətlərinin bilavasitə Azərbaycan Respublikasının Nazirlər Kabinetinin statusu ilə müəyyən edilməsi, müəyyən məsələlərlə bağlı konkret hökumət qərarlarının işlənib hazırlanmasında komissiyanın iştirakına təminat verir və onların birgə fəaliyyətinə müsbət zəmin yaradır (Azərbaycan Respublikası Prezidentinin "Azərbaycan Respublikasının Ailə Məcəlləsinin təsdiq edilməsi, qüvvəyə minməsi və bununla bağlı hüquqi tənzimləmə məsələləri haqqında" Azərbaycan Respublikası Qanununun tətbiq edilməsi barədə Fərmanı, 2000).

Komissiyalar səlahiyyətlərinə uyğun olaraq qanunazidd əməllərin xarakterini və səbəblərini, yaşını, həyat şəraitini, qanunazidd əməlin törədilməsində iştirak dərəcəsini, habelə məişətdə, məktəbdə və ya işdə davranışını nəzərə almaqla yetkinlik yaşına çatmayanlar barəsində intizam təsir tədbirləri tətbiq edirlər. Yetkinlik yaşına çatmayanların işləri üzrə icraat inzibati prosesin ayrılmaz tərkib hissəsidir. Komissiyalar tərəfindən işlərin və ya materialların baxılması halları üzrə icraat müvafiq əsaslar olduqda başlanılır və komissiyanın iclaslarında baxılan hər bir məsələ barəsində qərar qəbul edilir (Vəliyev, 2022).

Bununla yanaşı, "Uşaq hüquqları haqqında" Azərbaycan Respublikasının 19 may 1998-ci il tarixli 499-İQ nömrəli Qanununda, Azərbaycan Respublikası Prezidentinin 8 may 2012-ci il tarixli 626 nömrəli fərmanı ilə təsdiq edilmiş "Uşaq hüquqlarının həyata keçirilməsinə dövlət nəzarəti Qaydası"nda, "Valideynlərini itirmiş və valideyn himayəsindən məhrum olmuş uşaqların sosial müdafiəsi haqqında" Azərbaycan Respublikasının 22 iyun 1999-cu il tarixli 693-İQ nömrəli Qanununda, Azərbaycan Respublikası Prezidentinin 2020-ci il 27 noyabr tarixli Sərəncamı ilə təsdiq edilmiş "Uşaqlara dair Strategiyanın həyata keçirilməsi üzrə 2020-2025-ci illər üçün Fəaliyyət Planı"nda və digər normativ-hüquqi aktlarda komissiyasının fəaliyyətini əhatə edən bəndlər üzrə uşaq hüquqlarının pozulmasının qarşısının alınması, baxımsızlığının profilaktikası və hüquqi dünyagörüşünün formalaşdırılması, uşaq hüquqlarının təmin edilməsi üçün əlverişli mühitin yaradılması, bu vəzifələri həyata keçirən orqan və müəssisələrin fəaliyyətinin əlaqələndirilməsi, uşaqların təhsili, tərbiyəsi və məşğulluğu üçün sistemli və səmərəli fəaliyyətin təşkil olunması, onların iqtisadi, sosial, mədəni hüquqlarının təmin olunması ilə bağlı işlər, uşaq əməyinin istismarına qarşı ciddi mübarizə aparılması, sosial müdafiəyə ehtiyacı olan, risk qrupundan olan ailələrlə bağlı işlərin aparılması məqsədilə komissiya tərəfindən müvafiq tədbirlər görülür (İnsan hüquqları / Lukaşe-va, E. A. (Red.), 2005).

## Nəticə

Uşaq hüquqlarını həyata keçirən bir sıra dövlət qurumları və QHT-lərin yetkinlik yaşına çatmayanların işləri və hüquqlarının müdafiəsi üzrə komissiyaların fəaliyyəti ilə bağlı irəli sürdüyü təkliflərdən məlum olur ki, "Hazırda komissiya tərəfindən göstərilən xidmətlərin çoxu sovet dövründə mövcud olan qayda ilə həyata keçirilir. Yerli ehtiyaclar nəzərə alınmaqla xidmətlərin beynəlxalq standartlara uyğunlaşdırılması, təkmilləşdirilməsi istiqamətində işlər aparılmalıdır, komissiyaların fəaliyyəti üçün mövcud qanunvericilik bazası olsa da, müvafiq tədbirlərin həyata keçirilməsi üçün icra mexanizmləri mövcud deyildir. İlk növbədə, yetkinlik yaşına çatmayanların işləri və hüquqlarının müdafiəsi üzrə komissiya ilə qəyyumluq və himayəçilik komissiyası birləşdirilməli, işçilərin sayı artırılmalı və qurumun maddi-texniki bazası möhkəmləndirilməlidir. Digər tərəfdən, bu komissiyaların uşaqlar üçün əlçatanlığı təmin olunmalı və onların tabeçiliyində xüsusi qayğı mərkəzləri yaradılmalıdır".

## Ədəbiyyat

1. Azərbaycan Respublikasının Ailə Məcəlləsi. (1999, 28 dekabr; 2021, 27 dekabr tarixli əlavə və dəyişikliklərlə). Hüquq yayın evi.

2. Əsədov, B. H., və b. (2012). *Azərbaycan Respublikası Ailə Məcəlləsinin yozumu*. Digesta.
3. Azərbaycan Respublikasının Cinayət Məcəlləsi. (1999, 30 dekabr). Azərbaycan Respublikasının Qanunvericilik Toplusu.
4. Azərbaycan Respublikasının Cinayət Prosessual Məcəlləsi. (2000, 14 iyul). Azərbaycan Respublikasının Qanunvericilik Toplusu.
5. Azərbaycan Respublikasının Konstitusiyası. (1995).
6. Azərbaycan Respublikası Prezidentinin Fərmanı. (2000, 6 mart). *Azərbaycan Respublikasının Ailə Məcəlləsinin təsdiq edilməsi, qüvvəyə minməsi və bununla bağlı hüquqi tənzimləmə məsələləri haqqında*. Bakı: Azərbaycan Respublikasının Qanunvericilik Toplusu.
7. Dəmirçiyeva, M. D. (2020). *Ailə hüququ* (Dərslik). Zərdabi.
8. Lukaşeva, E. A. (Red.). (2005). *İnsan hüquqları* (Rus dilindən tərcümə).
9. Lundy, C. (1997). *An introduction to the Convention on the Rights of the Child*. Canada: Full Circle Press.
10. Uşaq hüquqları haqqında Azərbaycan Respublikasının Qanunu. (1998, 19 may).
11. Azərbaycan Respublikası Prezidentinin Fərmanı. (2012, 8 may). *Uşaq hüquqlarının həyata keçirilməsinə dövlət nəzarəti Qaydası*.
12. Uşaqların ədliyyə sisteminə çıxışı baxımından Azərbaycan qanunvericiliyinin təhlili. (2014). Bakı.
13. Alışov, R., və UNICEF-in ekspertləri. (2020). *Uşaqların hüquqlarının cinayət, inzibati və mülki instansiyalarda müdafiəsində vəkilin fəaliyyətinə dair Təlimat*. Azərbaycan Respublikasının Vəkillər Kollegiyası.
14. Vəliyev, İ. V. (2022). *Azərbaycan Respublikasının ailə hüququ: Mühazirə mətnləri*. Bakı.
15. Azərbaycan Respublikası Prezidentinin Fərmanı. (1997, 17 yanvar). *"Yetkinlik yaşına çatmamışların işləri üzrə komissiyalar haqqında" Əsasnamə*.
16. Azərbaycan Respublikasının Qanunu. (2002, 31 may). *"Yetkinlik yaşına çatmayanların işləri və hüquqlarının müdafiəsi üzrə komissiyalar haqqında" Əsasnamə*.

Daxil oldu: 04.02.2025
Qəbul edildi: 28.04.2025

DOI: https://doi.org/10.36719/2663-4619/115/132-135

**Xalid Həşimov**
Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universiteti
magistrant
UOT: 791.43
https://orcid.org/0009-0002-8475-5357
khaleedhashimov@gmail.com

# Əqrəb mövsümü: janr, mövzu və populyarlıq kontekstində analiz

**Xülasə**

Bu məqalə müstəqil Azərbaycanın kino sənayesinin inkişafını və "Əqrəb mövsümü" mini serialının bu kontekstdəki rolunu araşdırır. Müstəqillik dövründə kino sənayesi yeni nəsil rejissorların və ssenaristlərin yaratdığı fərqli yanaşmalarla inkişaf edib. Bu inkişafda xüsusilə "Əqrəb mövsümü" serialının uğuru önə çıxır. Məqalədə serialın cəmiyyətin ailə və sosial məsələlərinə dair təqdim etdiyi dərin təhlillər və insan münasibətlərinə fərqli baxış bucağının əhəmiyyəti vurğulanır. Rejissor Emil Quliyev kriminal hadisələri sadəcə cinayət kimi yox, sosial problemlərlə bağlı olaraq izah edir. Serial həm də hüquqi maarifləndirmə funksiyasını yerinə yetirərək gəncləri cinayətkarlıqdan çəkindirməkdə mühüm rol oynayır. Serialın sosial şəbəkələrdə geniş müzakirəyə səbəb olması onun cəmiyyətə olan güclü təsirini göstərir.

***Açar sözlər:*** *"Əqrəb mövsümü", Emil Quliyev, televiziya serialı, semiotik analiz*

**Khalid Hashimov**
Azerbaijan State University of Culture and Arts
Master student
UOT: 791.43
https://orcid.org/0009-0002-8475-5357
khaleedhashimov@gmail.com

# Scorpio Season: Analysis in the Context of Genre, Theme, and Popularity

**Abstract**

This article explores the development of the cinema industry in independent Azerbaijan and the role of the mini-series "*Agrab movsumu"* ("Scorpion Season") within this context. During the period of independence, the film industry has evolved through new generations of directors and screenwriters offering different approaches. A key example of this development is the success of "*Agrab movsumu"* ("Scorpion Season"). The article highlights the importance of the deep analysis presented by the series on societal, familial, and social issues, as well as the unique perspective on human relationships. Director Emil Guliyev explains criminal events not merely as crimes, but in relation to social problems. The series also serves an educational function, helping to deter young people from criminal behavior. The widespread discussion of the series on social networks further underscores its strong impact on society.

***Keywords:*** *"Scorpio Season", Emil Guliyev, television series, semiotic analysis*

## Giriş

Azərbaycan siyasi müstəqilliyini qazanandan bəri Azərbaycan kinosu əhəmiyyətli inkişaf yoluna qədəm qoymuşdur. Bu inkişaf prosesi son zamanlar daha çox nəzərə çarpır. Ölkənin kino sənayesi həm sənətkarların yaradıcı fəaliyyətinin genişlənməsi, həm də texnoloji tərəqqinin gətirdiyi imkanlardan istifadə etməklə öz inkişafını sürətləndirir. Müxtəlif mövzulara toxunan filmlər həm

 

yerli, həm də beynəlxalq festivallarda diqqət çəkir və Azərbaycan kinosunun inkişafına töhfə verir. Kino sənayesinin inkişafında yeni nəsil rejissorlar və ssenaristlərin rolu böyükdür (Mulvey, 1975). Rejissor və ssenarist işinə görə fərqlənən, cəmiyyətin bir çox seqmentinə xitab edərək populyarlıq qazanan ekran işləri içərisində "Əqrəb mövsümü" mini serialı fərqlənir. İlk bölümündən serial böyük marağa səbəb olaraq sosial mediada olduqca çox müzakirə olundu. Bununla yanaşı, "Əqrəb mövsümü" YouTube platformasında baxış sayına görə digər müasir Azərbaycan filmlərindən fərqlənir. "Əqrəb mövsümü" sübut edir ki, Azərbaycanda yeni və keyfiyyətli filmlərin sayını artımaq üçün özəl sektorunun inkişafına qayğı göstərmək, milli kinematoqrafiyanın təcrübə qazanmasına şərait yaratmaq lazımdır (Alexander, Camarero, Levitskaya, 2023).

**Tədqiqat**

"Əqrəb mövsümü"nü analiz etməzdən əvvəl tənqid üsulunu seçmək lazımdır. Çünki tənqid üsulunun seçilməsi filmin müxtəlif aspektlərini qiymətləndirmək üçün əsas yanaşmanı müəyyən edir və filmin strukturunu, mövzusunun və vizual elementlərinin necə təhlil ediləcəyinə istiqamət verir. Hər bir üsul özünəməxsus metodlarla filmin müəyyən tərəflərini önə çıxarır, bu da daha dərindən və məqsədyönlü analiz aparmağa şərait yaradır. Beləliklə, doğru tənqid üsulunun seçilməsi analiz prosesinin strukturunu və dərinliyini müəyyən edir (Aslanlı, 2020).

Kino tənqidi bir çox nəzəri yanaşmalara əsaslanır və bu yanaşmaların hər biri filmin məzmununu, formasını və sosial kontekstini müxtəlif aspektlərdən qiymətləndirir. İlk növbədə filmlər tarixi və mədəni kontekstdə təhlil edilə bilər. Bu metod filmin yaradıldığı dövrün sosial və siyasi şəraitini nəzərə alaraq, onun cəmiyyətə təsirini və mesajlarını araşdırır. Digər mühüm yanaşmalardan biri semiotik analizdir. Bu metod filmdəki vizual və səs elementlərinin mənalarını açmaq üçün istifadə olunur (Bordwell, Thompson, 2016). Montaj texnikası, rənglərin istifadəsi, kamera bucaqları və səsləndirmə kimi elementlər filmin daxili məna qatlarını ortaya çıxarmaq üçün əsas götürülür. Bununla yanaşı, psixoanalitik kino tənqidi filmin süjeti və personajlarının davranışlarını şüuraltı dəyərlər və insan psixologiyası çərçivəsində araşdırır. Qeyd etmək lazımdır ki, XX əsrin əvvəllərində psixoanalizin inkişafı və detektiv bədii əsərlərin yaradılmasında sürətlənmə baş verdi və bir-birindən müstəqil formada inkişaf edən bu iki proses insan hərkətlərinin məntiqi səbəb və formalarını öyrənməyə çalışır (Abbasov, 2009, s. 596). Bundan əlavə, filmlərin populyar mədəniyyətdə rolu və tamaşaçı reaksiyası da tənqidi təhlildə mühüm yer tutur (Abbasov, 2020). Filmin tamaşaçı tərəfindən necə qəbul edildiyi, onun ictimai diskursda yaratdığı müzakirələr və sosial mediada təsiri nəzərdən keçirilir. Beləliklə, kino tənqidi çoxsəviyyəli və geniş yanaşmaları əhatə edən bir sahədir və filmlərin müxtəlif kontekstlərdə qiymətləndirilməsinə imkan yaradır.

"Əqrəb mövsümü" Ceyhun Hidayətlinin "Əqrəb" romanının motivləri əsasında Emil Quliyevin rejissorluğunda və Azər Aydəmirin ssenarisi əsasında 2023-cü ildə çəkilmiş 12 seriyadan ibarət Azərbaycan serialıdır. Baş rollarda Azər Aydəmir (Rauf Eyvazov), Hikmət Rəhimov (Kənan Orucov), Güşvər Şərif (Səkinə Amanova), Abbas Qəhrəmanov (Qurban Amanov), Əli Əlizadə (Elnur) və başqaları çıxış edir (Hüseynli, 2021).

Dünya praktikası əsasında ən çox rast gəlinən hal budur ki, kitab uğur qazandıqdan sonra onun əsasında film çəkilməsinə qərar verilir. Bununla belə, "Əqrəb" kitabı ilk dəfə 2015-ci ildə işıq üzü görmüş və hədəflənən uğuru əldə edə bilməmişdir. Amma "Əqrəb mövsümü" mini serialının populyarlıq qazanmasından sonra roman diqqət cəlb edərək ikinci dəfə nəşr olunub. Bu hal kino sənayesinin təsir və əhəmiyyətini göstərir (Quliyev, 2023).

İctimai TV-də göstərilmiş "Sabaha saxlamayaq" verilişində "niyə bu kitabın ekranlaşdırılması qərarına gəldiniz" sualına rejissor Emil Quliyev "Çünki bu əsərdə dünya detektiv klassiklərinin klişelərindən istifadə olunmayıb, sırf azərbaycanlı birinin faciəsi ilə bağlıdır," deyə açıqlayıb. Film qaçınılmaz olaraq dünya detektiv əsərlərindən izlər daşısa da, ümumi olaraq özünəməxsusdur və sırf Azərbaycan reallığını əks etdirir. Roman ekranlaşdırılarkən əsas məqamlar saxlanılmış, bir neçə məsələ isə dəyişdirilmişdir. Məsələn, kitabdakı baş qəhrəman Kənan Orucov detektiv kimi təsvir olunsa da, serialda müstəntiq kimi təqdim edilib. Bu dəyişikliklərin ekranlaşdırma prosesinin reallıqla uyğunlaşdırılması məqsədilə edildiyi bildirib (Stam, 2000).

"Əqrəb mövsümü" bütün şəhəri qorxu və təşvişdə saxlayan naməlum qatilin törətdiyi amansız qətllər və qatilin axtarış prosesi üzərində qurulmaqla özündə dram, triller və detektiv janrlarının

xüsusiyyətlərini birləşdirir. Rejissor Emil Quliyev kriminal hadisələri adi cinayət faktı kimi deyil, ailə və cəmiyyət problemləri ilə əlaqəli təqdim edir. Heç bir cinayət səbəbsiz işlənməyib və hər biri özünəməxsus mesaj gizlədir. Bu yanaşma tamaşaçının hadisələrə yalnız detektiv süjet kimi baxmamasına, eyni zamanda ailə münasibətləri və sosial problemlər üzərində düşünməsinə səbəb olur. Digər tərəfdən operator Məhəmməd Osmanın kamerası hadisələri sadəcə izləyici mövqeyindən yox, atmosferi və gərginliyi ötürən rakurslardan çəkərək tamaşaçını hadisələrin içində hiss etdirir. Süjet xətti möhkəm qurulub və hadisələr arasındakı keçidlər tamaşaçını yorğun salmadan marağı diri saxlayır (Əliyeva, 2021).

Film irəlilədikcə qətllərin yönləndiyi Amanovlar ailəsinin mürəkkəb vəziyyəti izləyicini maraqda və gərginlikdə saxlayır. Diqqətçəkən personajlardan biri ana - Səkinə Amanovadır. Səkinə övladlarını itirən və onların qatilini axtaran bir anadır. O, nə baş verdiyini, cinayətin səbəbini anlamalı, daha pis hadisələri qabaqlamalıdır. Rolun çətinliyinə baxmayaraq, aktrisa Güşvər Şərif bu hissləri tamaşaçıya ötürə bilib. Səkinənin səssizliyi, ağrısını içərisində yaşaması, fəryad qoparmasından daha çox təsiredici alınıb. Ananın səssizliyi biganəliyindən deyil, sakit və ayıq qalmaq məcburiyyətindən doğur. 12 bölümdən ibarət olan mini serialda yaddaqalan səhnələr çoxdur. Məsələn, Səkinənin oğlunu gözləməsi, Kərimin qardaşının ayaqqabılarını bağlaması, Vaqifin ad günü səhnəsi, Vaqifin arvadı ilə birlikdə pəncərədən atılması olduqca təsirlidir (Kazımov, 2022).

Serialda tamaşaçılar arasında maraq doğuran səhnələr ilə yanaşı, kəskin mübahisələrə səbəb olan məqamlar çoxdur. Məsələn, Elnurun həbsxanada dəfələrlə təcavüzə məruz qalması (qisasın əsas motivlərindən biridir), onun ögey bacısı ilə cinsi əlaqədə olması, söyüşlərin və rus sözlərinin çox işlənməsi, açıq-aşkar öpüş səhnəsi və s (Məmmədova, 2019).

Serialın geniş tamaşaçı kütləsinin marağına səbəb olduğu, sosial şəbəkələrdə aktiv müzakirə edildiyi və televiziya məkanında ən çox izlənən layihələrdən birinə çevrildiyini vurğulamaq lazımdır. Bununla yanaşı, serialın nümayişi hüquqi maarifləndirmə baxımından mühüm rol oynayır və gəncləri hüquqazidd əməllərdən çəkindirmək üçün təsirli vasitələrdən biri kimi qiymətləndirilə bilər (Mehdi, 2024).

Baş Prokurorluq tərəfindən “Heydər Əliyev ili” çərçivəsində Azərbaycan Prokurorluğu üzrə təsdiq edilmiş Tədbirlər Planına uyğun olaraq təşkil edilən hüquq-mühafizə orqanlarının fəaliyyətində fərqlənən şəxslərlə yanaşı, “Əqrəb mövsümü” serialının yaradıcı heyəti və aktyorları da təltif edilib. Bu qərar serialın cəmiyyətə hüquqi biliklərin çatdırılması, prokurorluq peşəsinin mürəkkəb və məsuliyyətli məqamlarını realist şəkildə əks etdirməsi ilə əlaqələndirilib (Sultanova, 2023).

## Nəticə

Azərbaycan kinosu müstəqillik dövründə həm yaradıcı baxımdan, həm də texnoloji imkanlar baxımından əhəmiyyətli inkişaf yolu keçmişdir. “Əqrəb mövsümü” kimi müasir seriallar bu inkişafın konkret nümunəsi kimi çıxış edir. Serialın uğuru kino sənayesində yeni nəsil rejissor və ssenaristlərin rolunu bir daha ön plana çıxarır. Kino tənqidi yanaşmalar vasitəsilə belə ekran işlərinin daha dərindən və çoxşaxəli təhlili mümkündür. Bu təhlil yalnız bədii keyfiyyəti deyil, həm də sosial və mədəni təsiri ortaya çıxarmağa imkan yaradır. Beləliklə, “Əqrəb mövsümü” nümunəsində göründüyü kimi, Azərbaycan kinosu həm məzmun, həm də forma baxımından yeni mərhələyə qədəm qoyur.

## Ədəbiyyat

1. Abbasov, Ə. (2020). *Azərbaycan kinosunun müasir mərhələsi: İnkişaf tendensiyaları və problemlər*. Elm və Təhsil Nəşriyyatı.
2. Abbasov, N. (2009). *Mədəniyyət siyasəti və mənəvi dəyərlər*. Bakı.
3. Alexander, F., Camarero, E., & Levitskaya, A. (2023). Theoretical concepts of film studies in cinema art. *Media Education (Mediaobrazovanie), 19*(3), 353–403. Cherkas Global University.
4. Aslanlı, A. (2020). Kino tənqidində yanaşmalar: Tarixi və nəzəri baxış. *Mədəni İrs və Estetika, 6*(2), 71–78.

5. Bordwell, D., & Thompson, K. (2016). *Film art: An introduction* (11th ed.). McGraw-Hill Education.
6. Əliyeva, S. (2021). Azərbaycan kino sənətində gənc rejissorların rolu. *Mədəniyyət və İncəsənət Jurnalı*, (2), 55–63.
7. Hüseynli, N. (2021). Semiologiya və Azərbaycan vizual sənətləri: Kino nümunələri əsasında analiz. *Azərbaycan Milli Elmlər Akademiyası Xəbərləri, 76*(1), 89–97.
8. Kazımov, E. (2022). Kino və psixoanaliz: Şüuraltı dəyərlərin vizual təqdimatı. *Humanitar Elmlər Jurnalı, 15*(3), 121–130.
9. Mehdi, N. (2024, mart 4). Bir az da kinosemiotika haqqında ("Əqrəb mövsümü" teleserialı əsasında). *Ədəbiyyat qəzeti*, s. 4–5.
10. Məmmədova, T. (2019). Azərbaycan müstəqillik dövrü kino sənətində sosial mövzular. *Elm və Cəmiyyət, 8*(4), 34–40.
11. Mulvey, L. (1975). Visual pleasure and narrative cinema. *Screen, 16*(3), 6–18. https://doi.org/10.1093/screen/16.3.6
12. Quliyev, R. (2023). "Əqrəb mövsümü" mini-serialının ictimai diskursdakı rolu. *Yeni Mediya Araşdırmaları, 2*(1), 47–55.
13. Stam, R. (2000). *Film theory: An introduction*. Blackwell Publishing.
14. Sultanova, S. (2023, mart 4). "Əqrəb mövsümü": Yeni mərhələnin başlanğıcı. *525-ci qəzet*.

Daxil oldu: 22.11.2024
Qəbul edildi: 25.02.2025

DOI: https://doi.org/10.36719/2663-4619/115/136-139

**Ülkər Əhmədzadə**
Bakı Slavyan Universiteti
magistrant
https://orcid.org/0009-0001-4625-663X
ulkerahmadzada@gmail.com

# VI sinif "Azərbaycan dili" dərsliyində dil qaydalarının təhlili

## Xülasə

Bu məqalədə VI sinif Azərbaycan dili dərsliyində nəzərdə tutulmuş dil qaydalarının şagirdlərə mənimsədilməsi, dərslikdə yer alan qrammatika qaydalarının nə dərəcədə şagirdlər üçün aydın, anlaşıqlı olmasını təhlil etmək qarşıya qoyulan vəzifələrdəndir.

Dil qaydaları hazırda ənənəvi təlim metodlarından fərqli olaraq şagirdlərə mənimsədilir. Müxtəlif iş üsullarından istifadə edilərək qaydanın mənimsədilməsi müasir interaktiv təlim metodlarının tətbiqi nəticəsində əldə olunur. Ənənəvi dərslərdə qrammatik qaydalar daha çox əzbərlədilirdisə, müasir dərslərdə müxtəlif iş üsullarından istifadə edilərək dil qaydaları öyrədilir. Dərsi interaktiv təlim metodları ilə təşkil edən müəllim şagirdlərdə öyrənmə-tətbiq vərdişini yaradır.

***Açar sözlər:*** *dərslik, dil qaydaları, təhlil, üsul, qrammatika*

**Ulkar Ahmadzadeh**
Baku Slavic University
Master student
https://orcid.org/0009-0001-4625-663X
ulkerahmadzada@gmail.com

# Analysis of Language Rules in the 6th Grade "Azerbaijani Language" Textbook

## Abstract

In this article, the tasks set to analyze the mastery of the language rules provided in the Azerbaijani language textbooks for VI grade, and to what extent the grammar rules in the textbooks are clear and understandable for students.

Language rules are currently studied by students differently from traditional teaching methods. Teaching of the rules using various working methods is achieved as a result of the application of modern interactive teaching methods. While in traditional lessons, grammatical rules were mostly memorized, in modern lessons, language rules are taught using various working methods. The teacher, who organizes the lesson with interactive teaching methods, creates the habit of learning-applying in students.

***Keywords:*** *textbook, language rules, analysis, method, grammar*

## Giriş

Azərbaycan dili öz struktur quruluşu ilə fərqlənən dillərdən biridir. Məktəblərdə ana dili Azərbaycan dili olan şagirdlərə dil qaydaları düzgün şəkildə mənimsədilsə, təbii ki, şagirdin dil qaydalarını anlamasında heç bir çətinliyi olmayacaq. Bu mənada işin ağırlığı müəllim və şagirddən çox orta məktəbdə tədris olunan Azərbaycan dili dərsliklərinin üzərinə düşür. Tədris ili ərzində müxtəlif vaxtlarda dərsliklərin monitorinqi, çatışmazlıqların aradan qaldırılması istiqamətində işlər həyata keçirilir (Mehdiyev, 2011).

Kurikulum tətbiq olunduqdan sonra orta məktəblərdə dil qaydaları ilə bağlı məzmun xətti" Azərbaycan Respublikasının ümumtəhsil məktəbləri üçün Azərbaycan dili üzrə təhsilproqramı"nda

 

bu şəkildə təqdim olunmuşdur: "Bu məzmun xətti dilin fonetik, leksik və qrammatik quruluşu ilə bağlı ən zəruri biliklərin yığcam, sadə, aydın qayda və şərhlər formasında şagirdlərə catdırılmasını, orfoqrafiya qaydalarına riayət edilməsini, durğu işarələrindən yerli-yerində düzgün istifadə olunmasını təmin edir (Mehrabov, 2007). Şagirdlərin həm oxu, həm də yazı qabiliyyətlərinin inkişafı üçün zəmin yaradır. Şagirdlərin şifahi və yazılı nitq bacarıqlarının formalaşmasında mühüm rol oynayan ən zəruri linqvistik biliklərin öyrənilməsini, mədəni nitq üçün vacib sayılan mühüm tələblərin qavranılmasını, ədəbi dilin funksional və fərdi üslublarının səciyyəvi xüsusiyyətlərinin dərk olunaraq fərqləndirilməsini və təcrübədə tətbiqini təmin edir" (Zeynalova, Bayramova, 2017). *Ümumi təhsilin kurikulumunun əsasları.* Bakı. Dil qaydaları izahları siniflər üzrə fərqləndirilmişdir. Yəni, izahlar sadədən mürəkkəbə doğru yüksələn xətlə verilmişdir.

**Tədqiqat**

6-cı sinif yeni dərsliyə diqqət yetirdikdə dərslikdə yer alan dil qaydalarının birinci hissəsində nitq hissələri ilə bağlı qaydanın verildiyini görürük. İlk olaraq nitq hissəsi haqqında ümumi məlumat verilmişdir və hər bir nitq hissəsinin adı qeyd olunmuşdur (Məktəbdaxili qiymətləndirmə: Tədqiqatlar, nəticələr, 2016). Qaydaya uyğun olaraq tapşırıq verilmişdir. Köməkçi və əsas nitq hissələrini bir-birindən ayırd etmək üçün müəyyən tapşırıqlar verilmişdir. Bu da şagirdlərin əsas və köməkçi nitq hissələrini daha yaxşı mənimsəməsində əsas rol oynayır (Azərbaycan dili, 2017).

Daha sonra artıq nitq hissələrinin hər biri ayrı-ayrılıqda verilmişdir. Hər bir nitq hissəsinin xüsusiyyəti qeyd olunmuşdur. 5-ci sinifdə ismin ümumi xüsusiyyətləri keçirilmişdir. Artıq 6-cı sinif dərsliyində düzəltmə isimlər, isimlərin mənsubiyyətə görə dəyişməsi, müəyyən və qeyri müəyyən yiyəlik hal, təsirlik hal, yönlük və çıxışlıq halda olan sözlərin yazılışı haqqında izahlar verilmişdir. 6-cı sinif dərsliyində keçirilən isim mövzusu ilə bağlı bir tapşırığa diqqət yetirək (Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası, 2013):

"Söz birləşmələrində mənsubiyyət şəkilçili sözləri müəyyənləşdirin: əsərin qəhrəmanı, kəndimizin yolları, şairin sonuncu kitabı, gözümün işığı "İsmayılov R., Cəfərova D., Məmmədova S. (2023). *VI sinif Azərbaycan dili dərsliyi*. Altun kitab.

Nümunədən də görürük ki, şagirdlərin mövzunu mənimsədilməsi baxımından tapşırıqların müəyyən əhəmiyyəti vardır.

III hissədə süzəltmə sifətlər haqqında izah verilmişdir. Burada digər nitq hissələrindən sifət düzəldən şəkilçilər qeyd olunmuşdur. Şəkilçilər tünd qara hərflərlə verilmişdir ki, şagirdin diqqətini çəksin. Daha sonra qaydaya uyğun olaraq tapşırıqlar təqdim olunmuşdur (Azərbaycan Respublikasının ümumtəhsil məktəbləri üçün Azərbaycan dili üzrə təhsil proqramı (kurikulumu), 2013).

Dil qaydalarından say mövzusuna baxsaq görürük ki, sayın mənaca növləri, numerativ sözlər, sayın quruluşca növləri, sayların yazılışı, miqdar saylarında şəkilçilərin yazılışı, sıra saylarının yazılışı, mürəkkəb saylar və yazılışı, sifət və sayların isimləşməsi verilmişdir. İlk olaraq sayın izahı, sualları və məna növlərinin adları göstərilmişdir. Daha sonra hər bir məna növü ayrı-ayrılıqda izah edilmiş və müəyyən tapşırıqlar verilmişdir (İbadova, 2014). Say və sifətin isimləşməsi ilə bağlı qaydaya diqqət yetirək:

"Bəzən cümlələrdə sifət və saylar isim kimi işlənə bilir. Bu zaman həmin sözlər kim?, nə? suallarına cavab verir və hal, mənsubiyyət, cəm şəkilçiləri qəbul edir.

1. Toxun acdan xəbəri olmaz.
2. Çoxu bizim dediklərimizlə razılaşdı. "İsmayılov R., Cəfərova D., Məmmədova S. (2023) . *VI sinif Azərbaycan dili dərsliyi*. Altun kitab.

Nümunədən görürük ki, qayda asan şəkildə şagird üçün hazırlanmışdır. Şagirdin yaxşı mövunu mənimsəməsi qaydanın asan və sadə izahından asılıdır (Təhsilin inkişafı üzrə Dövlət Strategiyası: Perspektivlər və vəzifələr, 2015).

Qrammatik qaydaya əsasən əvəzlik mövzusuna diqqət yetiririk. VI sinif dərsliyində görürük ki, əvəzliyin izahı, məna növləri, quruluşca növü və o, bu əvəzliklərindən sonra vergülün qoyulması qaydaları izah edilmişdir. İlk olaraq əvəzliyin izahı verilmişdir. Daha sonra şəxs əvəzlikləri və işarə əvəzlikləri haqqında ayrılıqda qayda izahı göstərilmişdur. Hər bir izaha əsasən müəyyən tapşırıqlar verilmişdir. Həmin tapşırıqlar şagirdin mövzunu mənimsəməsi üçün əhəmiyyət kəsb edir (Şagird

nailiyyətlərinin qiymətləndirilməsi texnologiyaları, 2017). Əvəzliyin digər məna növləri olan qeyri müəyyən əvəzliklər, təyini əvəzliklər haqqında da izahı görürük. Son olaraq əvəzliyin quruluşca növlərin aid qayda təqdim edilmişdir. Burada sadə və mürəkkəb əvəzliklərin aydın şəkildə izahı verilib. Mürəkkəb əvəzliklərin yazılış qaydası da göstərilmişdir. Əvəzliklə bağlı bir tapşırıq nümunəsinə baxaq (Mehdiyev, 2011):

"Hansı cümlədə kimsə əvəzliyi heç kim əvəzliyinin sinonimi kimi çıxış edib?

1. Kimsə qapını bərkdən döydü.
2. Neçə vaxt idi ki, ananın qapısını kimsə döymürdü". İsmayılov R., Cəfərova D., Məmmədova S. (2023). *VI sinif Azərbaycan dili dərsliyi*. Altun kitab.

İlk olaraq düzəltmə feillərin qaydası verilmişdir. Şagirdlərə asan olmağı üçün feil düzəldən şəkilçilər tünd qara hərflə göstərilmişdir. Daha sonra feilin şəkilləri mövzusundan bəhs olunuşdur. Feilin xəbər şəkli, xəbər şəklində olan feillərin yazılışı və tələffüzü, əmr şəkli, arzu şəkli, vacib şəkli, lazım şəkli və şərt şəkli ayırılıqda qaydaları göstərilmişdir. Hər bir qaydaya uyğun müəyyən tapşırıqlar və mətn üzərində dil qaydalarının tətbiqinə dair yazı işləri təqdim olunmuşdur (Rüstəmov, 2008).

Feillə bağlı bir tapşırıq nümunəsinə diqqət yetirək:

“Aşağıdakı feillərin hansı nitq hissəsindən yarandığını müəyyən edin:

**Hallanmaq, azalmaq, döyüşmək, qaçırmaq, uzlaşmaq, soyuqlamaq, ağarmaq, daralmaq, birləşmək.”**İsmayılov R., Cəfərova D., Məmmədova S. (2023). *VI sinif Azərbaycan dili dərsliyi*. Altun kitab.

Son olaraq əsas nitq hissələrindən zərfə yer verilmişdir. İlk olaraq zərf haqqında ümumi məlumat verilmişdir. Bu qaydada zərfin izahı, sualları göstərilmişdir. Daha sonra zərfin quruluşca növləri və mürəkkəb zərflərin yazılışı qaydasını görürük. Zərfin məna növlərinin hər birinin izahı göstərilmişdir. Son olaraq şagirdin zərf və sifəti ayırd etməsi üçün qayda verilmişdir (Balıyev, 2014).

Zərfliklə bağlı tapşırıq nümunəsinə diqqət yetirək:

“Hansı cümlədə mürəkkəb zərf işlənmişdir?

1. Səhərə yaxın yağış kəsdi.
2. Uşaq rəngbərəng şəkillərə maraqla baxırdı.
3. Sərginin iştirakçıları günbəgün çoxalırdı.
4. Mən dostumla üzbəüz dayanıb söhbət edirdim.
5. Ana əyilib qızının üzündən yavaşca öpdü. “İsmayılov R., Cəfərova D. Məmmədova S. (2023). *VI sinif Azərbaycan dili dərsliyi*. Altun kitab.

Tapşırığa diqqət yetirdikdə görürük ki, şagirdin mövzunu mənimsəməsi üçün bu cür tapşırıqlar mühüm əhəmiyyər kəsb edir.

Dərsliyin son bölməsində cümlənin qrammatik əsasları haqqında məlumat verilmişdir. Mübtəda və xəbər ayrı-ayrılıqda izah edilmişdir. Mübtədabın qısa şəkildə izahı verildikdən sonra ifadə vasitələri göstərilmişdir. Xəbərin də sadə izahı verilmiş və növləri göstərilmişdir. İsmi xəbər və feili xəbər izah olunmuşdur (Əhmədov, Abbasov, Talıbov, 2009). İsmi xəbər və feili xəbərin fərqləri göstərilmişdir. Son olaraq xəbər və mübtədanın uzlaşması qaydasını görürük. Mübtəda və xəbərin uzlaşması qaydasındakı nümunəyə diqqət yetirək:

“*Mən* kitab oxumağı çox *sevirəm*. *Qızlar* mahnı oxuya-oxuya bulağa *gedirdilər*. *Şagirdlər* sərgidəki turistlərə diqqətlə *baxırdılar*.” İsmayılov R., Cəfərova D., Məmmədova S. (2023) . *VI sinif Azərbaycan dili dərsliyi*. Altun kitab.

Qaydada mübtədanın şəxsə və kəmiyyətə görə uzlaşması da aydın şəkildə izah edilmişdir.

Dərslikdə hər bir bölmənin sonunda “Ümumiləşdirici təkrar” başlığı verilir. Burada həmin bölmədə keçirilən dil qaydalarına aid olan tapşırıqlar verilir. Bu tapşırıqlar şagirdin mövzunu necə mənimsədiyini daha aydın görməyə şərait yaradır (Məmmədova, 2023).

## Nəticə

Kurikulumdan öncəki tədris proqramında Azərbaycan dili fənnin üzrə dil qaydalarına baxsaq, 6-cı sinif dərsliklərində dil qaydalarından yalnız ümumi olaraq izahlar verilmişdir. Lakin kurikulumun

tətbiqindən sonra 6-cı sinif qrammatik qaydalar məzmun xətti, məzmun standartı üzrə tədris olunmağa başladı. Şagird mövzuların hamısından öz mənimsəmə səviyyəsinə uyğun xəbərdar olmuş olur.

"Azərbaycan dili dərsliklərində yer alan dil qaydaları ənənəvi metodlardan fərqli olaraq interaktiv metodlarla həyata keçirilir ki, bu da şagirdlərin dil qaydalarını mənimsəməsi dinamikasının yüksələn xətt üzrə getdiyini göstərir" (Azərbaycan Respublikasında Ümumi Təhsilin Konsepsiyası (Milli Kurikulum), 2008, s. 5). Ümumtəhsil məktəblərində Azərbaycan dili fənninin əsas məqsədi təhsilanların ümumi nitq bacarıqlarını, nitq mədəniyyətini formalaşdırmaqdan ibarətdir. Ana dili Azərbaycan dili olan məktəblərdə təhsilalan təhsilini başa vurduqda öz fikrini aydın söyləyə bilməli, fikrini şifahi və yazılı şəkildə çatdıra bilməli, sərbəst şəkildə ünsiyyət quraraq mülahizə yürütməyi bacarmalıdır. Dərsliklərin bu yöndə qrammatika qaydalarının mənimsədilməsində rolu danılmazdır.

## Ədəbiyyat

1. Azərbaycan dili. (2017). *6-cı siniflər üçün dərslik*. Bakı.
2. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası. (2013). *Azərbaycan məktəbi, (5)*, 38.
3. Azərbaycan Respublikasında Ümumi Təhsilin Konsepsiyası (Milli Kurikulum). (2008). *Kurikulum, (1)*, 131–151.
4. Azərbaycan Respublikasının ümumtəhsil məktəbləri üçün Azərbaycan dili üzrə təhsil proqramı (kurikulumu). (2013).
5. Balıyev, H. (2014). *Azərbaycan dilinin tədrisi metodikası*. Qismət.
6. Əhmədov, A. Ə., Abbasov, Ə. M., & Talıbov, T. (2009). Təhsil kurikulumlarının xarakterik cəhətləri. *Kurikulum, (1)*, 15–21.
7. İbadova, B. O. (2014). *Müasir dərs necə olmalıdır? Yeni təhsil proqramlarının (kurikulumların) tətbiqi məsələləri*.
8. Mehdiyev, G. (2011). Fəal interaktiv təlim metodunun imkanları. *Pedaqoji Universitetinin Xəbərləri, (3)*, 388–389.
9. Mehdiyev, G. (2011). Yeni təlim metodu ilə yanaşmanın ana dili dərslərində rolu. In *Doktorantların və Gənc tədqiqatçıların XV Respublika Elmi Konfransının materialları* (s. 131–133).
10. Mehrabov, A. O. (2007). *Azərbaycan təhsilinin müasir problemləri*. Mütərcim.
11. Məktəbdaxili qiymətləndirmə: Tədqiqatlar, nəticələr. (2016). *ARTPİ-nin Təhsil Texnologiyaları Mərkəzinin nəşriyyatı*.
12. Məmmədova, K. (2023). Azərbaycan dili dərslərində müasir təlim metodları ilə dil qaydalarının öyrədilməsi yolları. *Azərbaycan dili və ədəbiyyat tədrisi, (2 [276])*, 30–39.
13. Rüstəmov, F. A. (2008). Ümumi təhsilin milli kurikulumu və onun hazırlanması prinsipləri. *Kurikulum, (1)*, 435.
14. Şagird nailiyyətlərinin qiymətləndirilməsi texnologiyaları. (2017). (Elmi red. F. Şahbazlı). *"Vahid-M" MMC*.
15. Təhsilin inkişafı üzrə Dövlət Strategiyası: Perspektivlər və vəzifələr. (2015). (Elmi red. Q. Novruzov). *Təhsil Problemləri İnstitutunun Təhsil Texnologiyaları Mərkəzi*.
16. Zeynalova, N., & Bayramova, A. (2017). *Ümumi təhsilin kurikulumunun əsasları*.

Daxil oldu: 14.11.2024
Qəbul edildi: 16.02.2025

DOI: https://doi.org/10.36719/2663-4619/115/140-143

**Şövkət Rəhimova**
Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universiteti
magistrant
https://orcid.org/0009-0002-4397-0800
shovkatrehimova98@gmail.com

# Rejissor sənətində İsmayıl Hidayətzadə fenomeni

## Xülasə

İsmayıl Hidayətzadə, Azərbaycanın teatr sənətinə yön verən, öz yaradıcılıq əlamətləri ilə seçilən görkəmli rejissorlarımızdan biri olmuşdur. Sənətkarın 1920–1930-cu illər ərzində qurduğu tamaşalar, Azərbaycan teatrındakı rejissor sənətinin formalaşmasında əhəmiyyətli mərhələyə çevrilmişdir. O, bir çox klassik yazıçıların və dramaturqların əsərlərinə müasir yozumlar əlavə etmiş, Azərbaycan teatrında realist rejissor anlayışının inkişaf etməsinə və bir çox fəlsəfi əhəmiyyətə malik olan əsərlərə öz töhfəsini vermişdir. Onun ərsəyə gətirdiyi “Səyavuş”, “Şahnamə” və “Koroğlu” tamaşaları rejissorun psixoloji yanaşması ilə seçilmiş və tamaşaçılarla yanaşı, tənqidçilərin də yüksək rəğbətini qazanmışdır. Hidayətzadənin rejissorluq istedadı Şərq klassikalarında özünü göstərmiş, həmçinin müasir Azərbaycan dramaturgiyası nümunələrində də öz rejissor dəsti-xətti ilə seçilmişdir. Onun poetik ruhlu əsərlərin quruluşuna yön verməsi, ilk Azərbaycan baletini səhnələşdirməsi bu keyfiyyətlərin əyani göstəricisidir.

Onun rejissor yaradıcılığı, Azərbaycan teatr sənətinin modernləşməsinə və milli teatrımızın inkişafına yönələn addımları ilə seçilir. Məqalədə sənətkarın rejissor yanaşması, yozum fərqlilikləri, həmin dövrdə teatr sənətinə gətirdiyi yeniliklər, onun rejissorluq istedadı təhlil edilmiş, həmçinin milli teatrımızdakı əvəzsiz rolu, quruluş verdiyi əsərlərin məzmunu haqqında müəyyən təhlillər aparılmışdır.

***Açar sözlər:*** *İsmayıl Hidayətzadə, Hüseyn Ərəblinski, Cəfər Cəfərov, Cəfər Cabbarlı, sovet realizmi, Azərbaycan teatrı, Azərbaycan Dövlət Opera və Balet Teatrı, milli teatr, pyes, opera, balet, tamaşa, aktyor, rejissor*

**Shovkat Rahimova**
Azerbaijan State University of Culture and Arts
Master student
https://orcid.org/0009-0002-4397-0800
shovkatrehimova98@gmail.com

# The Phenomenon of Ismayil Hidayatzadeh in the Art of Directing

## Abstract

Ismayil Hidayatzadeh was one of our outstanding directors who guided the theater art of Azerbaijan and distinguished himself with his creative features. The performances that the artist staged during the 1920s-1930s became an important stage in the formation of the art of directing in the Azerbaijani theater. He added modern interpretations to the works of many classical writers and playwrights, contributed to the development of the concept of a realistic director in the Azerbaijani theater and to many works of philosophical significance. The performances he created, “Seyavush”, “Shahnameh” and “Koroghlu”, were selected for the psychological approach of the director and won high praise from the audience as well as critics. Hidayatzadeh’s directorial talent manifested itself in Eastern classics, and was also selected for his directorial style in examples of modern Azerbaijani dramaturgy. His direction of the structure of poetic works and staging of the first Azerbaijani ballet are clear indicators of these qualities.

 

His directorial work is distinguished by his steps towards the modernization of Azerbaijani theater art and the development of our national theater. The article analyzes the artist's directorial approach, differences in interpretation, the innovations he brought to theater art at that time, his directorial talent, as well as his invaluable role in our national theater and the content of the works he directed.

***Keywords:*** *Ismayil Hidayatzadeh, Huseyn Arablinski, Jafar Jafarov, Jafar Jabbarli, Soviet realism, Azerbaijani theater, Azerbaijan State Opera and Ballet Theater, national theater, play, opera, ballet, performance, actor, director*

## Giriş

Azərbaycan teatrlarında ən ciddi yaradıcılıq uğurlarından biri, aktyorun ampulaya düşməməsi və mütəmadi şəkildə yeni obrazların ruhunu duymaq məharətindən qaynaqlanırdı. İsmayıl Hidayətzadənin aktyor yaradıcılığının bu mənada formalaşması, onun bir çox əsərlərin yozum imkanlarına malik olmasına, həmçinin zamanla rejissor sənətinin incəliklərinə bələd olmasına da şərait yaratmışdı. Əslində, sənətkarın zamanla rejissorluğa meyil etməsi və müxtəlif xarakterli tamaşalara quruluş verməsi kimi önəmli keyfiyyətlərə malik olmasının başqa bir səbəbi də var idi (Rəhimli, 2004).

Cəfər Cəfərovun sözlərinə görə, İsmayıl Hidayətzadənin rejissor sənətinə meyil etməsinin ən böyük səbəblərindən biri də onun bir çox tamaşalara rəhbərlik etməsindən qaynaqlanırdı (Cəfərov, s. 99).

**Tədqiqat**

Ümumiyyətlə, həmin dönəmlərdə tamaşalara rejissor yanaşması ilə nəzər yetirmək vəzifəsi, dövrün məşhur aktyorlarının öhdəsində olan məsələlərdən biri idi. Təsadüfi deyil ki, vaxtilə Hüseyn Ərəblinskinin Azərbaycan teatrlarında rejissorluq fəaliyyətinə başlamasının ən böyük səbəblərindən biri də elə bu idi (Rəhimli, 2005).

İsmayıl Hidayətzadənin ilk rejissorluq fəaliyyətləri. SSR rejiminin yenicə qurulduğu ərəfələrdə bir çox aktyorlar teatr təşkilatçısı kimi fəaliyyət göstərsə də, onların hər biri rejissor yaradıcılığına ciddi mənada meyil etməmiş və bu sənətə ötəri bir vəzifə kimi baxmışlar (Rəhimli, 2008).

Amma nəzərə almaq lazımdır ki, Hüseyn Ərəblinski kimi istedadlı sənətkarlar rejissor sənətinə keyfiyyət baxımından daha həssas və tamaşanın quruluşu nöqteyi-nəzərindən isə daha peşəkar yanaşırdı (Ağayeva, 1997).

Bu keyfiyyətlər öz əksini İsmayıl Hidayətzadənin rejissor yanaşmasında da göstərirdi.

XX əsrin əvvəllərindən etibarən teatr yaradıcılığına başlayan İsmayıl Hidayətzadənin aktyorluq istedadındakı yozum imkanları müəyyən bir dövrdən sonra özünü rejissorluq sənətində də göstərməyə başlamışdı. Bunu şərtləndirən səbəblərdən biri də, sözsüz ki, sənətkarın əsasən baş rolların ifaçısı kimi uğurlu çıxışlar etməsi və bir çox pyeslərin müasir variantını təqdim etməsi, həmçinin yaratdığı xarakterlərə orijinal yanaşması ilə bağlı idi. Bu keyfiyyətlər, heç şübhəsiz, müəyyən bir vaxtdan sonra Hidayətzadənin qurduğu bir çox tamaşalarda da duyulmağa başlamışdı (Cəfərov, s. 101).

Məsələn, İsmayıl Hidayətzadənin 1919-cu ildə qurduğu "Səyavuş" tamaşası sənətkarın rejissor yanaşması ilə bağlı bu sahədə əldə etdiyi ilk təcrübələrindən biri idi (Cəfərov, s. 100).

Onun həmin dövrlərdə yerinə yetirdiyi vəzifələr arasında əvvəlcə opera teatrında, daha sonra isə dram teatrında rejissor müavini kimi çalışmağa başlaması sənətkarın bu istiqamətdə müəyyən təcrübələr əldə etməsinə şərait yaradırdı.

Cəfər Cəfərovun sözlərinə görə, İsmayıl Hidayətzadənin rejissorluq fəaliyyətindəki ilk dövr 1926-cı ilə qədər davam edib (Cəfərov, s. 100).

Məsələn, həmin dövrlərdə Hüseyn Ərəblinski ilə yanaşı A. M. Şərifzadə, M. S. Kirmanşahlı, Sidqi Ruhulla kimi bir çox sənətkarlar məhz bu yolu keçmişdir (Kərimov, 2002, s. 65).

XX əsrin 20-ci illəri ərzində teatr sahəsində çalışan bir çox sənətkarlar Moskva və Leninqrad kimi şəhərlərdə rejissorluq təhsili almaqda idi.

SSR rejiminin nəzarəti altında yaradılan Azərbaycan teatrlarında 1930-cu illərə qədər peşəkar səviyyədə fəaliyyət göstərən rejissor yaradıcılığına çox nadir hallarda rast gəlinirdi. Bunun ən önəmli

səbəbi həmin dövrlərdə baş verən ictimai-siyasi proseslərin Azərbaycan teatrlarına da yansıması idi. Belə ki, yenicə qurulan SSR hakimiyyəti XX əsrin 30-cu illərinə qədər bu mövzuya elə də ciddi yanaşmırdı (Balazadə, 2014).

Rejissor sənətinin ikinci, hətta üçüncü planda qaldığı illərdə bir çox əsərlər öz klassik mövqeyini, dövrün reallıqlarına yansıyan "teatr cəmiyyətin güzgüsüdür" mexanizmini müəyyən mənada itirmək təhlükəsi ilə üzləşirdi.

Belə çıxır ki, İsmayıl Hidayətzadə kimi bir çox tanınmış sənətkarların rejissorluq mövqeyinə doğru irəliləyişi də məhz zamanın tələbindən, dövrün ehtiyacından gələn bir çağırış idi. Bu çağırışa qulaq verən şəxsiyyətlər arasında İsmayıl Hidayətzadənin özünəməxsus yaradıcılıq dəsti-xətti görünürdü. Ancaq hər bir halda, onun yaradıcılıq imkanları özü-özlüyündən, sadəcə bir ehtiyac üzündən yaranmamışdı (Cəfərov, 2005).

Onun istedadlı bir rejissor kimi yetişməsində, başda Hüseyn Ərəblinski olmaqla, Cəfər Cabbarlının, R.Təhmasibin, Sidqi Ruhullanın, A.M.Şərifzadənin, R.Daranlının da müəyyən təsirləri olmuşdur (Cəfərov, s. 104).

Hidayətzadə, öz rejissorluq təcrübəsini "Ölülər", "Dönüş", "Şeyx Sənan" kimi yüksək məsuliyyət tələb edən bir çox tamaşalara quruluş verərkən, Cəfər Cabbarlı, R. Təhmasib və R. Darablı kimi sənətkarlarla birgə çalışmağa imkan tapmışdır (Cəfərov, s. 105).

Beləliklə, zamanın tələbi və bir çox səhnə ustası ilə peşəkar fəaliyyətə başlamaq imkanı, Hidayətzadənin sənətkar kimliyinə rejissor ünvanını da əlavə etdi. Onun müstəqil rejissor yanaşmasının ilk bəhrəsi, dahi 1934-cü ildə fars şairi Firdovsinin "Şahnamə"sindən götürülən "Səyavuş" əsəri idi (Talıbzadə, 2002).

İsmayıl Hidayətzadənin peşəkar rejissor fəaliyyəti ilə bağlı aparılan təhlillər. "Səyavuş" tamaşası, öz süjet xətti etibarilə, rejissordan həssas yanaşma, yüksək təcəssüm qabiliyyətlərini tələb edirdi. Çünki bu tamaşa "Şahnamə"dəki "Səyavuş və Südabə" əsərinin ana xəttini təşkil edirdi. Və təbii olaraq, bu əsər ilə işləyən rejissor, tamaşa zamanı dramatik təsvir elementlərini yüksək həssaslıqla əks etdirməli idi. İsmayıl Hidayətzadənin "Səyavuş" tamaşası olduqca uğurlu alınmışdı (Cəfərov, s. 124).

Səhnə əsərində istər xarakterlərin orijinallığı, istərsə də insan xislətinin dəyişməz konfliktlərinin təsviri, rejissorun ən vacib uğurlarından idi.

Sözügedən tamaşa ilk dəfə 1934-cü ilin oktyabr ayında nümayiş etdirilmişdi.

Cəfər Cəfərovun sözlərinə görə, həmin dövrdə bir çox tənqidçilər, rejissorun kütləvi səhnələri yüksək ustalıqla qurduğundan yazırdı (Kərimov, 2003).

Tamaşanın uğuru çox qısa zamanda özünü göstərdi. Təsadüfi deyil ki, "Səyavuş" tamaşası 2 mövsüm ərzində 100 dəfə oynadılmışdır. Həmin tamaşanın üzünü təqdimatı 1936-cı ilin on yeddisində baş tutmuşdur (Cəfərov, s. 103).

Firdovsinin poetik dünyasına daxil olan "Səyavuş" tamaşasının uğurlu nümayişi, Hidayətzadənin növbəti məsuliyyətə yönəlməsinə səbəb oldu. Sonrakı məsuliyyət isə onun "Səyavuş" rəng müqayisədə daha böyük bir tamaşa qurması tapşırığı ilə əlaqədar idi. Belə ki, Firdovsinin dramatik təsvir dünyasını duyan rejissora bu dəfə "Şahnamə" eposunun qurulması tapşırılmışdı (Cəfərov, s. 100).

İsmayıl Hidayətzadənin "Şahnamə" tamaşasındakı uğuru isə daha böyük nəticələr əldə etdi. Təsadüfi deyil ki, tənqidçilər onu bu tamaşadan sonra "Şahnamə"nin ikinci müəllifi adlandırırlar (Cəfərov, s. 105).

Sirr deyil ki, "Şahnamə" məzmun baxımından fəlsəfi bir əsər mahiyyətini daşıyırdı. Burada xeyir ilə şərin mübarizəsi müxtəlif personajların timsalında canlandırılır və İran ilə Turan münasibətlərinə baxış keçirilirdi (Qarayev, Rəhimli, 2013).

Əslində, "Səyavuş" və "Şahnamə" əsərlərinin Hidayətzadəyə verilməsi heç də təsadüfi deyildi. Çünki istər "Şahnamə", istərsə də "Səyavuş" əsərləri öz daxilində şahların zalımlığına eyham vurur, millətçilik anlayışlarını isə müəyyən mənada rədd edirdi. Heç şübhəsiz ki, bu cür anlayışlar sovet realizminin əsasını təşkil edən ən vacib ünsürlərdən idi. Oxşar cəhətləri, Hidayətzadənin sonrakı uğuruna çevrilən "Koroğlu" tamaşasının daxili ideyasında da görmək mümkündür. "Koroğlu" eposu, "Şahnamə"nin zəngin dünyası ilə müqayisədə bir qədər zəif olsa da, burada əsas məsələ dövrün

rejiminin diqtə etdirməsi idi. Belə ki, "Koroğlu" eposunda monarxiya rejiminin tənqid edilməsi, xalq hərəkatının bərabərlik düşüncəsi ilə inqilabi qalxması, müəyyən mənada sosialist inqilabı ilə səsləşirdi. Hidayətzadənin quruluşunda yaradılan "Koroğlu" operası, 1937-ci ildə, aprel ayının 28-də də baş tutmuşdu ("Koroğlu" operasının tamaşası haqqında düşüncələrim, 2014).

Azərbaycanın xalq şairi Səməd Vurğun "Yeni yol" qəzetində yazırdı ki:

"Operanın rejissorluq işi böyük nailiyyətdir" (Cəfərov, s. 104).

"Koroğlu" operası, İsmayıl Hidayətzadənin gələcək uğurları üçün əvəzolunmaz bir yol idi. Sənətkarın

"Azərbaycan Dövlət Opera və Balet Teatrına baş rejissor təyin edilməsi, həmin uğurun ən böyük nəticəsi idi (Xəlilzadə, 2011).

Hidayətzadə, bu illər ərzində bir çox tamaşada öz dəsti-xəttini nümayiş etdirir. Onun "Xosrov və Şirin", "Karmen", "Nizami", "Anuş", "Arşın mal alan" tamaşaları, həmçinin "Qız qalası" baletinin ərsəyə gətirməsi, məhz opera və balet teatrına baş rejissor təyin edildiyi dönəmləri əhatə edirdi. Yeri gəlmişkən, sənətkarın "Qız qalası" baleti, ilk Azərbaycan baleti kimi xüsusi əhəmiyyətə malik idi (Cəfərov, s. 125).

## Nəticə

Bu araşdırmalar, onu göstərir ki, İsmayıl Hidayətzadənin rejissor yanaşmaları və bu sahədə atdığı önəmli addımlar, milli teatr ənənələrimizə yeni baxış qazandırmış, sənətkarın rejissor kimliyini isə estetik yozum imkanları baxımından xeyli zənginləşdirmişdir.

İsmayıl Hidayətzadənin 30 illik teatr yaradıcılığının yarısı, demək olar ki, məhz professional rejissor sənətinə həsr edilib (Cəfərov, s. 105).

Onun professional rejissor kimi çalışdığı illər ərzində, bir çox səhnə quruluşlarına yön verməsi, bunun əyani sübutudur.

## Ədəbiyyat

1. *"Koroğlu" operasının tamaşası haqqında düşüncələrim*. (2014, dekabr 5). *Ədalət*, s. 6.
2. Ağayeva, N. (1997). *Azərbaycan teatr tənqidi və teatrşünaslığın inkişaf problemləri*. Elm.
3. Balazadə, Ə. (2014, oktyabr 30). Hüseyn Cavidin "Səyavuş"u: O, Firdovsidə qabarıq verilmiş mifoloji süjetlərə, obrazlara yer verməyib. *Xalq Cəbhəsi*, s. 14.
4. Cəfərov, C. (2005). *İsmayıl Hidayətzadə*. Çaşıoğlu.
5. Cəfərov, C. (t.y.). *Azərbaycan teatrı*. Zərdabi Nəşr MMC. *(Qeyd: "t.y." – "tarixi yoxdur" mənasında APA-da istifadə olunur.)*
6. Xəlilzadə, F. (2011, avqust 19). "Balaca Ərəblinski"nin böyük arzuları. *Azərbaycan*, s. 5.
7. Kərimov, İ. (2002). *Azərbaycan peşəkar teatrının tarixi və inkişaf mərhələləri*. Maarif nəşriyyatı.
8. Kərimov, İ. (2003). *Məqalələr*. Tural-Ə.
9. Qarayev, Ə. (Layihə rəhb.), & Rəhimli, İ. (Tərtibçi). (2013). *Azərbaycan teatr antologiyası: I hissə*. Azərbaycan Respublikası Mədəniyyət və Turizm Nazirliyi.
10. Rəhimli, İ. (2004). *Azərbaycan teatrının estetik prinsipləri*. Çaşıoğlu.
11. Rəhimli, İ. (2005). *Azərbaycan teatr tarixi*. Çaşıoğlu.
12. Rəhimli, İ. (2008). *Azərbaycan Dövlət Opera və Balet Teatrı*. Nağıl evi.
13. Talıbzadə, A. (2002, mart 6). Balaca Ərəblinski. *Bizim Əsr*.

Daxil oldu: 05.01.2025
Qəbul edildi: 04.03.2025

DOI: https://doi.org/10.36719/2663-4619/115/144-147

**Hüseyn Nağızadə**
Qərbi Kaspi Universiteti
Magistrant
https://orcid.org/0009-0001-4867-0623
iamhuseyn02@gmail.com

# 1918-ci ildə Gürcüstan Demokratik Respublikasının yaradılması

**Xülasə**

Gürcüstan Demokratik Respublikasının yaranması, 20-ci əsrin əvvəllərindəki Cənubi Qafqazın mürəkkəb siyasi şəraitində mühüm bir mərhələni təşkil edir. 1917-ci ildə Rusiyada baş verən Fevral İnqilabı, Çar Rusiyasının süqutuna və imperiyanın parçalanmasına səbəb oldu. Bu, Cənubi Qafqaz xalqları üçün müstəqillik əldə etmək və öz gələcəklərini müəyyənləşdirmək üçün bir fürsət yaratdı. Gürcüstan bu tarixi dönəmdə fəal şəkildə müstəqillik hərəkatına qoşularaq, 1918-ci ilin may ayında Gürcüstan Demokratik Respublikasını elan etdi. Bu, Cənubi Qafqazın ilk müstəqil dövləti olmaqla yanaşı, regionun digər xalqları üçün də müstəqillik hədəflərinin işıqlandırılmasına səbəb oldu. Gürcüstan Demokratik Respublikası, qurulmasında demokratik prinsiplərə əsaslanan bir dövlət modeli təqdim etdi. Parlamentarizm, azad seçkilər, insan hüquqları və sərbəst mülkiyyət kimi müasir demokratik dəyərləri özündə cəm edirdi. Hökumət, milli suverenliyi qorumağa və ölkənin müstəqilliyini möhkəmləndirməyə çalışdı. Lakin, bu dövr daxili çətinliklər və xarici təzyiqlərlə üzləşdi. Gürcüstanın müstəqilliyi, Rusiyanın geosiyasi maraqları ilə qarşılaşdı. Xüsusən, Sovet Rusiyasının bolşevik inqilabından sonra bölgədə güclənən Sovet təzyiqləri, Gürcüstanın müstəqilliyini davam etdirməsini çətinləşdirdi. 1921-ci ilin fevralında Sovet Rusiyasının müdaxiləsi ilə başlayan silahlı mübarizə nəticəsində Gürcüstan Demokratik Respublikasının varlığı sona çatdı. Gürcüstan, Sovet İttifaqının tərkibinə daxil oldu və ölkə Sovet Sosialist Gürcüstan Respublikası olaraq dəyişdi.

***Açar sözlər:*** *Gürcüstan Demokratik Respublikası, demokratiya, Rusiya, bolşeviklər, Fevral İnqilabı*

**Huseyn Naghizadeh**
Western Caspian University
Master student
https://orcid.org/0009-0001-4867-0623
iamhuseyn02@gmail.com

# Establishment of the Democratic Republic of Georgia in 1918

**Abstract**

The establishment of the Democratic Republic of Georgia constitutes an important stage in the complex political conditions of the South Caucasus in the early 20th century. The February Revolution in Russia in 1917 led to the collapse of Tsarist Russia and the disintegration of the empire. This created an opportunity for the peoples of the South Caucasus to gain independence and determine their own future. Georgia actively participated in the independence movement during this historical period, declaring the Democratic Republic of Georgia in May 1918. This was the first independent state in the South Caucasus and it also served as a catalyst for other peoples in the region to aspire for independence. The Democratic Republic of Georgia offered a model of statehood based on democratic principles. It embodied modern democratic values such as parliamentarism, free elections,

 

human rights and free property. The government sought to preserve national sovereignty and consolidate the country's independence. However, it faced internal challenges and external pressures. Georgian independence confronted Russia's geopolitical interests. In particular, Soviet pressures, which strengthened in the region after the Bolshevik revolution in Soviet Russia, made it difficult for Georgia to maintain its independence. As a result of the armed struggle that began in February 1921 with the intervention of Soviet Russia, the Democratic Republic of Georgia ceased to exist. Georgia became the part of the Soviet Union and the country was renamed the Soviet Socialist Republic of Georgia.

***Keywords:*** *Democratic Republic of Georgia, democracy, Russia, Bolsheviks, February Revolution*

## Giriş

Gürcüstan Demokratik Respublikası, 1918-ci ildə Cənubi Qafqazda Rus İmperiyasının çökməsindən sonra qurulmuş bir dövlət idi. Bu dövr, həm Gürcüstanın, həm də regionun tarixində mühüm bir dönəmdi. Rus İmperiyasının parçalanmasından sonra Gürcüstan, müstəqilliyini elan edərək demokratik idarəetmə sisteminə əsaslanmağa çalışdı. Bu cəsarətli addım, ölkənin azadlıq və müstəqillik arzularını əks etdirirdi. Lakin bu proses həm daxili, həm də xarici siyasi və iqtisadi çətinliklərlə müşayiət olundu. Məqalədə Gürcüstan Demokratik Respublikasının qurulması və bu dövrün ölkə üçün daşıdığı siyasi, sosial və mədəni əhəmiyyəti təhlil edilib (Baberovski, 2003).

**Tədqiqat**

Zaqafqaziya Federasiyasının dağılması, Gürcüstan Demokratik Respublikasının yaranmasına şərait yaratdı və bu hadisə regionun siyasi tarixində əlamətdar dönüş nöqtəsinə çevrildi. 1918-ci il mayın 26-da Seymin son toplantısında baş verənlər təsadüfi deyil, əvvəlcədən düşünülmüş siyasi addım kimi dəyərləndirilə bilər. Bu prosesin əsas simalarından biri olan İrakli Tsereteli tribunaya qalxaraq diqqətçəkən bir sual verdi: “Zaqafqaziya Respublikası hələ də mövcuddur?” – bu sual əslində cavab tələb etməyən, mövcud vəziyyəti açıq şəkildə ifadə edən ritorik bir çağırış idi. Tsereteli bununla həm reallığı göstərdi, həm də iclas iştirakçılarına tarixi məsuliyyətlərini xatırlatdı. Daha sonra Gürcüstan xalqına üz tutaraq dedi: “İndi sən təksən... Maraqlarını qorumaq istəyirsənsə, öz dövlətini qurmalısan.” Bu sözlər sadəcə bir siyasi çıxış deyildi – xalqın şüuruna təsir edən, onları hərəkətə gətirən bir çağırış idi. “Artıq Gürcüstan Demokratik Respublikası haqqında yazıram” ifadəsi ilə isə həm federasiyanın sonunu, həm də Gürcüstanın müstəqilliyini rəsmi şəkildə elan etmiş oldu. Bu hadisə göstərdi ki, dərin etnik və ideoloji fərqlərin olduğu yerlərdə federativ birliklər möhkəm təməllərə söykənmədikdə uzun müddət davam gətirə bilmir. Gürcüstanın bu şəraitdə müstəqil dövlətə çevrilməsi təkcə siyasi məcburiyyət deyil, eyni zamanda rəhbərlik bacarığının və psixoloji hazırlığın nəticəsi idi (Woytinsky, 1921, p. 155). Zaqafqaziya Seymi cəmi iki səs fərqi ilə özünü həmçinin federasiyanı buraxdı. Bu, əslində regiondakı siyasi uğursuzluğunu və fikir ayrılıqlarını üzə çıxartmışdı. Həmin gün Gürcüstan Milli Şurası toplandı və Noe Jordaniyanın rəhbərliyi ilə Gürcüstan Demokratik Respublikasının yaradıldığını elan etdi. Jordaniya yeni dövlətin heç bir xalq və ya ölkəyə qarşı yönəlmədiyini, sülh və sabitliyə əsaslanacağını bildirmişdi (Woytinsky, 1921, pp. 158-159). Gürcüstanın müstəqillik bəyannaməsi yeddi maddə ilə qəbul olundu. Bəyannamə, etnik azlıqların da dəstəyini əks etdirmişdi. Müvəqqəti hökumət, Şura tərəfindən parlamentə hesabatlı şəkildə formalaşdırıldı və dövlətin idarəetmə mexanizminin təməlini qoydu. Bu, erkən dövrdə məsuliyyətli idarəçilik və parlamentarizm ənənələrini tətbiq etməyə yönəlmiş addım idi (Uratadze, 1956, p. 78).

Qeyd edək ki, 1918-ci ilin mayında Gürcüstan Demokratik Respublikasının elan edilməsindən sonra vilayətdə Noe Ramişvilinin rəhbərliyi altında geniş koalisiya partiyası yaradılıb. Bu, həm də milli həmrəylik və həmrəyliyə doğru bir addım kimi qəbul edildi. Koalisiya hökumətinin daxili sabitliyi və xarici müttəfiqlərlə münasibətləri gücləndirdiyi bilinir. Qeyd etmək lazımdır ki, Almaniya yeni dövlətin elan edilməsini müsbət qəbul etdi. Bu, alman cəmiyyətinə məxsus "Qafqaz postu" qəzetində cəmiyyətin fikirlərinə toxunan simvolik bir məqalədə də özünü göstərdi. Gürcüstanın müstəqilliyinin elan edilməsindən sonra ortaya çıxan yeni termin belə idi: "Xoş gəlmisiniz,

Gürcüstan!" Təsviri alqışlarla qarşılandı və vəziyyəti klassik Avropa nağıllarının motivləri ilə müqayisə edildi; sanki alman əsilli şahzadənin canlı öpüşü olan "Yatmış gözəllik" obrazı ilə müqayisə edildi. Bu görüntü həm Gürcüstanın, həm müstəqil dövlətin inkişafını, həm də yeni yaradılan dövlətin beynəlxalq səviyyədə dəstəyini simvollaşdırır (Kaukasische Post, 1918, p. 1).

1918-ci ildə Gürcüstan müstəqillik qazandıqdan sonra sosial-demokratlar federativ yanaşmalardan imtina etmiş, eyni zamanda milli maraqları üstün tutmağa başlamışdılar. Almaniyaya məxsus "Kaukasische Post" bu addımı alqışlamışdır, həmçinin sosial-demokratlar "Birləşmiş Gürcüstan Demokrat Cəbhəsi" fonunda fəaliyyət göstərdiyini, bununla yanaşı həmin addımın sabitlik və müstəqillik üçün vacib olduğunu qeyd etmişdir (Kaukasische Post, 1918, p. 2). Gürcüstan sosial-demokratlarının milli mövqeyə keçidi yalnız siyasi deyil, həm də ideoloji çəkişmələrlə müşayiət olunurdu. 2 iyun 1918-ci il tarixli məktubda rus menşeviklərinə ünvanlanan izahda onlar müstəqillik yolunu seçməyi "iradəmizə zidd vəziyyəti düzəltmək" kimi təqdim edirdilər. Bu, onların əvvəlki beynəlmiləl prinsiplərlə yeni milli reallıqlar arasında qaldıqlarını, lakin reallığın onları yeni mövqe tutmağa məcbur etdiyini göstərir. Beləliklə, Gürcüstanın müstəqilliyi həm siyasi, həm də ideoloji çevrilmələri zəruri edən mürəkkəb bir proses idi (Pavlov, 1999, pp. 512-516).

Gürcüstanda bolşevik təşkilatları fəal idi və iğtişaşlar tez-tez "bolşevik" əlaqəsi ilə qarşılanırdı. Asayişi qorumaq və təhlükəsizliyi təmin etmək vəzifəsi sosial demokratların hərbiləşmiş Xalq Qvardiyasına, Valiko Jugeli'nin rəhbərlik etdiyi quruma tapşırılmışdı. Qvardiya yalnız təhlükəsizliklə kifayətlənməyib, həm də siyasi mübarizənin ön cəbhəsində dayanmışdı. Jugeli və yoldaşlarının fəaliyyətləri "Borba" jurnalında təbliğ olunurdu. 12 dekabr isə sosial demokratların milli müstəqillik uğrunda mübarizəsini simvolizə edən milli bayram olmuşdu (Francis, 2019).

Dzhugeli, Xalq Qvardiyasını "dürüst və fədakar" bir təşkilat olaraq təsvir edib, onun beynəlmiləlçilik ideallarına və demokratiyanın gözəllik və əzəmətinə sadiq olduğunu vurğulamışdı. Təşkilat, həm də bərabərlik, ədalət və birliyə əsaslanan dəyərlərlə diqqət çəkirdi (Dzhugeli, 1920, s. 83-84).

Dzhugeli'nin cəza missiyalarının məqsədləri və hadisələrə baxışı, Xalq Qvardiyasının üsyançılara qarşı mübarizəsini ideoloji və siyasi baxımdan daha geniş izah edirdi. Borba jurnalının 1918-ci il tarixli məqaləsində, bolşeviklər "əks-inqilab agentləri" və "Türk emissarları" ilə əlaqələndirilərək, Xalq Qvardiyasını xainlərdən qisas almağa çağırmışdı. Bu ifadələr, ideoloji və regional qarşıdurmaların əks-sədası olaraq qiymətləndirilə bilər (Bor'ba, 1918, s. 2).

Jan Loris-Melikov, Gürcüstanın mühafizəçilərinin güc tətbiq edərək əhalini qorxu altında saxladıqlarını və yaxşı maaş aldıqlarını vurğulamışdır. Mühafizəçilər yalnız təhlükəsizlik təmin etməklə kifayətlənməyib, dövlətin sosial və siyasi tələblərini yerinə yetirirdilər. "Terror" metodları, xüsusən üsyankar milli azlıqlara qarşı istifadə olunur, bu da sosial və siyasi sabitlik üçün güc və qorxu vasitələrindən istifadə etməyi göstərir. Bu yanaşma, dövlətin hegemonyasını qurmağa çalışan rəhbərliyin tətbiq etdiyi məhdudiyyətlər və etnik gərginlikləri əks etdirirdi (Mélicof, 1920, s. 164).

## Nəticə

Gürcüstan Demokratik Respublikasının yaranması, Cənubi Qafqazda milli azadlıq və demokratik idarəetmə uğrunda aparılan mübarizənin önəmli mərhələlərindən biri olmuşdur. Qısa ömürlü olsa da, bu respublika, Gürcüstan xalqının müstəqil dövlət qurmaq, demokratik dəyərlərə əsaslanan cəmiyyət yaratmaq istəklərinin real ifadəsi idi. Gürcüstan Demokratik Respublikası, 20-ci əsrin əvvəllərində baş verən siyasi dəyişikliklər fonunda regionda ilk müasir dövlətçilik nümunələrindən birini yaratdı. Onun süqutu Sovet ekspansiyasının nəticəsi olsa da, bu tarixi təcrübə Gürcüstanın gələcək müstəqillik hərəkatları üçün ilham mənbəyi rolunu oynadı. Beləliklə, bu dövr, yalnız Gürcüstan üçün deyil, bütövlükdə Cənubi Qafqaz xalqları üçün də azadlıq arzularının və demokratik ideallarin başlanğıc nöqtəsi kimi yadda qaldı.

## Ədəbiyyat

1. Baberovski, Y. (2003). *Düşmən hər yerdədir (Stalinizm Qafqazda)*.
2. Bor'ba. (1918). *No. 104*.
3. Dzhugeli, V. (1920). *Tyazhelyy krest*.
4. Francis, K. (2019). *Social democracy and national independence in Georgia 1918-1921*.
5. Hovanassian, R. G. (1971). *The Republic of Armenia. Volume 1. The first year, 1918-1919*.
6. Kaukasische Post. (1918). *Hoch Georgia!!!*.
7. Kaukasische Post. (1918). *Inland*.
8. Kazemzadeh, F. (2008). *The struggle for Transcaucasia*.
9. Mélicof, L. (1920). *The Russian revolution and the new Transcaucasian republics*.
10. Pavlov, D. (1999). *Men'sheviki v 1918 godu*.
11. Uratadze, G. (1956). *Obrazovanie i konsolidatsii Gruzinskoy Demokraticheskoy Respubliki*.
12. Wheeler-Bennett, J. W. (1938). *Brest-Litovsk: The forgotten peace*.
13. Woytinsky, W. (1921). *La démocratie géorgienne*.

Daxil oldu: 02.01.2025
Qəbul edildi: 29.04.2025

DOI: https://doi.org/10.36719/2663-4619/115/148-155

**Kamran Abdullayev**
Azərbaycan Respublikasının Prezidenti yanında
Dövlət İdarəçilik Akademiyası
magistrant
https://orcid.org/0009-0000-3435-9829
kamran_abdullayev9@mail.ru

# İcra hakimiyyətinin fəaliyyətinin optimallaşdırılmasının nəzəri əsasları

**Xülasə**

Bu məqalədə icra hakimiyyəti orqanlarının fəaliyyətinin optimallaşdırılması məsələsi tədqiq olunur. Müəllif artıq və təkrar funksiyaların ləğvi, korrupsiyaya qarşı mübarizə, antikorrupsiya mexanizmlərinin tətbiqi və dövlət idarəetməsində şəffaflığın artırılması yollarını analiz edir. İcra orqanlarının funksiyalarının qanuni əsaslarla müəyyən edilməsi, inzibati maneələrin aradan qaldırılması, autsorsinq tətbiqinin genişləndirilməsi, yeni informasiya texnologiyalarının istifadəsi və satınalma mexanizmlərinin təkmilləşdirilməsi kimi tədbirlər irəli sürülür. Məqalə, dövlət idarəetməsinin səmərəliliyinin artırılması məqsədilə icra hakimiyyəti sistemində aparılan islahatların hüquqi və təşkilati əsaslarını əhatə edir.

***Açar sözlər:*** *İcra hakimiyyəti, optimallaşdırma, xarici nəzarət, korrupsiya, inzibati islahat*

**Kamran Abdullayev**
Academy of Public Administration under the
President of the Republic of Azerbaijan
Master student
https://orcid.org/0009-0000-3435-9829
kamran_abdullayev9@mail.ru

# Theoretical Foundations of Optimizing the Activities of the Executive Authority

**Abstract**

This article explores the theoretical foundations of optimizing the issue of executive authorities. The author emphasizes eliminating redundant functions, implementing anti-corruption mechanisms, and increasing transparency in governance. Recommendations include legally defining state functions, reducing administrative barriers, expanding outsourcing practices, using new information technologies, and reforming the public procurement system. The study addresses both legal and organizational dimensions of administrative reforms aimed at enhancing the efficiency of public administration.

***Keywords:*** *Executive authority, optimization, external control, corruption, administrative reform*

## Giriş

**İcra hakimiyyətinin fəaliyyətinin optimallaşdırılmasının nəzəri əsasları**

Dövlət orqanlarının artıq funksiyalarının və səlahiyyətlərinin ləğv edilməsi dövlətin effektivliyinin artırılmasının məlum, aksiom şərtidir. Lakin bu iş birdəfəlik kampaniya olmamalıdır, çünki bu halda gələcəkdə bürokratiyanın optimallaşdırılması üçün zəmanət yaranmayacaq. Daimi işləyən, icra hakimiyyəti orqanlarının optimal tərkibini dəstəkləməyə imkan verən və iqtisadiyyata və cəmiyyət həyatının digər sahələrinə səmərəsiz dövlət müdaxiləsinə mane olan mexanizm tələb olunur.

 

Artıq funksiyaların meydana gəlməsinin qarşısını almaq üçün icra hakimiyyəti orqanlarının əlavə funksiyalarının tətbiq edilməsi zəruriliyinin ictimai təsdiq prosedurunun qanunverici şəkildə təsbiti çox vacibdir. Əgər funksiyanın kifayət qədər hüquqi əsası yoxdursa və eyni zamanda vətəndaşların öz konstitusiya hüquqlarının həyata keçirməsinə mane olursa və ya sahibkarlar üzərinə əlavə vəzifələr qoyursa, o zaman birinci növbədə bu funksiya ləğv edilməlidir. Belə qayda hüquqi-normativ bazada təsbit edilməlidir. Bu dövlətin iqtisadiyyata və ictimai həyata səmərəsiz müdaxiləsini azaltmağa, inzibati sədlərin qarşısının alınmasına biznes xərclərini ixtisar etməyə, vətəndaşların konstitusiya hüquqlarını həyata keçirməsini təmin etməyə, həmçinin dövlət orqanlarının işini cəmiyyət və dövlət üçün zəruri məsələlərin həllinə yönləndrməyə imkan verəcək.

Artıq funksiyaların ləğv edilməsi ilə yanaşı, ictimai məsələləri səmərəli həll etməyə kömək edən yeni funksiyaların tətbiqi prosesi, habelə hüquqi-normativ bazanın dəyişməsini və təşkilat tədbirlərinin keçirilməsini tələb edən zəruri dövlət funksiyalarının modernləşməsi və yerinə yetirilməsinin təkmilləşməsi prosesi gedir (Tikhomirov, 2020).

**Tədqiqat**

İcra hakimiyyəti orqanlarının optmallaşdırılmasının zəruri şərti icra hakimiyyəti orqanlarında dövlət idarəçiliyinin səmərəliliyin artırılmasına əngəl törədən sistemli problem olan korrupsiyanın ləğv edilməsidir (Atamanchuk, 2018).

İcra hakimiyyəti orqanlarının funksiyalarının optimallaşdırılması və icra hakimiyyəti orqanlarının fəaliyyəti sahəsində korrupsiya əleyhinə hərəkət mexanizmlərinin tətbiq edilməsi üzrə vəzifələrin istiqaməti çərçivəsində aşağıdakılar ehtimal edilir:

1) icra hakimiyyətinin orqanlarının zəruri funksiyalarının müəyyən edilməsi, artıq və təkrarlanan funksiyaların ləğv edilməsi prosedurunu tamamlamaq;

2) İcra hakimiyyəti orqanlarının funksiyalarının optimal tərkibinə nəzarət etmək.

L.A.Txabisimova hesab edir ki, icra hakimiyyətinin fəaliyyətinin optimallaşdırılmasının səmərəli nəticələrinə aşağıdakılar vasitəsilə nail olmaq olar:

1. İcra hakimiyyətinin fəaliyyəti üçün xarici əlverişli (qanunla göstərilən sərhədlərdə icra hakimiyyətinin maneəsiz fəaliyyətinə imkan yaradan) şəraitin formalaşdırılması;

2. Xarici nəzarət (bu, hakimiyyət fəaliyyətində problemlərin yaranma ehtimalının olmasını üstün tutan, əvəzedici, qoruyucu element kimi tələb olunur. Onun subyektləri ali hakimiyyətin sahibi (xalq) və daşıyıcısıdır (prezident), yardımçı subyektləri kimi kütləvi informasiya vasitələri və icra hakimiyyətinin fəaliyyətinə nəzarət üzrə ixtisaslaşan xüsusi dövlət orqanları çıxış edirlər);

3. İcra hakimiyyətinin təşkili üzrə xarici fəaliyyət (bu, icraedici qolun özünütəşkiletməsinin effektivliyinin aşağı səviyyəli olduğu vaxt lazım olur, çünki sonuncu kənardan təsirə ehtiyac duyur ki, bu da ali hakimiyyətin daşıyıcısının siyasi iradəsi olur);

4. Daxili əlverişli şərait, özünütəşkiletmə və özünənəzarət (bu triada icra hakimiyyətinin daxilində hakimiyyət münasibətləri sistemini xarakterizə edir, iqtisadi və sosial sahələrdə xidmət edənlərin müdafiəsinin, texniki təminatının, struktur nizama salmanın və tabeliyində olan işçilərin idarə edilməsinin təkmilləşdirilməsi üzrə tədbirlərin görülməsini nəzərdə tutur) ("Yerli icra kakimiyyətləri haqqında" 16 iyun 2012-ci il tarixli əsasnamə, 2021, s. 10-11).

Korrupsiya hərəkətlərinin istisna edilməsi məqsədilə aşağıdakı tədbirlərin keçirilməsi nəzərdə tutulula bilər:

1) yüksək korrupsiya riski olan dövlət orqanlarının fəaliyyət sahələrində xüsusi antikorrupsiya mexanizmlərinin yaradılması;

2) korrupsiyagenliyə dair hüquqi-normativ aktların ekspertizasının tətbiqi;

3) dövlət funksiyalarının korrupsiyagenliyinin qiymətləndirilməsinin metodiki əsaslarının yaradılması;

4) antikorrupsiya hüquqi-normativ aktlar paketinin formalaşdırılması;

5) idarə və regional antikorrupsiya proqramlarının hazırlanması.

Korrupsiyagenliyə dair hüquqi-normativ aktların ekspertizasının tətbiqi üzrə tədbirlər çərçivəsində mövcud normativ aktların və daxil edilən layihələrin ilkin və ixtisaslaşdırılmış ekspertizasının metodikaları təklif edilir, onların ekspertizası aparılmışdır və onun nəticələri əsasında

mövcud hüquqi-normativ aktlara və təklif edilən layihələrə daxil etmək üçün dəyişikliklər hazırlanmışdır (Azərbaycan Respublikasının Konstitusiyası, 2016).

İnzibati islahatın yeni mərhələsində antikorrupsiya siyasəti dövlət xidməti sistemində islahatlar keçirilməsinin prioritet istiqamət kimi ayrılmışdır. Hazırda korrupsiya ilə mübarizə üzrə Milli plan təklif edilmişdir, bu planda antikorrupsiya tədbirləri üç istiqamət üzrə cəmlənir:

1) qanunvericiliyin modernləşdirilməsi;

2) hüquqi maarifləndirmə;

3) dövlət və bələdiyyə qulluqçularının etik məcəlləsinin işlənib hazırlanması. Başlıca tədbirlər arasında – ictimai qulluqçuların gəlirlərinə nəzarət, dövlət və bələdiyyə orqanlarının alqı-satqı müqavilələrinin həyata keçirilməsində aşkarlığın və şəffaflığın təmin edilməsi mühüm yer tutur.

**İcra hakimiyyətinin fəaliyyətinin optimallışdırılmasının xarakterik xüsusiyyətləri.**

Müasir Azərbaycanda icra hakimiyyəti orqanları sistemi qəti olaraq formalaşmış və dondurulmuş deyil. Artıq bir neçə ildir ki, ölkədə keçirilən inzibati islahat icra hakimiyyəti orqanlarının sayının dəyişməsi, onların səlahiyyətlərinin dəyişməsi, bu orqanlar arasında qarşılıqlı əlaqə sisteminin təkmiləşdirilməsi ilə bağlıdır. Eyni zamanda dəyişikliklər çox vaxt onların konstitusiya normalarına uyğun olması nöqteyi-nəzərindən qanunauyğun suallar doğurur. Onlar hüquqi əsaslar tələb edir, üstəlik islahatdan sonra deyil, ondan əvvəl. Bununla əlaqədar olaraq icra hakimiyyəti orqanları sisteminin və strukturunun inkişaf qanunauyğunluqlarına əsaslanaraq, bu sahənin konstitusiya və hüquqi tənzimlənməsinin təkmilləşməsinin əsas tendensiyalarını və istiqamətlərini müəyyən etmək zəruridir.

Azərbaycan Respublikasının Konstitusiyasında icra hakimiyyəti dövlət hakimiyyətinin müstəqil qolu kimi təyin edilmişdir, lakin bununla bərabər dövlət idarəçiliyi sahəsində icra hakimiyyətinin fəaliyyət sahəsi genişləndirilmişdir. Bundan başqa, dövlət hakimiyyəti sahəsindən yerli özünüidarəemə sahəsi ayrılmışdır. Bu icra hakimiyyətinin səlahiyyətlərinin həyata keçirilməsində bir çox çətinliklər doğurmuş və həm normativ, həm də təşkilati planda öz həllini tələb edən kompleks problemlər yaratmışdır. İcra hakimiyyəti sisteminin inkişaf konsepsiyası üçün hakimiyyətin bu qolunun sisteminin başa düşülməsinə aid olan və onun normal fəaliyyət göstərməsinə təsir edən məsələ aktualdır.

Bununla əlaqədar hakimiyyətin bu qolunun legitim əsasının möhkəmləndirilməsi, ona stabilik və məqsədyönlülük vermək məqsədilə bir sıra yeni qanunların, o cümlədən, icra hakimiyyətinin təşkil edilməsinin ümumi prinsipləri haqqında qanunun və icra hakimiyyəti orqanları sistemi haqqında qanunun işlənib hazırlanması və qəbul edilməsi mühüm əhəmiyyət kəsb edərdi. İcra hakimiyyəti orqanlarının təşkilinin və fəaliyyətini qanunvericilik səviyyəsində dəqiqləşdirmək, onların funksiyalarını və qarşılıqlı əlaqə xüsusiyyətlərini, hüquq və vəzifələrini, onların fəaliyyətinin hüquqi formalarını və metodlarını, məsuliyyətin hüdudlarını və formalarını dəqiq müəyyən etmək zəruridir (Bakhrakh, 2021).

İnzibati islahat inkişaf mərhələsindədir və bir sıra əsas anlayışlar konstitusiya hüququ nöqteyi-nəzərindən tam işlənib hazırlanmamışdır. İcra hakimiyyətinin federal orqanlar sisteminin əsas elementlərinin gələcəkdə hüquqi cəhətdən işlənib hazırlanmasında qanunvericiliyin əsas istiqamətləri və inkişaf tendensiyaları meydana çıxır. Dövlət orqanlarının səlahiyyəti yeni qanunvericiliyə uyğun olaraq müəyyən edilməli və kifayət qədər maliyyə, maddi, informasiya, kadr təminatına malik olmalıdır. İnzibati islahatın birinci mərhələsində icra hakimiyyətinin federal orqanlarının funksiyalarının təhlili, qiymətləndirilməsi və nizamlanması üzrə böyük iş tamamlanır.

Şərti olaraq onları hüququ müəyyən edən, tənzimləyici, nəzarət (yoxlama) və operativ və təşkilatçı funksiyalarına ayırmaq olar (Stolyarov, 2019, s. 61). İcra hakimiyyətinin dövlət orqanlar sistemində islahat keçirilməsinin əsas konsepsiyalarından biri müxtəlif orqanlar üzrə normayaradan, yoxlama-nəzarət və təşkilati-təsərrüfat funksiyalarının ayrılmasıdır. İcra hakimiyyətinin dövlət orqanları sisteminin müxtəlif halqalarının səlahiyyət məsələləri, beləliklə, qanun yaradan istiqamətlərindən biridir, bu istiqamət idarələrin "korporativliyi ilə", icra hakimiyyəti orqanlarında vəzifədən sui-istifadə ilə və s. hüquqi səviyyədə mübarizə aparmağa imkan verir.

İdarəetmə orqanlarının səlahiyyətlərinin inkişaf tendensiyaları hansılardır? Bizim fikrimizcə, beynəlxalq əməkdaşlıq sahəsini daxil etməklə yenilərinin yaranması və köhnələrin dəyişməsi

hesabına onların təsir obyektləri dəyişəcəkdir. Səlahiyyətlərin həcmində stimullaşdırıcı və tənzimləyici xassəli vasitələr üstünlük təşkil edəcəkdir. Qərarların, məsuliyyət növlərinin və əsaslarının qəbul edilməsi prosedurları, habelə icra hakimiyyəti orqanlarının öz aralarında, digər struktur və təsərrüfat subyektləri arasında qarşılıqlı təsir mexanizmləri daha qəti müəyyən ediləcəkdir və əlbəttə ki, dövlət idarəetməsinin demokratik elementi və vətəndaşların, ictimai birliklərin və partiyaların iştirak üsulları daha dolğun aydınlaşdırma tələb edir (Tikhomirov, 2014, s. 177).

İcra hakimiyyətinin dövlət orqanlarının sistem və strukturunun hüquqi əsaslarını tənzimləyən qanunverici bazanın inkişafının səciyyəvi xüsusiyyəti inzibati-hüquqi islahatın həyata keçirildiyi miqyasdır. İcra hakimiyyəti sistemində uğurla islahat keçirilməsi üçün korrupsiya ilə mübarizə mühüm əhəmiyyət kəsb edir (Cəfərov, 2010).

Korrupsiya müxtəlif formalarda ola bilər, lakin onun ən təhlükəli növü cəmiyyətin və dövlətin demokratik və hüquqi dayaqlarını sarsıdan siyasi korrupsiyadır. Korrupsiyaya uğramış dövlət hakimiyyəti insan və vətəndaşın hüquqları və azadlığı üçün təhlükə daşıyıcısına çevrilir, əhalinin yoxsulluğunu artırır. Korrupsiya onunla səciyyələnir ki, hüquqla müəyyən edilmiş məqsədlər vəzifəli şəxslərin təmənnalı maraqları ilə əvəz olunur. N. İsakov qeyd edir ki, "vəzifəli şəxslərin korrupsiya ilə məşğul olması sosial normaya çevrilmişdir" (Ronald, Gilmor, Quliyeva, 2015, s. 101).

İcra hakimiyyəti orqanlarının həcminin və xarakterinin dəyişdirilməsi icra orqanlarının funksiyalarının regional səviyyəsində nizamlanmasına səbəb olur. Dövlətin əsas funksiyalarının həyata keçirilməsi sahəsində yaranan ictimai münasibətlərin öyrənilməsi və hüquqi tənzimlənməsi zəruriliyi konstitusiya hüququnun sahələrinin rolunu və əhəmiyyətini qeyd edir.

Mərkəzi icra hakimiyyəti orqanları sistemində islahatlar Azərbaycan Respublikasında icra hakimiyyəti sisteminin birliyinin sarsılmazlığını təmin biləcək bir dövlət mexanizminin və belə hüquqi prosedurların təsdiqlənməsi nəticələrindən birinə malik olmalıdır. Belə görünür ki, ölkədə dövlət hakimiyyətinin həyata keçirilməsinin kifayət qədər olmayan effektivliyinin əsas səbəblərindən biri icra hakimiyyətinin real faktiki birliyinin olmamasıdır.

Belə vəziyyət bir neçə amillə şərtlənir. A.A.Muravyevin fikrincə, onların sırasına bu sahədə nəzəri araşdırmaların zəifliyini, elmi yanaşmaların siyasi praqmatizmlə dəyişməsini, icra hakimiyyəti orqanlarının formalaşmasında sistemliyin olmamasını, onların strukturunu müəyyən edən meyarların anlaşılmazlığını aid etmək olar (Murav'yev, 2017, s. 153).

Ən aktual problemlərdən biri – mərkəzi və regional orqanların münasibətlərinin nizama salması problemidir. Çünki hakimiyyət orqanları qarşısında duran vəzifələr daim təzələnir, hakimiyyətin müxtəlif səviyyələrinin səlahiyyətləri tam siyahıda mümkün deyil.

İcra hakimiyyəti orqanlarının funksiyalarının xeyli sayda olması və onların səmərəsiz həyata keçirilməsi mexanizmləri sahibkarlığın sürətli inkişafına ciddi maneədir və dövlət hakimiyyətinin biznes etimadı sarsıdır (Isakov, 2019).

Bu problemin həlli icra hakimiyyəti orqanlarının funksiyalarının optimallaşdırılması və korrupsiyaya qarşı mübarizənin effektiv mexanizmlərinin formalaşdırılması hesabına sahibkarlıq subyektlərinin iqtisadi fəaliyyətinə dövlət müdaxiləsinin məhdudlaşdırılmasını, həddindən artıq dövlət tənzimləməsinin dayandırılmasını nəzərdə tutur.

Bu istiqamət üzrə inzibati islahatın həyata keçirilməsinin məqsədi, nəzarətin və yoxlamanın həyata keçirilməsi və icra hakimiyyəti orqanlarında korrupsiyaya qarşı mübarizənin xüsusi mexanizmlərinin tətbiqi üzrə funksiyalar da daxil olmaqla, icra hakimiyyəti orqanlarının funksiyalarının optimallaşdırmasıdır (Əsgərov, Nəsirov, İsmayılov, Məmmədov, 2003).

Əsas fəaliyyət icra hakimiyyəti orqanlarının artıq və təkrar edən funksiyalarının çıxarılmasında, hüquq tətbiqedici funksiyaların, dövlət əmlakının idarə olunması və dövlət xidmətlərinin göstərilməsinə nəzarət və yoxlama funksiyalarının təşkilati bölünməsində cəmlənməlidir.

Mərkəzi icra hakimiyyəti orqanlarının zəruri funksiyalarının müəyyənləşdirilməsi və artıq funksiyalarının aradan qaldırılması prosedurunu başa çatdırmaq, yerli icra hakimiyyəti orqanlarında da analoji işlərin aparılması lazımdır.

Bundan başqa, icra hakimiyyəti orqanlarının funksiyalarının optimal tərkibinə daim nəzarət etmək lazımdır. Bu sahədə müvafiq normativ hüquqi aktlar hazırlanmalı və qəbul edilməlidir.

Birinci növbədə, kifayət qədər hüquqi əsası olmayan və vətəndaşların öz konstitusion hüquqlarının həyata keçirilməsinə mane olan, yaxud da sahibkarların üzərinə əlavə vəzifələr qoyan funksiyaların ləğv edilməsini qanunla möhkəmləndirmək lazımdır. Bu, iqtisadiyyata və ictimai həyata dövlətin effektsiz müdaxiləsini azaltmağa, inzibati maneələrin öhdəsindən gəlmək üçün biznes xərclərini azaltmağa, vətəndaşların konstitusiya hüquqlarının həyata keçirilməsini təmin etməyə, dövlət orqanlarının işini cəmiyyət və dövlət üçün zəruri olan vəzifələrin həllində cəmləməyə icazə verəcək.

Mürəkkəb və irimiqyaslı funksiyaların aradan qaldırılması mərhələ-mərhələ həyata keçirilməlidir. Dövlət qulluqçularının sayının azaldılması, onların əlavə təhsili və maliyyə məsələlərinin həlli üzrə təşkilati tədbirlər keçirmək lazımdır.

Artıq funksiyaların ləğv edilməsi ilə yanaşı, ictimai vəzifələri səmərəli həll etməyə kömək edən yeni funksiyaların verilməsi prosesi, həmçinin normativ-hüquqi bazada dəyişikliklər edilməsini və təşkilati tədbirlərin həyata keçirilməsini tələb edən modernləşdirmə və lazımi dövlət funksiyalarının yerinə yetirilməsinin təkmilləşdirilməsi prosesi getməlidir. Eyni zamanda yeni artıq funksiyaların meydana çıxmasının qarşısının alınması üçün əlavə funksiyaların tətbiqi ehtiyacının əsaslandırılması prosedurunu hazırlamaq və qanunvericiliklə təsbit etmək lazımdır.

**İcra hakimiyyətinin fəaliyyətinin optimallaşdırılmasının müasir vəziyyəti**

Azərbaycan Respublikasında işğaldan azad edilmiş rayonların yerli icra hakimiyyəti orqanlarının funksiyalarının optimallaşdırılmasına yönəlmiş normativ hüquqi aktların layihələrini hazırlamaq tələb olunur. Mərkəzi səviyyədə həyata keçirilmiş analoji tədbirləri yerlərdə də həyata keçirmək lazımdır.

İcra hakimiyyəti orqanlarının funksiyalarının optimallaşdırılması üzrə fəaliyyətin mühüm tərkib hissəsi sahibkarlıq fəaliyyətinə dair inzibati məhdudiyyətlərin daha da azaldılmasına yönəlmiş qüvvədə olan nəzarət və yoxlama sisteminin təkmilləşdirilməsidir.

Hal-hazırda natamam şəkildə fəaliyyət göstərən dövlət nəzarət və yoxlama metodları məhsulların təhlükəsizliyinin, istehsal, istismar, saxlama, daşıma, utilizasiya proseslərinin təmin edilməsi vəzifələrinə uyğundur. Tələblər sistemi boldur, şəffaf deyil və ziddiyyətlidir – yoxlama səlahiyyəti nəzarət səlahiyyəti ilə birləşdirilmişdir.

Nəzarət və yoxlama funksiyalarının optimallaşdırılması – dövlətin nəzarət və yoxlama funksiyalarının həyata keçirilməsinin vahid hüquqi sahəsinin yaradılması, icazə prosedurlarının sadələşdirilməsi, lisenziyalaşdırılan fəaliyyət növlərinin azaldılması, Azərbaycan Respublikasının yerli icra hakimiyyəti və yerli özünüidarəetmə orqanlarına nəzarət və yoxlama funksiyalarının bir hissəsinin verilməsi, habelə özünütənzimləmə təşkilatlarının yaradılması üzrə məsələlərin həllini təmin etməlidir.

Nəzarət və yoxlamanın obyektləri və predmetləri, nəzarətin zəruriliyi, dövriliyi, aparılması formaları və növləri müvafiq texniki reqlamentlərlə təyin edilməlidir. Onların qəbul edilməsinə qədər nəzarət orqanları yalnız təhlükəsizlik sahəsində mövcud icbari tələbləri yoxlamaq hüququna malikdirlər ki, onlar da müvafiq normativ hüquqi aktlarda təsbit olunmalıdır. Qüvvədə olan bütün məcburi tələbləri ümumi istifadədə olan informasiya sistemlərində dərc etmək lazımdır, onların əldə edilməsi pulsuz olmalıdır.

Lisenziyalaşdırılan fəaliyyət növlərinin sayını minimuma endirmək təklif olunur, malların, işlərin və xidmətlərin təhlükəsizliyini təmin etmək üçün lisenziya da daxil olmaqla, dövlət nəzarət tədbirlərinin səmərəliliyinin monitorinqi təşkil edilməlidir.

Nəzarət və yoxlama funksiyalarını məhdudlaşdırmaq və bu sahədə qanunvericilik terminologiyasını və digər normativ-hüquqi aktları unifikasiya etmək lazımdır, bu, nəzarəti dövlət orqanlarında cəmləməyə və müəyyən edilmiş qaydada icra hakimiyyəti orqanlarında akkreditə olunmuş bazar subyektləri tərəfindən həyata keçirilən ekspertiza, sınaq və ölçmələrin aparılması üzrə iş kimi baxmağa icazə verəcək. Bunun üçün müvafiq normativ hüquqi aktların qəbulundan sonra mövcud nəzarət orqanlarından laboratoriya, tədqiqat və sınaq mərkəzlərini ayırmaq, dövlət qulluqçularının sayının azaltmaq lazımdır.

İnzibati islahatlar çərçivəsində mərkəzi icra hakimiyyəti orqanlarının, yerli icra hakimiyyəti orqanlarının və yerli özünüidarəetmə orqanlarının nəzarət və yoxlama sahəsində səlahiyyətlərinə

dəqiq hədd qoymaq lazımdır. Məzmunca analoji tədbirlərin həyata keçirilməsinə yol verilməməsi məqsədi ilə bir obyektə münasibətdə hakimiyyətin müxtəlif səviyyəli nəzarət və yoxlama orqanları ilə eyni zamanda dövlət nəzarətinin və yoxlamasının aparılmasına qadağa nəzərdə tutmaq lazımdır.

Sahibkarlıq fəaliyyətində yoxlamaların aparılması məsələləri üzrə, onun fəaliyyət sahəsindən istisnaların sayının azaldılması üçün mövcud qanunvericiliyə yenidən baxılması tələb olunur.

Normativ hüquqi aktlarda nəzarət orqanlarının kollegial idarəetmə prinsipləri, onların hərəkət və qərarlarından məhkəməyədək şikayətin səmərəli mexanizmləri təsbit edilməlidir.

İcra hakimiyyəti orqanlarının funksiyalarının optimallaşdırılmasının digər bir tərkib hissəsi autsorsinqin – müsabiqə əsasında xarici icraçılarla müqavilələrin bağlanması yolu ilə icra hakimiyyəti orqanlarının səlahiyyətləri çərçivəsindən müəyyən fəaliyyət növlərinin çıxardılması mexanizminin hazırlanması və geniş tətbiqinin təmin edilməsidir.

Yeni informasiya texnologiyalarının tətbiqi, dövlət orqanlarının binalarının və qurğularının idarəsi, kadrların seçiminin təşkili, rabitə, maliyyə uçotu xidmətlərinin göstərilməsinin təmin edilməsi kimi inzibati-idarəetmə proseslərinin səmərəliliyinin artırılmasına autsorsinq təcrübəsinin yoxluğu mane olur.

Dünya təcrübəsi göstərir ki, autsorsinq inzibati-idarəetmə proseslərinin həyata keçirilməsinin səmərəliliyini artırmağa, fəaliyyət xərclərinə daha effektiv nəzarət etməyə, icra hakimiyyəti orqanlarının diqqətini əsas fəaliyyətdə fokuslamağa, xidmətin keyfiyyətini artırmağa, yeni texnologiyalardan istifadəni təmin etməyə, kapital xərclərini azaltmağa, inzibati və idarəetmə personalının sayını azaltmağa (bu, büdcə vəsaitlərinin qənaətinə gətirib çıxaracaq) imkan verir Nağıyev, 2014, s. 33).

İcra hakimiyyəti orqanları onlar tərəfindən bir sıra funksiyaların yerinə yetirilməsi üçün bütün xərclərin tam uçotunu aparmalı, bu xərcləri həmin funksiyaların autsorsinqi zamanı çəkilən xərclərlə müqayisə etməli, onların yerinə yetirilməsinin davam etdirilməsinin məqsədəuyğunluğunu müəyyən etməlidirlər.

Bu istiqamət çərçivəsində autsorsinqə aid olan inzibati və idarəetmə proseslərinin üzə çıxardılmasının meyarlarının hazırlanması, autsorsinqə aid olmayan funksiyaların siyahısının və fəaliyyət növlərinin yaradılması, struktur bölmələr tərəfindən funksiyaların icrasının daxili təminatı üçün xərclərin uçotunun kompleks şəffaf sisteminin hazırlanması və tətbiqi, autsorsinqin keçirilməsinin tipik prosedurlarının və texnologiyalarının hazırlaması, autsorsinqin səmərəliliyinə nəzarət və müqavilə şərtlərinin yerinə yetirilməsinin monitorinqi mexanizmlərinin və prosedurlarının hazırlanması, dövlət orqanlarının autsorsinq keçirməsini stimullaşdıran mexanizmlərinin hazırlanması və həyata keçirilməsi üzrə vəzifələr müəyyən olunmalıdır (Tkhabisimova, 2019).

İcra hakimiyyəti orqanlarının funksiyalarının optimallaşdırılması məqsədilə dövlət ehtiyacları üçün satınalmalar sisteminin səmərəliliyinin artırılmasına yönəldilmiş tədbirlər kompleksi həyata keçirmək lazımdır.

Dövlət ehtiyacları üçün satınalınmaların qüvvədə olan sistemi az effektiv olaraq qalır. Müsabiqə mexanizmlərinin istifadəsi manipulyasiyaların yüksək səviyyəsinə icazə verir, səmərəli rəqabətə maneə törədir.

Büdcə prosesi bu məqsədlər üçün maliyyə xərclərinin və müvafiq satınalmaların həcminin iqtisadi əsaslandırılmasının təsirli sistemini özünə daxil etmir. Satınalmaların təmin edilməsi üçün lazımi maliyyə resurslarına tələbat makroiqtisadi göstəricilər nəzərə alınmaqla, sifarişçilərin təklifləri əsasında formalaşır. Lakin xərclərin "əldə olandan" prinsipi üzrə əsaslandırılmasının belə ənənəvi konsepsiyası dövlətin funksiyalarının həyata keçirilməsi üçün lazım olan mallara (işlərə, xidmətlərə) dövlətin real tələbatını qiymətləndirməyə imkan vermir. Bununla əlaqədar, ilk növbədə, mərkəzi büdcənin müvafiq xərclərinin proqnozlaşdırılması və perspektiv planlaşdırması məqsədi ilə malların (işlərin, xidmətlərin) dövlət ehtiyacları üçün alınması xərclərinin əsaslandırılması sisteminin yaradılması üzrə vəzifələri həll etmək lazımdır (Ronald, Azadov, 2015, s. 45).

Dövlət satınalmalarının səmərəliliyinin artırılmasının ən mühüm istiqamətlərindən biri hər bir satınalmanın açıqlığına və aşkarlığına riayət etmək üçün satınalmalar sahəsində qanunvericiliyə əməl edilməsinə səmərəli nəzarət sisteminin formalaşdırılması, bütün dövlət müqavilələrinin reyestrinin açıq və əlçatan aparılması, dövlət sifarişlərinin yerləşdirilməsi prosesində avtomatlaşdırma

vasitələrinin tətbiqinin genişləndirilməsi, dövlət ehtiyacları üçün satınalmaların sərt tənzimləmə prosedurlarının yaradılmasıdır. Bu tədbirlərin həyata keçirilməsi büdcə vəsaitlərinin səmərəsiz xərclənməsinə, çatdırılma müddətinin pozulması və satınalma prosedurlarına əməl olunmamasına görə vəzifəli şəxslərin məsuliyyətinin artırılması olmadan səmərəli olmayacaq.

İcra hakimiyyəti orqanlarının funksiyalarının optimallaşdırmasının vacib şərti dövlət idarəçiliyinin səmərəliliyinin artırılmasına əngəl törədən ən mühüm problem olan mərkəzi və yerli icra hakimiyyəti orqanlarında korrupsiyanın aradan qaldırılmasıdır.

Dövlət orqanlarının və vəzifəli şəxslərin rüşvətxorluğu dövlət idarəetməsinin inkişafına mane olur, biznes və əhali tərəfindən böyük əlavə xərclərə səbəb olur. Korrupsiyaya qarşı mübarizənin hüquqi, təşkilati və digər mexanizmlərinin hazırlanması və tətbiqi, icra hakimiyyəti orqanlarının fəaliyyətində şəffaflığın artırılması inzibati islahatların keçirilməsinin zəruri elementləridir.

Eyni zamanda bir sıra icra hakimiyyəti orqanlarında korrupsiya üçün əlavə şərait yaranır. İcra hakimiyyəti orqanlarının qrupunda korrupsiya riski yüksək olan şəxslər var ki, onlar üçün səciyyəvidir:

1) böyük maliyyə vəsaitlərinin bölgüsü ilə bağlı səlahiyyətlərinin olması;
2) onların iş spesifikasının yaratdığı yüksək dərəcədə hərəkət sərbəstliyi;
3) vətəndaşlar və təşkilatlarla əlaqələrin yüksək intensivliyi (Yevseyev, Yalbulganov, 2015).

Bununla bağlı korrupsiya riski yüksək olan dövlət orqanlarının fəaliyyəti sahəsində xüsusi antikorrupsiya mexanizmlərini yaratmaq, korrupsiyanın qarşısının alınmasına dair normativ hüquqi aktların və onların layihələrinin ekspertizalarını tətbiq etmək, dövlət funksiyalarının potensial korrupsiyalılığının qiymətləndiril-məsinin metodiki əsaslarını yaratmaq, normativ-hüquqi aktların antikorrupsiya paketini hazırlamaq, mərkəzi və regional antikorrupsiya proqramını hazırlamaq lazımdır.

Beynəlxalq təcrübə korrupsiya imkanlarını məhdudlaşdıran əlavə mexanizmlərin tətbiqinin məqsədəuyğunluğunu göstərir. Onların arasında ən çox yayılmış bunlardır:

1) vətəndaşlar və təşkilatlarla dövlət xidmətçilərinin qarşılıqlı əlaqəsinin maksimal mümkün olan depersonalizasiyası (xüsusilə "bir pəncərə" sisteminin və elektron informasiya mübadiləsi sisteminin tətbiqi yolu ilə);

2) tənzimləmə subyektləri ilə (dövlət xidmətlərinin istehlakçıları) qarşılıqlı fəaliyyət prosedurlarının müfəssəl nizama salınması;

3) qarşılıqlı nəzarəti təmin etmək üçün vəzifəli şəxslərin bir-birindən asılılığının təsbiti mərhələsində inzibati-idarəetmə prosedurlarının bölünməsi;

4) vəzifəli şəxslərin rotasiyası.

## Nəticə

Korrupsiyanın qarşısının alınmasına yönəlmiş normativ-hüquqi aktların ekspertizasının tətbiqi üzrə tədbirlər çərçivəsində mövcud normativ-hüquqi aktların və təqdim edilmiş layihələrin ekspertizasının ilkin və ixtisaslaşdırılmış metodikası hazırlanmalıdır, onların ekspertizası keçirilməlidir və onun nəticələri əsasında normativ-hüquqi aktlara və təqdim edilmiş layihələrə daxil edilməsi üçün dəyişikliklər hazırlanmalıdır. Korrupsiyaya qarşı normativ-hüquqi aktların paketi özündə həmçinin cinayət qanunvericiliyinə dəyişikliklər edilməsi barədə, habelə beynəlxalq antikorrupsiya konvensiyalarının ratifikasiyası haqqında aktları daxil etməlidir.

## Ədəbiyyat

1. Atamanchuk, G. V. (2018). *Sushchnost' gosudarstvennoy sluzhby*. RAGS.
2. Azərbaycan Respublikasının Konstitusiyası. (2016). *Qanun*.
3. Bakhrakh, D. N. (2021). *Administrativnoye pravo. Uchebnik* (s. 68). BEK.
4. Cəfərov, İ. M. (2010). *Azərbaycan Respublikası Konstitusiyasının şərhi*. Hüquq ədəbiyyatı.
5. Əsgərov, Z., Nəsirov, E., İsmayılov, M., & Məmmədov, X. (2003). *Azərbaycanın dövlət və hüququnun əsasları*. QAPP-POLİQRAF.
6. Isakov, N. (2019). Pravovaya politika v sfere bor'by s korruptsiyey. *Pravo i zhizn', (56).*

7. Yerli icra hakimiyyətləri haqqında əsasnamə. (2021). *16 iyun 2012-ci il tarixli əsasnamə*. Bakı: Qanun nəşriyyatı.
8. Murav'yev, A. A. (2017). *Razvitiye sistemy regional'nogo upravleniya Rossiyskim federativnym gosudarstvom* (s. 153). M.
9. Nağıyev, F. T. (2014). *Konstitusiya hüququ (mühazirə mətnləri)*. Bakı: Qanun.
10. Ronald, Y., & Azadov, E. (2015). *Dövlət idarəetməsində islahatlar: nailiyyətlər, problemlər, perspektivlər*.
11. Ronald, Y., Gilmor, A., & Quliyeva, G. (2015). *Azərbaycanda kadrların idarə edilməsinə müasir yanaşma*.
12. Stolyarov, M. V. (2019). *Kompetentsiya vlasti: Razgranicheniye predmetov vedeniya i polnomochiy mezhdu Federatsiyey i yeye sub"yektami v usloviyakh reformirovaniya: Ucheb. Pos.* (s. 33). M.
13. Tikhomirov, YU. A. (2014). *Administrativnaya reforma i pravovoye obespecheniye gosudarstvennogo upravleniya. Administrativnoye i administrativno-protsessual'noye pravo. Aktual'nyye problemy*. YUNITI-DANA, Zakon i pravo.
14. Tikhomirov, YU. A. (2020). *Teoriya kompetentsii*.
15. Tkhabisimova, L. A. (2019). *Politiko-pravovyye tekhnologii optimizatsii deyatel'nosti institutov ispolnitel'noy vlasti: Nauchnoye izdaniye. Ser. Politiko-pravovyye instituty i natsional'nyye protsessy* (s. 10–11). Rostov n/D.
16. Yevseyev, P. I., & Yalbulganov, A. A. (2015). Problemy pravovogo regulirovaniya polnomochiy sub"yektov RF v sfere byudzhetnykh otnosheniy. *Zhurnal rossiyskogo prava*, *(2)*, 45.

Daxil oldu: 22.02.2025
Qəbul edildi: 01.05.2025

DOI: https://doi.org/10.36719/2663-4619/115/156-158

**Suray Ömərova**
Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universiteti
magistrant
https://orcid.org/ 0009-0001-7735-9041
surayomrova@gmail.com

# Müstəqillik dövründən sonra Azərbaycan teatrında mövcud olan tendensiyalar

**Xülasə**

Müstəqillik dövründən sonra Azərbaycan teatrında fərqli üslublar ortaya çıxmağa başlayır. Xüsusilə də, Sovet dövründən sonra milli irsə, milli pyeslərə yenidən müraciətlər olunur. Həmçinin dünya teatrında gedən proseslər, yaranan yeni teatr istiqamətləri Azərbaycan teatrına təsir etməyə başlayır. Sözügedən zaman çərçivəsində novator rejissorlar bu prosesdə yaxından iştirakı ilə seçilib. Həmin dövrdən etibarən Azərbaycan teatrında Hüseynağa Atakişiyevin, Vaqif İbrahimoğlunun, Azər Paşa Nemətovun, Cənnət Səlimovanın, Mehriban Ələkbərzadənin, Bəhram Osmanovun, Bəxtiyat Xanızadənin yaradıcı fəaliyyəti xüsusi əhəmiyyət kəsb edir. Adlarını qeyd etdiyimiz rejissorlarımız sənətdə hər zaman peşəkar fəaliyyətləri ilə seçilib. Hətta onların bir qismi fəaliyyətləri nəticəsində Azərbaycanda yeni üslublu teatrlar yaratmışdılar. Bu teatrlardan Bakı Kamera Teatrının, YUĞ Teatrının, Pantomima Teatrının adlarını qeyd edə bilərik. Teatr tariximizə nəzər yetirdikdə görürük ki, bu teatrlardan bir qismi təəssüflər olsun ki, öz fəaliyyətini başa vurub. Lakin onlar arasından bəziləri isə bu gün də fəaliyyətini davam etdirir və teatr mədəniyyətimizdə önəmli yer tutur. Bu baxımdan teatr tariximizdə Müstəqillik dövründən sonrakı mərhələ önəmli rola malikdir.

***Açar sözlər:*** *Azərbaycan teatrı, rejissor, teatr tarixi, Müstəqillik dövrü, Sovet dövrü, teatr mədəniyyəti*

**Suray Omarova**
Azerbaijan State University of Culture and Arts
Master student
https://orcid.org/ 0009-0001-7735-9041
surayomrova@gmail.com

# Trends in Azerbaijani Theatre After the Independence Period

**Abstract**

After the independence period, different styles began to emerge in Azerbaijani theatre. Especially after the soviet era, there has been a renewed interest in national heritage and national plays. The processes taking place in the world of theatre and the emergence of new theatrical directions are also beginning to influence Azerbaijani theatre. During the mentioned time frame, innovative directors stood out for their close involvement in the process. Since that period, the creative activity of Huseynaga Atakishiyev, Vagif Ibrahimoghlu, Azer Pasha Nematov, Jannat Salimova, Mehriban Alekbarzadeh, Bahram Osmanov, Bakhtiyar Khanizadeh has held special significance in Azerbaijani theatre. The directors we have mentioned have always stood out in art for their professional work. Some of them had even established new-style theaters in Azerbaijan as a result of their activities. Among these theaters, we can mention the Baku Chamber Theater, the YUGH Theater, the Pantomime Theater. When we look at the history of our theater, we see that, unfortnately, some of these theaters have ceased their activities. However, some of them are still active today and hold an important place in our theatre culture. In this regard, the post-Independence period holds an important role in the history of our theatre.

***Keywords:*** *Azerbaijani theatre, director, history of theatre, period of Independence, soviet period, theatre culture*

## Giriş

Müstəqillik dövründən etibarən yaradıcı gənc rejissorlar fəaliyyətlərində avanqard üsluba müraciət edirlər. Çünki keçən əsrin sonlarından etibarən dünya teatrında avard üslub tendensiyası hökm sürürdü. Bu dövrdə yenilikçi gənc rejissorların diqqətini studiyaçılıq hərəkatı da cəlb edirdi. Onlar studiyaçılıq hərəkatında yayılmış yeni ifadə üsullarını milli teatrımıza tətbiq etmək istəyirdilər. Bunlarla birgə qeyd edə bilərik ki, Rusiyadakı teatrlarda gedən proseslər də teatrımıza təsir edirdi. Çünki teatrımız rus teatrı ilə sıx şəkildə əməkdaşlıq edirdi (Məmmədli, 1999; Əlizadə, 2008). Bu dövrdə peşəkar teatr rejissorlarımız özünəməxsus teatr konseptlərini müəyyənləşdirməklə teatr mədəniyyətimizdə zəngin ənənə formalaşdırmağı bacarmışdılar. Sonrakı mərhələdə gənc rejissorlar nəsli sözügedən ənənə əsasında yetişmiş və müasir teatrımızın rejissurasında önəmli rol oynamışdılar (Rəhimli, 2005).

**Tədqiqat**

Azərbaycan teatrının novator rejissorlarından olan Vaqif İbrahimoğlu ötən əsrin 80-ci illərinin sonu 90-ci illərinin əvvəllərində yaradıcı fəaliyyətində milli irsə müraciəti ilə seçilir. O, bu dövrdə "Salam", "Oğul", "Xatun" kimi tamaşalara quruluş vermişdi. Sadalanan tamaşalardan 1990-cı ildə hazırlanmış "Oğul" və 1992-ci ildə hazırlanmış "Xatun" tamaşalarını rejissor "Kitabi-Dədə Qorqud" dastanı əsasında hazırlamışdır. Bundan əlavə V.İbrahimoğlu 1989-cu ildə özünün Həsən Turabovla birlikdə yaratdığı YUĞ Teatrında şeirlər, qəzəllər, poemalar əsasında tamaşalara quruluş verirdi (Rəhimli, 2004). Rejissor Füzulidən "Dad", "Leyli demə", V.Odərdən "Ən gülməli ölü", M.Şəhriyardan "Salam", Xətaidən "Dəhnamə", Ramiz Rövşəndən "Gəl gedək" kimi tamaşaları müxtəlif vaxtlarda səhnələşdirmişdi. YUĞ Teatrında həmin dövrdə postmodernizm tendensiyası hökm sürürdü. Sonrakı dövrlərdə bu teatrda gənc rejissorlar tərəfindən hazırlanmış tamaşalarda postdramatik teatr elementlərinə rast gəlmək olur (Rəhimli, 2010; Rüstəmov, 2016).

Hüseynağa Atakişiyev yaradıcı fəaliyyətində epik teatr konsepsiyasından bəhrələnir. Onun xüsusilə M.F.Axundzadənin pyesləri əsasında hazırlamış olduğu tamaşalarda bu məqam özünü göstərir. Rejissorun yaradıcılığında milli folklor ənənələri yeni konsept çərçivəsində teatr mədəniyyətimizə təqdim edilir (Rüstəmov, 2016). H.Atakişiyev yaradıcı fəaliyyəti dövründə Avropa dramaturgiyasının qiymətli əsərlərinə də yaddaqalan quruluşlar vermişdir. Onun "Xırs Quldurbasan", "Hacı Qara" (M.F.Axundzadə), "Knyaz" (H.Cavid), "Aydın" (C.Cabbarlı), "Əks-səda" (N.Xəzri), "Romeo və Cülyetta", "Kral Lir" (U.Şekspir) və digər pyeslər əsasında hazırlamış olduğu tamaşalar maraqlı quruluşları ilə seçilmişdir (Rəhimli, 2004; Talıbzadə, 2015).

Azər Paşa Nemət də öz uğurlu və məhsuldar yaradıcılığı ilə milli rejissuramızda önəmli rol oynayıb. Onu Azərbaycan teatr avanqardının əsas nümayəndələrindən biri hesab etmək olar. Gənc Tamaşaçılar Teatrında, Akademik Milli Dram Teatrında hazırlamış olduğu tamaşalarda da bu tendensiya aydın müşahidə olunur (Əlizadə, 1998; Talıbzadə, 2009).

Rejissor Cənnət Səlimova müstəqillik dövründən sonra yaratmış olduğu Bakı Kamera Teatrına öz tələbələrini, istedadlı aktyor və rejissorları cəlb edir. Onun yaratmış olduğu Bakı Kamera Teatrı öz üslubuna, istiqamətinə görə teatr mədəniyyətimizdə seçilirdi. C.Səlimovanın quruluş verdiyi və Bakı Kamera Teatrında səhnələşdirdiyi "Ruh", "Məkkəyə gedən yol" kimi tamaşaları məhz həmin dövrün məhsulu idi (Dadaşov, 2015).

Müstəqillik dövründən sonra teatr rejissuramızın əsas simalarından olan Bəhram Osmanovun yaradıcılığında realizm prinsipləri özünü göstərir. Xüsusilə də bu onun Gənc Tamaşaçılar Teatrında və Akademik Milli Dram Teatrında quruluş verdiyi tamaşalarda müşahidə edilir. Rejissorun 2018-ci ildə Migel de Servantesin "Lamançlı Don Kixot" romanı əsasında quruluş verdiyi və səhnələşdirdiyi "Don Kixot" tamaşası xüsususilə seçilir. O, bu tamaşasında hadisələrin bəzilərini müasir dövrdə təqdim edir. Tamaşada Don Kixot rolunda Qurban İsmayılov, Sanço-Pansa rolunda isə Şövqi Hüseynov çıxış edir (Rəhimli, 2018).

Teatr tariximizdə avanqard teatr estetikası çərçivəsində tamaşalar hazırlamış rejissorlardan biri də Mehriban Ələkbərzadədir. Rejissorun teatr tariximizdə yaddaqalan tamaşalarından "Sənsiz", "Dəfn edilməmiş ölülər", "Poçt şöbəsində xəyal", "Herostratı unudun", "Müəmmalı bir qətlin üç versiyası",

"Cəza", "İsgəndərə yeni namə", "Mənəm…mən", "Nuri-Didə Ceyhun" və digərlərinin adlarını qeyd etmək olar.

Azərbaycanda ilk dəfə Pantomima teatrının yaradıcısı Bəxtiyar Xanızadənin absurd dramaturgiyanın önəmli nümayəndələrində hesab edilən S.Bekketin "Bir aktyor üçün him-cim oyunu" əsəri əsasında hazırlamış olduğu "Ümid" tamaşası teatr tariximizdə ilk sözsüz tamaşa idi (Talıbzadə, 2009). Özünün müəllifi olduğu "Samurayın ölümü", "Zibillik pərvanələri", "Eşq", "Bayraqdarlar", "Nağaraçılar" pantomima teatrı üslubunda yazılmış fərqli, bənzərsiz əsərlərdir (Vəliyev, 2009). Müasir dövrdə də özünəməxsus seyrçi auditoriyası olan Pantomima Teatrındakı tamaşalarda modern teatr ünsürləri də müşahidə edilir. Pantomima Teatrının yaranması Müstəqillik dövründən sonra Azərbaycan teatr tarixində önəmli rola malikdir.

## Nəticə

Dünya teatrlarında yaranan, hökm sürən yeni teatr istiqamətləri, tendensiyalar Müstəqillik dövründən sonra Azərbaycan teatrına da təsir edir və müxtəlif üslublu teatrların yaranmasına səbəb olur. Yaranan yeni üslublu teatrlarda gənc aktyor və rejissorlar nəsli yetişir. Bu dövrdə Azərbaycan teatr rejissurasında müxtəlif sənət təfəkkürünə, fərqli üslublara malik rejissorlar öz yeni ruhlu düşüncələri, fəaliyyətləri ilə teatr mədəniyyətimizə töhfə verirdilər. Teatr tariximizə nəzər salsaq görərik ki, müstəqillik dövründən sonrakı mərhələdə Azərbaycan Teatrında modern teatr prinsipləri, postdramatik teatr tendensiyası ortaya çıxır.

## Ədəbiyyat

1. Dadaşov, A. Ə. (2015). *Rejissor Cənnət Səlimova: Dərs vəsaiti*. İnkişaf Şirkəti.
2. Əlizadə, M. (1998). *Teatr: Seyr və sehr… (Milli teatr prosesi problemləri)*. Elm Nəşriyyatı.
3. Əlizadə, M. (2008). *Dördüncü ölçünün rəngləri*. El Nəşriyyatı.
4. Məmmədli, Y. Ə. (1999). *Rejissorlarla üz-üzə…* Araz Nəşriyyatı.
5. Rəhimli, İ. (2004). *Azərbaycan teatrının estetik prinsipləri*. Çaşıoğlu.
6. Rəhimli, İ. (2005). *Azərbaycan teatr tarixi*. Çaşıoğlu.
7. Rəhimli, İ. (2010). *Zaman zaman içində*. Kitab Aləmi.
8. Rəhimli, İ. (2018). *Səhnə fədailəri* (Cild 3). Şərq-Qərb.
9. Rüstəmov, Q. E. (2016). *Gələcəyin tarixi: Esse*. Mürtəcim.
10. Talıbzadə, A. (2009). *Mehdi müəmması və ya sənətdə konseptual hamletizm*. Elm və Təhsil.
11. Talıbzadə, A. (2015). *Teatral freskalar*. Elm və Təhsil.
12. Vəliyev, Ə. (2009). *Əqidə, ruh və teatr*. Stil Matbaacılıq.

Daxil oldu: 24.01.2025
Qəbul edildi: 03.03.2025

DOI: https://doi.org/10.36719/2663-4619/115/159-163

**Naz Budaqova**
Bakı Slavyan Universiteti
magistrant
https://orcid.org/0009-0000-8257-0709
naz.budagova19@gmail.com

# Alman dili dərslərində bədii mətnlərin istifadəsi

## Xülasə

Son illərdə alman dilinin xarici dil kimi tədrisində ədəbi mətnlərin rolu artmışdır. Əvvəllər praqmatik mətnlər üstünlük təşkil edirdisə, bu gün ədəbi mətnlər dil, mədəniyyət və idrak baxımından verdiyi üstünlüklərə görə daha tez-tez istifadə olunur. Ədəbi mətnlər zəngin və orijinal dil təqdim edir, lüğət ehtiyatını genişləndirir, idiomatik ifadələr və üslub vasitələri ilə tanış edir. Bundan əlavə, onlar emosional və sosial mövzulara toxunaraq interkultural kompetensiyanı inkişaf etdirir və tələbələri fəal düşünməyə təşviq edir.

Müasir metodlar ədəbi mətnləri interaktiv və yaradıcı şəkildə dərs prosesinə inteqrasiya edir. Kommunikativ və tapşırıq əsaslı yanaşmalar, həmçinin rəqəmsal və multimedia alətləri dərsləri daha maraqlı və səmərəli edir. Lakin mətnlərin mürəkkəbliyi və tələbələrin motivasiyası kimi çətinliklər qalmaqdadır.

Sadələşdirilmiş mətnlər, fərdiləşdirilmiş yanaşmalar və aktual mövzuların seçilməsi bu çətinliklərin öhdəsindən gəlməyə kömək edə bilər.

Ümumilikdə, ədəbi mətnlər müasir xarici dil tədrisində dəyərli bir vasitədir.

Onlar təkcə dil öyrənməni asanlaşdırmır, həm də mədəni və idraki bacarıqları inkişaf etdirir, dərsləri daha interaktiv və motivasiyaedici edir.

***Açar sözlər:*** *bədii mətnlər, xarici dil tədrisi, mədəniyyətlərarası səriştə, kommunikativ metodlar, rəqəmsal tədris vasitələri, linqvistik bacarıqlar*

**Naz Budagova**
Baku Slavic University
Master student
https://orcid.org/0009-0000-8257-0709
naz.budagova19@gmail.com

# The Use of Literary Texts in German Language Lessons

## Abstract

In recent years, the role of literary texts in teaching German as a foreign language has increased. While pragmatic texts were previously dominant, today literary texts are used more frequently due to their linguistic, cultural, and cognitive advantages. Literary texts present a rich and authentic language, expanding vocabulary and introducing idiomatic expressions and stylistic devices. Additionally, they address emotional and social topics, fostering intercultural competence and encouraging learners to think actively.

Modern methods integrate literary texts into teaching in an interactive and creative way. Communicative and task-based approaches, as well as digital and multimedia tools, make lessons more engaging and effective. However, challenges such as text complexity and student motivation remain. Simplified texts, individualized approaches, and the selection of relevant topics can help overcome these difficulties.

Overall, literary texts are a valuable tool in modern foreign language teaching.

They do not only facilitate language learning but also develop cultural and cognitive skills, making lessons more interactive and motivating.

***Keywords:*** *literary texts, foreign language teaching, intercultural competence, communicative methods, digital teaching tools, linguistic skills*

## Giriş

Alman dilinin xarici dil kimi tədrisində bədii mətnlərdən istifadə son illərdə getdikcə daha çox əhəmiyyət kəsb edir. Əvvəllər praqmatik mətnlər və ya dərslik dialoqları tez-tez diqqət mərkəzində olduğu halda, bu gün çoxsaylı dil, mədəni və koqnitiv üstünlüklər təklif etdiyi üçün orijinal, bədii mətnlərə diqqət artır.

Qloballaşan dünyada xarici dil bilikləri təkcə kommunikativ bacarıq deyil, həm də fərdin mədəniyyətlərarası anlayışını və dünyagörüşünü genişləndirən əsas vasitə kimi çıxış edir. Bu kontekstdə dilin tədrisində istifadə olunan metod və materialların seçimi xüsusi əhəmiyyət kəsb edir. Ənənəvi dərsliklər və struktur yönümlü yanaşmalar illərdir dil tədrisinin əsasını təşkil etsə də, müasir dövrdə daha interaktiv, yaradıcı və mədəni yüklü mənbələrə olan ehtiyac artmaqdadır. Belə mənbələrdən biri də bədii mətnlərdir (Aliyeva, 2019).

Bədii ədəbiyyat zəngin dil ehtiyatı, ifadə vasitələri və mədəni dəyərlərin daşıyıcısı olmaqla yanaşı, dil öyrənmə prosesini həm şagirdlər, həm də müəllimlər üçün daha maraqlı və mənalı edir. Bədii mətnlər vasitəsilə tələbələr təkcə linqvistik bilikləri deyil, həm də sosial, emosional və mədəni aspektləri mənimsəyir, bu isə dil öyrənməni daha çoxşaxəli və effektiv edir.

Bu yazıda bədii mətnlərin xarici dil tədrisində rolu və əhəmiyyəti araşdırılır, müasir metod və yanaşmalar çərçivəsində onların istifadəsinin tədrisə necə töhfə verdiyi təhlil olunur. Məqsəd ondan ibarətdir ki, bu yanaşmaların tələbələrin motivasiyasına, dil bacarıqlarının inkişafına və mədəniyyətlərarası səriştənin formalaşmasına necə təsir etdiyini aydınlaşdırmaqla, müasir alman dili dərslərində bədii mətnlərin istifadəsinin imkanlarını və çətinliklərini kompleks şəkildə təqdim edək.

**Tədqiqat**

Bədii mətnlərlə işləməyin əsas üstünlüyü ondan ibarətdir ki, onların zəngin və orijinal dili var. Şagirdlər standartlaşdırılmış dərslik mətnlərində tez-tez rast gəlinməyən müxtəlif üslub səviyyələri, idiomatik ifadələr və yaradıcı ifadə formaları ilə qarşılaşırlar. Bu, təkcə lüğətin mənimsənilməsini deyil, həm də dil həssaslığını və nüansları tanımaq qabiliyyətini artırır. Bundan əlavə, ədəbi mətnlər öyrənənlərə dillə daha dərin səviyyədə əlaqə yaratmağa imkan verən emosional, sosial və mədəni mövzulara müraciət etməklə düşüncəni təşviq edir (Collie, Slater, 1990).

Digər mühüm aspekt mədəniyyətlərarası səriştənin təşviqidir. Ədəbiyyat cəmiyyətin güzgüsüdür və öyrənənlərə müxtəlif perspektivlər, tarixi inkişaflar və mədəni dəyərlərlə əlaqə yaratmağa imkan verir. Bu, xüsusən miqrasiya, şəxsiyyət və ya rəqəmsallaşma kimi aktual sosial problemlərlə məşğul olan müasir ədəbiyyat üçün doğrudur. Öz mədəniyyətini müqayisə etmək və həyatın müxtəlif reallıqları üzərində düşünmək insanın dünyagörüşünü genişləndirir və xarici dilin öyrənilməsini interaktiv və əks etdirən prosesə çevirir (Quliyeva, 2024, s. 2).

Müasir didaktik metodlar bədii mətnlərdən təkcə dili öyrətmək üçün deyil, həm də yaradıcılıq və kommunikativ tapşırıqların yerinə yetirilməsi üçün əsas kimi istifadə edir. Məsələn, hekayələrdən səhnələr canlandırıla bilər, alternativ sonluqlar yazıla bilər və ya öz mətnləriniz müəllif üslubunda yazıla bilər. Podkastlar, bloqlar və ya interaktiv oxu layihələri kimi rəqəmsal mediadan istifadə etməklə ədəbiyyatla işləmək daha müxtəlif və əlçatan edilə bilər.

Çoxlu üstünlüklərə baxmayaraq, ədəbi mətnlərin xarici dil tədrisinə inteqrasiyasında çətinliklər var. Ümumi problem dilin mürəkkəbliyidir ki, bu da aşağı səviyyələrdə öyrənənlər üçün maneə ola bilər. Sadələşdirilmiş versiyalar və ya hədəflənmiş qabaqcıl relyef girişi asanlaşdırmağa kömək edə bilər. Motivasiya və məşğulluğu təşviq etmək üçün öyrənənlərin maraqlarına və dil səviyyəsinə uyğun mətnləri seçmək də vacibdir (Ji-Young, 2010).

Bədii mətnlər müasir xarici dil tədrisinin mühüm tərkib hissəsidir. Onlar təkcə linqvistik problemlər deyil, həm də mədəni və koqnitiv öyrənmə imkanları təklif edir. Müasir metodlardan istifadə etməklə bədii mətnlərlə dərslər daha dinamik, interaktiv və öyrənmə üçün əlverişli olur.

Bədii mətnlər xarici dilin tədrisində dəyərli vasitədir, çünki onlar təkcə linqvistik bacarıqları inkişaf etdirmir, həm də mədəni, idrak və sosial öyrənmə proseslərini dəstəkləyir. Bədii mətnlərlə müasir tədris öyrənənləri fəal şəkildə cəlb etmək və dil öyrənməni canlı, interaktiv prosesə çevirmək üçün metodoloji müxtəliflikdən istifadə edir (Kertes, 2008).

Keçmişdə bədii mətnlərə çox vaxt qrammatika və lüğətə diqqət yetirilməklə, sırf analitik şəkildə

baxılırdı. Müasir metodlar isə daha çox ünsiyyətə, qarşılıqlı əlaqəyə və yaradıcı emallara önəm verir. Bu, öyrənənlərə təkcə dil bacarıqlarını inkişaf etdirməyə deyil, həm də mətnlərlə şəxsi münasibətlərini qurmağa imkan verir.

Bədii mətnlər xarici dillərin tədrisində mühüm rol oynayır. Onlar yalnız dil biliklərinin inkişafına deyil, həm də mədəniyyətlərarası öyrənmə və analitik düşüncə bacarıqlarının formalaşmasına kömək edir. Müasir təhsil yanaşmaları bədii mətnlərdən istifadənin effektivliyini artırmaq üçün müxtəlif metodlardan istifadə edir.

Bədii mətnlər zəngin linqvistik strukturları, idiomatik ifadələri və üslub vasitələrini ehtiva etdiyindən dil öyrənmə prosesini daha əlverişli edir. Dil öyrənənlər real kontekstdə yeni sözlər və ifadələr öyrənir, müxtəlif üslublarla tanış olur və dili yalnız nəzəri qaydalar çərçivəsində deyil, təbii istifadədə mənimsəyirlər (Kramsch, 1993).

Bədii mətnlərin söz ehtiyatının genişləndirilməsi üçün xüsusi əhəmiyyəti vardır. Adi dərsliklərdə rast gəlinməyən, kontekstdən asılı şəkildə işlənən mürəkkəb ifadələr və sözlər məhz ədəbi mətnlərdə təqdim olunur. Bu, tələbələrə dilin daha dərin qatlarını öyrənmək və sözlərin müxtəlif kontekstlərdə istifadəsini başa düşmək imkanı yaradır.

Qrammatik strukturların kontekstdə qavranılması da bədii mətnlərin üstünlüklərindəndir. Ədəbi mətnlərdə müxtəlif qrammatik qaydalar təbii şəkildə işlənir, bu da tələbələrin dili daha orijinal formada dərk etməsinə kömək edir.

Tələbələr qrammatikanı nəzəri qaydalar kimi öyrənmək əvəzinə, onları canlı nitqdə və yazıda necə tətbiq etməyi öyrənirlər (Maley, 1989).

Oxu və yazma bacarıqlarının inkişaf etdirilməsi üçün bədii mətnlər əvəzedilməz vasitələrdən biridir. Tələbələr mətnin strukturunu, üslub xüsusiyyətlərini və arqumentasiya metodlarını təhlil edərək daha yaxşı oxucu və yazıçı olurlar. Müxtəlif janrlardan olan mətnlər üzərində işləyərək tələbələr fərqli yazı üslublarını mənimsəyir və öz fikirlərini yazılı şəkildə daha dolğun ifadə etməyi öyrənirlər.

Bədii mətnlər təkcə dil öyrətmir, həm də tələbələrə öyrəndikləri dilin daşıyıcısı olan xalqın mədəniyyətini və dünyagörüşünü öyrənməyə kömək edir. Ədəbiyyat tarixi hadisələri, sosial inkişafları və ənənələri əks etdirdiyi üçün dil öyrənənlər bu cəmiyyətlərin xüsusiyyətləri ilə yaxından tanış olurlar (Kramsch).

Mədəniyyətlərarası səriştə formalaşdırmaq üçün bədii mətnlər vacib rol oynayır.

Tələbələr müxtəlif düşüncə tərzləri, dəyərlər və həyat tərzləri ilə tanış olaraq onları öz mədəniyyətləri ilə müqayisə edirlər. Bu, onların mədəni empatiyasını və dünyagörüşünü genişləndirir.

Bədii mətnlər eyni zamanda sosial məsələlərin müzakirəsinə imkan yaradır. Ədəbiyyatda miqrasiya, gender problemləri, sosial bərabərsizlik, ədalət və digər aktual mövzular tez-tez işlənir. Bu, tələbələrə yalnız dili deyil, həm də bu problemlərlə bağlı düşünməyi, analiz etməyi və müzakirə aparmağı öyrədir (Lazar, 1993).

Ədəbiyyat öyrənənlərin yalnız dil biliklərini artırmır, həm də onların intellektual və emosional inkişafına töhfə verir. Bədii mətnlərin tənqidi düşüncə qabiliyyətini inkişaf etdirdiyi məlumdur. Tələbələr mətnlərdəki personajları, motivləri, müəllifin məqsədini və mətnin əsas ideyasını təhlil edərək daha dərindən düşünməyi öyrənirlər.

Empatiyanın inkişafı da bədii mətnlərin mühüm təsirlərindən biridir. Personajların həyat hekayələri və daxili dünyası ilə tanış olmaq tələbələrin başqalarının baxış bucağını anlama və müxtəlif perspektivləri dəyərləndirmə bacarığını formalaşdırır.

Bədii mətnlər yaradıcılığı da stimullaşdırır. Tələbələr hekayələrə alternativ sonluqlar yaratmaq, personajların taleyini dəyişdirmək, dialoqları yenidən qurmaq və ya öz hekayələrini yazmaq kimi fəaliyyətlər vasitəsilə təxəyyüllərini inkişaf etdirirlər (Maley, Duff, 1989).

Müasir tədris metodları bədii mətnləri dil dərslərində daha effektiv şəkildə istifadə etməyə imkan yaradır. Kommunikativ üsullar vasitəsilə tələbələr mətnləri aktiv şəkildə öyrənir və dili praktiki şəkildə mənimsəyirlər. Məsələn, səhnə şərhi tələbələrin mətnləri dramatik formada təqdim etməsini nəzərdə tutur. Bu metod vasitəsilə tələbələr dialoqları yenidən yazır, səhnələri improvizasiya edir və dili təcrübə edirlər.

Müzakirə qrupları da bədii mətnlərin öyrənilməsində mühüm rol oynayır.

Tələbələr qruplara bölünərək mətnin personajları, süjeti və sosial aktuallığı barədə müzakirələr aparır. Bu yanaşma həm tənqidi düşüncəni, həm də arqumentasiya və kommunikasiya bacarıqlarını inkişaf etdirir.

Tapşırıq yönümlü yanaşmalar tələbələrin mətnlərlə aktiv qarşılıqlı əlaqədə olmasını təmin edir. Oxucu mərkəzli yanaşmada tələbələr mətnləri subyektiv şəkildə dəyərləndirir və öz təcrübələri ilə əlaqələndirirlər. Layihə əsaslı işlərdə isə tələbələr komikslər, şəkilli hekayələr, podkastlar, rəqəmsal təqdimatlar və videolar vasitəsilə mətnləri yaradıcılıqla öyrənirlər.

Rəqəmsal və multimedia üsulları da bədii mətnlərin tədrisinə yeni imkanlar yaradır. Filmlər, audiokitablar və interaktiv platformalar mətnlərin daha yaxşı başa düşülməsinə kömək edir. Oyunlaşdırma metodları isə tələbələrin motivasiyasını artırır və öyrənmə prosesini daha maraqlı edir (Nünning, Nünning, 2014).

Bədii mətnlərin çətinliyi onların tədrisində əsas problemlərdən biridir. Bir çox klassik və müasir əsərlərdə mürəkkəb dil strukturları və dərin fəlsəfi məqamlar olur. Bu problemi həll etmək üçün mətnlərin əvvəlcədən xülasəsi təqdim oluna bilər, həmçinin sadələşdirilmiş versiyalardan istifadə edilə bilər.

Şagirdlərin aşağı motivasiyası da çətinliklərdən biridir. Bəzi tələbələr ədəbiyyatı darıxdırıcı və qeyri-aktual hesab edir. Bu problemi həll etmək üçün müasir media, interaktiv metodlar və tələbələrin həyatına uyğun mətnlər seçilməlidir.

Mətnlərin dərin təhlili çox vaxt tələb etdiyi üçün dərs zamanı effektiv strategiyalar tətbiq olunmalıdır. Geniş oxu metodunda tələbələr mətnin ümumi mənasını anlamağa fokuslanır və bütün detalların dərin təhlilinə ehtiyac olmur. Bundan əlavə, tələbələrin mətn haqqında fikirlərini gündəliklərdə sənədləşdirməsi onların müstəqil düşünmə və refleksiya bacarıqlarını inkişaf etdirir.

Xarici dil dərslərində müasir ədəbiyyatın tədrisi ənənəvi mətn təhlilindən kənara çıxır. İnteraktiv metodlar, rəqəmsal alətlər və yaradıcı yanaşmalar vasitəsilə ədəbiyyat dil bacarıqlarını, mədəni anlayışı və tənqidi düşüncəni təşviq edən maraqlı bir mühitə çevrilir (Roche, 2008).

Ümumiyyətlə, aydındır ki, bədii mətnlər müasir alman dili dərslərində dəyərli mənbədir. Onlar dil öyrənməni mədəni və yaradıcı ifadə ilə birləşdirir və dərsləri daha canlı və davamlı edir. Müvafiq metod və materialların məqsədyönlü istifadəsi ədəbiyyatın üstünlüklərindən optimal istifadə etməyə və tələbələrin təlim proseslərini bir çox cəhətdən zənginləşdirməyə kömək edə bilər. Amma qeyd etmək lazımdır ki, dərs prosesində mətnlərin seçimidə çox əhəmiyyətlidir. A. Maley mətnlərin seçilməsində ilk növbədə tələbələrin maraqlarına əsaslanmağı qətiyyətlə tövsiyə edir (Maley, 1989).

Nəticə etibarilə, bədii mətnlərin xarici dil tədrisində istifadəsi tələbələrin dil biliklərini, mədəni məlumatlılığını və tənqidi düşüncəsini inkişaf etdirmək üçün güclü bir vasitədir. Müasir metodların tətbiqi bu prosesi daha effektiv və maraqlı edir. Bədii mətnlərlə müasir tədris həm linqvistik, həm də mədəni öyrənmə məqsədlərinə nail olmaq üçün innovativ metodlar tələb edir. İnteraktiv, rəqəmsal və fərdi yanaşmaların birləşməsi davamlı şəkildə öyrənənlərin motivasiyasını və anlayışını artırır.

## Nəticə

Bədii mətnlərin alman dili dərslərində istifadəsi dil öyrənməyə yeni nəfəs gətirir. Bu mətnlər yalnız linqvistik bacarıqları deyil, eyni zamanda mədəniyyətlərarası anlayış və tənqidi düşüncə qabiliyyətlərini də inkişaf etdirir. Müasir metodların, rəqəmsal alətlərin və yaradıcı yanaşmaların tətbiqi bədii mətnlərlə işləməyi daha maraqlı, effektiv və öyrənənlər üçün mənalı edir. Düzgün seçilmiş mətnlər və metodik yanaşma tələbələrin dilə olan marağını artırır və onların öyrənmə prosesini daha dərin və davamlı edir.

## Ədəbiyyat

1. Aliyeva, A. E. (2019). *K voprosu ob ispol'zovanii khudozhestvennykh tekstov na zanyatiyakh angliyskogo yazyka: Teoriya i metodika obucheniya i vospitaniya (po oblastyam i urovnyam obrazovaniya).* Gulistanskiy gosudarstvennyy universitet, kafedra angliyskogo yazyka i literatury.

2. Collie, J., & Slater, S. (1990). *Literature in the language classroom: A resource book of ideas and activities*. Cambridge University Press.
3. Ji-Young, K. (2010). *Frauenliteratur im universitären DaF-Unterricht in Südkorea: Eine literaturdidaktische Konzeption unter kommunikativen, interkulturellen und geschlechtsspezifischen Aspekten*. Sozialwissenschaften.
4. Kertes, P. (2008). Arbeit mit literarischen Texten im DaF-Unterricht am Beispiel einer Unterrichtseinheit zum Thema Über mich selbst. *ELTE*, 103–119.
5. Kramsch, C. (1993). *Context and culture in language teaching*. Oxford University Press.
6. Kramsch, C. (n.d.). Literary texts in the classroom: A discourse. *The Modern Language Journal*. [Volume və isse göstərilməyib].
7. Lazar, G. (1993). *Literature and language teaching: A guide for teachers and trainers*. Cambridge University Press.
8. Maley, A. (1989). Down from the pedestal: Literature as resource. In *Literature and the learner: Methodological approaches*. Modern English Publications.
9. Maley, A. (1989). Down from the pedestal: Literature as resource. *Aem.az*. https://aem.az/uploads/Maley,%20A.%20(1989).%20Down%20from%20the%20Pedestal:%20Literature%20as%20Resource...
10. Maley, A., & Duff, A. (1989). *The inward ear: Poetry in the language classroom*. Cambridge University Press.
11. Nünning, V., & Nünning, A. (2014). *An introduction to the study of English and American literature*. Klett Lerntraining.
12. Quliyeva, S. Ə. (2024, August 12). İngilis dilinin tədrisində bədii mətnlərin seçilməsi prosesi. *Elmi Əsərlər Jurnalı, 91*(2), 189–192. https://journals.arti.edu.az/uploads/f_20240801080134839886489.pdf
13. Roche, J. (2008). *Literatur verstehen: Eine Theorie des Verstehens und Interpretierens literarischer Texte*. Narr Francke Attempto Verlag.

Daxil oldu: 13.01.2025
Qəbul edildi: 11.04.2025

ISSN: 2663-4619
e-ISSN: 2708-986X

DOI: https://doi.org/10.36719/2663-4619/115/164-167

**Seyran Dadaşov**
Bakı Slavyan Universiteti
magistrant
https://orcid.org/0009-0008-8980-4668
dadasovseyran11@gmail.com

# Xarici dil dərsində vizual vasitələrin rolu

## Xülasə

Xarici dilin öyrədilməsi prosesində vizual vasitələrin rolu danılmazdır. Bu vasitələr şagirdlərin diqqətini cəlb etməklə yanaşı, onların öyrənmə motivasiyasını artırır və informasiyanı daha uzun müddət yadda saxlamağa kömək edir. Xarici dil öyrənərkən şagirdlər üçün əsas problemlərdən biri yeni söz və ifadələri yadda saxlamaq və onların istifadəsini başa düşməkdir. Vizual materiallar – şəkillər, diaqramlar, sxemlər, videolar, interaktiv lövhələr, fləşkartlar və hətta jestlər və mimikalar – bu problemi aradan qaldırmağa kömək edir.

Bu cür vasitələr dili kontekst daxilində təqdim edərək onun praktiki istifadəsini asanlaşdırır. Müasir dövrdə texnologiyanın inkişafı vizual tədris vasitələrinin daha geniş və effektiv istifadəsinə şərait yaradır. Rəqəmsal platformalar, mobil tətbiqlər və virtual reallıq texnologiyaları xarici dil öyrənənlərə real dil mühiti yaradır və tədrisi daha interaktiv və maraqlı edir. İnteraktiv lövhələr və multimedia materialları tələbələrin dərs prosesində fəal iştirakını təmin edir.

Bundan əlavə, vizual vasitələrin istifadəsi təkcə yadda saxlama prosesini gücləndirmir, həm də xarici dili öyrənənlərin dinləmə, danışıq və yazı bacarıqlarının inkişafına kömək edir. Xüsusilə, vizual materiallar nitq strukturunu və qrammatikanı daha yaxşı başa düşməyə kömək edir. Bu səbəbdən pedaqoqlar tədris prosesində vizual metodlardan geniş istifadə etməli və onları ənənəvi öyrənmə üsulları ilə birləşdirməlidirlər.

***Açar sözlər:*** *vizual vasitələr, xarici dil, tədris, interaktiv öyrənmə, motivasiya, yaddaş, kommunikasiya, innovativ metodlar, multimodal tədris, müasir pedaqogika, rəqəmsal resurslar, dil bacarıqları*

**Seyran Dadashov**
Baku Slavic University
Master student
https://orcid.org/0009-0008-8980-4668
dadasovseyran11@gmail.com

# The Role of Visual Aids in a Foreign Language Class

## Abstract

Visual aids play a crucial role in foreign language learning. They not only capture students' attention but also enhance motivation and facilitate long-term retention of information. One of the primary challenges in language learning is remembering new words and phrases while understanding their proper usage. Visual materials—images, diagrams, charts, videos, interactive whiteboards, flashcards, and even gestures and facial expressions—help overcome this difficulty. These tools present language in context, making it easier for learners to apply it in real-life situations. With technological advancements, the use of visual teaching tools has become more diverse and effective. Digital platforms, mobile applications, and virtual reality technologies create the real language environments, making learning more interactive and engaging.

Interactive whiteboards and multimedia materials encourage students to participateactively in lessons. Moreover, the use of visual aids not only strengthens memory retention but also improves listening, speaking, and writing skills. In particular, visual materials help learners grasp grammatical structures and sentence syntax more effectively. Therefore, educators should actively incorporate visual teaching methods into their curriculum, combining them with traditional approaches for optimal results.

***Keywords:*** *visual aids, foreign language, teaching, interactive learning, motivation, memory, communication, innovative methods, multimodal learning, modern pedagogy, digital resources, language skills*

## Giriş

Müasir dövrdə xarici dil tədrisi sürətlə inkişaf edir və müxtəlif metodlarla zənginləşir. Ənənəvi tədris üsulları ilə yanaşı, yeni pedaqoji yanaşmaların tətbiqi öyrənmə prosesini daha effektiv edir.

Vizual vasitələr öyrənmə prosesini daha effektiv edir, çünki beynin görüntülərlə işləmə qabiliyyəti yüksəkdir. Xarici dil tədrisində vizual vasitələrin istifadəsi aşağıdakı üstünlükləri təmin edir: İnformasiyanın yadda saxlanılmasını artırır – Şəkillər, diaqramlar və cədvəllər şagirdlərin yeni sözləri və ifadələri daha yaxşı xatırlamasına kömək edir ("Ümumi təhsil haqqında" Azərbaycan Respublikasının Qanunu).

**Tədqiqat**

İnteraktivliyi artırır – Müasir texnologiyalar, məsələn, interaktiv lövhələr və rəqəmsal resurslar dərsləri daha maraqlı və dinamik edir. Qavrayışı sürətləndirir – Xarici dildə qrammatikanı və leksikanı anlamaq üçün şəkillər və videolar daha təsirli olur.

Xarici dilin öyrədilməsi üçün istifadə olunan vizual vasitələr çoxşaxəlidir və texnologiyanın inkişafı ilə daha da genişlənir. Aşağıda ən çox istifadə olunan vasitələr verilmişdir:

1. Şəkillər və Diaqramlar - Şəkillər və diaqramlar yeni sözləri izah etmək və şagirdlərin təsəvvürünü inkişaf etdirmək üçün istifadə olunur. Xüsusilə, vizual lüğət kitabları, posterlər və rəqəmsal illüstrasiyalar xarici dil öyrənənlər üçün faydalıdır.

2. Videolar və Animasiya - Dil öyrənmə prosesində videolar və animasiyalar əvəzolunmaz rol oynayır. Məsələn, xarici dildə çəkilmiş qısa filmlər, cizgi filmləri və TED danışıqları şagirdlərin dinləmə bacarıqlarını inkişaf etdirir (Rudolf, 2008, iyun 8).

3. İnteraktiv Lövhələr və Rəqəmsal Resurslar - İnteraktiv lövhələr müəllimlərə dərsi daha əyani şəkildə izah etməyə imkan yaradır. Google Classroom, Kahoot, Quizlet kimi onlayn platformalar interaktiv və vizual öyrənməni dəstəkləyir.

4. Fləşkartlar və Piktogramlar - Fləşkartlar və piktogramlar xarici dilin əsas ifadələrinin öyrədilməsində mühüm rol oynayır. Xüsusilə, uşaqlar və yeni başlayanlar üçün bu metod daha effektivdir (Baudry, 1994, aprel 4).

5. Virtual və Artırılmış Reallıq Texnologiyaları - Son illərdə dil tədrisində virtual (VR) və artırılmış reallıq (AR) tətbiqləri geniş yayılmışdır. Bu texnologiyalar sayəsində şagirdlər xarici dildə danışan bir mühitdə özlərini hiss edərək real təcrübə qazana bilirlər.

Vizual vasitələrin istifadəsində texnologiyanın inkişafı mühüm rol oynayır. Müasir texnologiyalar xarici dil öyrənənlərə aşağıdakı imkanları yaradır. Müasir texnologiyaların inkişafı ilə bu vasitələrin tətbiqi daha da genişlənmişdir. "Xarici dil müəllimləri vizual metodlardan səmərəli istifadə etməklə şagirdlərin öyrənmə prosesini daha maraqlı və məhsuldar edə bilərlər" ("Ümumi təhsil haqqında" Azərbaycan Respublikasının Qanunu).

Hər bir təsvirin qəbul edilməsi üçün minimal şərt olaraq onun ilk növbədə qavranılması tələb olunur. Bu, heç bir təsvir nəzəriyyəsi tərəfindən inkar edilmir. Lakin bəzi təsvir nəzəriyyələri təsviri bir qavrayış obyekti kimi əsas götürür. Bu kontekstdə qavrayışa əsaslanan yanaşmaların iki əsas variantı ayırd edilir: Birinci variant, təsviri dərk etmə prosesində aktiv qavrayış fəaliyyətinin rolunu vurğulayır. İkinci variant isə bunun əksini iddia edərək vizual qavrayışın təbii bir hal olmadığını,

əksinə, müəyyən təsvir növlərinin qavrayış prosesimizi strukturlaşdırıb təşkil etdiyini müdafiə edir. Birinci yanaşma subyekt yönümlü perseptualizm, ikinci yanaşma isə media və ya texnologiya yönümlü perseptualizm adlandırıla bilər. (Jean, 1979, May 22).

"Subyekt yönümlü perseptualizmin ilk nümunələri Fiedlerin təsvirləri "saf görünmə" kimi müəyyən etməsində müşahidə olunur" (Fiedler, 1999, April 27). Qavrayış nəzəriyyəsinə əsaslanan təsvir anlayışları fenomenologiyada (Husserl, 2005, sentyabr 6), qestalt nəzəriyyəsində və analitik təsvir fəlsəfəsinin bəzi istiqamətlərində işlənmişdir. Bu yanaşmaların ortaq xüsusiyyəti ondan ibarətdir ki, onlar qavrayışı passiv informasiya qəbulu kimi deyil, aktiv reseptiv proses kimi nəzərdən keçirirlər. Beləliklə, təsvir qavrayışı və müvafiq qavrayış bacarıqları təsvirin quruluşunda mühüm rol oynayır. Qestalt psixologiyasının təsiri altında Rudolf Arnheim vurğulayır ki, (Rudolf, 2008, iyun 8). Biz ilk növbədə bütöv formaları qəbul edirik və yalnız bundan sonra onları hissələrə ayırırıq.

Mediayönümlü perseptualizm əsasən vizual tədqiqatlar (Visual Studies) sahəsində geniş yayılmışdır. Jonathan Crary və Jean-Louis Baudry vizual qavrayışın müəyyən təsvir media və onlarla bağlı texnologiyalar tərəfindən strukturlaşdırıldığını vurğulayırlar (Crary, 1990, oktyabr 16).

Bu tədqiqat perspektivinin öncüllərindən biri Erwin Panofsky hesab edilə bilər. O, "Perspektiv simvolik forma kimi" adlı məqaləsində vizual qavrayışın tarixi və mədəniyyətlə bağlı aspektlərini irəli sürmüşdür (Erwin, 2015, 29 noyabr). Vizual qavrayışın tarixi və mədəni xarakter daşıdığı fikri vizual tədqiqatlar çərçivəsində geniş araşdırılmışdır. Təsvirin bir işarə və ya işarələr kompleksi olduğu anlayışı, təsvir elmləri (bildwissenschaft) çərçivəsində dominant təsvir anlayışı kimi qəbul edilə bilər. Burada semiotik təsvir anlayışının bütün növlərini əhatə etmək iddiası güdülməsə də, ümumi olaraq iki əsas yanaşma fərqləndirilə bilər:

Strukturalist semiotika – təsvirin müxtəlif səviyyələri və ya məna növləri arasındakı fərqlərə diqqət yetirir.Analitik semiotika – təsvirin istinad etmə tərzini və məna quruluşunu əsas müzakirə mövzusu edir" (Fiedler, 1999, aprel 27). Hər iki yanaşmanın əsasını Peirce-in üçlü işarə bölgüsü (trikotomiyası) təşkil edir: ikonik işarə, indeksikal işarə və simvolik işarə (Peirce, 1958, May 4). Bu işarə növləri obyektləri ilə əlaqələrinə görə fərqləndirilir: İkonik işarə – istinad etdiyi obyektə oxşarlıq əlaqəsi ilə bağlıdır. İndeksikal işarə – obyektinə səbəb-nəticə əlaqəsi ilə bağlıdır. Simvolik işarə – obyektinə konvensiya və ya vərdişlər əsasında istinad edir.

Strukturalist semiotikanın ilkin təsvir analizləri – Roland Barthes və Umberto Eco tərəfindən aparılmışdır. Onlar təsviri işarələri denotasiya səviyyəsində ikonik işarələr kimi müəyyənləşdirir və əsasən konnotasiya və vizual tropların (məcazların) mümkünlüyü ilə maraqlanırlar (Baudry, 1994, aprel 4). Barthes üçün fotografiya ikon bir işarə kimi kodsuz mesajdır – ən azı denotasiya səviyyəsində. Lakin konnotasiya səviyyəsində o, fotoqrafik mesajın koddan asılı olduğunu qeyd edir. Eco da oxşar mövqe tutur. Lakin o, Barthes-dən fərqli olaraq mənanın müxtəlif səviyyələrini genişləndirir, eyni zamanda təsvirlərin çoxmənalılığı səbəbindən onların dil vasitəsilə fiksasiyaya ehtiyacı olduğunu qəbul edir. Nelson Goodman-in "Languages of Art" (1968) əsərindən sonra analitik semiotikada Barthes və Eco-nun təhlillərində təbii qəbul edilən bir məsələ – təsvirlərin ikon işarəsi olduğu fikri – açıq şəkildə sual altına alınmışdır. (Goodman, 1996, noyabr 3).

## Nəticə

İkonik işarələr kimi başa düşüldükdə, təsvirlər istinad etdikləri obyektə oxşarlıqları səbəbindən bağlanırlar. Lakin Goodman öz simvol nəzəriyyəsini təsvirlərdəki oxşarlıq nəzəriyyəsinə tənqidlə əsaslandırır və sübut edir ki, oxşarlıq nə zəruri, nə də yetərli şərtdir. Oxşarlıq zəruri şərt deyil, çünki bəzi təsvirlər heç bir oxşarlıq əlaqəsi olmayan obyektləri təsvir edir: Fiktional mövzular (məsələn, uydurma personajlar və ya hadisələr). Layihə rəsmləri (hələ mövcud olmayan obyektlər, məsələn, memarlıq eskizləri). Oxşarlıq yetərli şərt də deyil, çünki: Oxşarlıq əlaqəsi və təsvir əlaqəsi müxtəlif məntiqi xüsusiyyətlərə malikdir (Goodman, 1996, noyabr 3).

## Ədəbiyyat

1. Azərbaycan Respublikası Təhsil Nazirliyi. (n.d.). *“Ümumi təhsil haqqında” Azərbaycan Respublikasının Qanunu*. https://edu.gov.az/az/de-institutlasma-ve-usaqlarin-mudafiesi_348/umumi-tehsil-haqqinda-azerbaycan-respublikasinin-qanunu_18396
2. Cambridge University Press. (n.d.). *Pictures for language learning*. https://www.pedocs.de/
3. De Gruyter. (n.d.). *Förderung von Visual Literacy im DaF-Unterricht anhand von Werbeanzeigen*. https://www.degruyter.com/
4. Fiedler. (1999, April 27). *Potenzial der Visualisierungen für mediengestütztes Grammatiklernen*. De Gruyter. https://www.degruyter.com/
5. Hüseynova, N. T., & Məlikov, M. Ş. (2018). *Xüsusi metodikanın müasir problemləri*.
6. Jean. (1979, May 22). *Visuelle Medien im DaF-Unterricht*. Scispace. https://scispace.com
7. Lucidspark. (n.d.). *Strategien für das visuelle Lernen und Unterrichten*. https://lucidspark.com/
8. Mayer, R. E. (n.d.). *Multimedia learning*. Cambridge University Press. https://lucidspark.com/
9. Pedocs.de. (n.d.). *Digitales Lehren und Lernen im Fachunterricht*. https://www.pedocs.de/
10. ResearchGate. (n.d.). *UDL als Hilfsmittel zur Gestaltung diversitätssensiblen Fremdsprachenunterrichts*. https://www.researchgate.net/
11. U.S. Department of Education. (n.d.). *The Individuals with Disabilities Education Act (1990)*. https://www.ed.gov/laws-and-policy/individuals-disabilities/idea
12. Venngage. (n.d.). *Arten von visuellen Hilfsmitteln zum Lernen*. https://de.venngage.com/

Daxil oldu: 28.01.2025
Qəbul edildi: 07.04.2025

DOI: https://doi.org/10.36719/2663-4619/115/168-176

**İlahə Səidova**
Xəzər Universiteti
magistrant
https://orcid.org/0009-0004-0095-168X
ilahe.seidova@gmail.com

# Karyera mərkəzləri nə dərəcədə effektivdir? Azərbaycanda universitetlərin akkreditasiya hesabatlarının təhlili

## Xülasə

Bu tədqiqat Azərbaycanda universitetlərin karyera mərkəzlərinin tələbə və məzunların məşğulluq imkanlarını artırmaq qabiliyyətini qiymətləndirir. Təhlil 15 institusional akkreditasiya hesabatının məzmun analizinə əsaslanır. Araşdırma, universitetlərin "Karyera xidmətləri və məzunlarla davamlı əlaqə" (Kriteriya 3.10) üzrə milli keyfiyyət təminatı meyarını nə dərəcədə yerinə yetirdiyini müəyyənləşdirmək məqsədilə aparılıb. Nəticələr göstərir ki, ali təhsil müəssisələri arasında bu sahədə ciddi fərqlər mövcuddur: bəzi universitetlər peşəkar karyera məsləhət xidmətləri, inteqrasiya olunmuş karyera planlaşdırma dərsləri, güclü təcrübə proqramları, müntəzəm iş yarmarkaları və sistemli məzun izləmə mexanizmləri daxil olmaqla, hərtərəfli karyera dəstəyi strategiyalarına malikdirlər. Lakin digər bir çox universitetdə bu xidmətlər ya ilkin səviyyədədir, ya da lazımi resurslardan məhrumdur. Bir sıra ali məktəblər işəgötürənlərlə tərəfdaşlıq qurmaqda və məzun nəticələrinə dair məlumatlardan proqramların təkmilləşdirilməsi üçün istifadə etməkdə uğurlu olsa da, əksər hallarda karyera xidmətləri qeyri-bərabər şəkildə inkişaf edib və ən yaxşı təcrübələrlə tam uyğunluq təşkil etmir. Karyera mərkəzlərinin inkişaf səviyyəsindəki bu fərqlər ölkə üzrə məzunların məşğulluq nəticələrinin dəyişkənliyinə səbəb olur. Tədqiqatın nəticələri təhsil orqanları tərəfindən vahid qiymətləndirmə çərçivələrinin hazırlanması və monitorinqin gücləndirilməsinin vacibliyini vurğulayır.

***Açar sözlər:*** *karyera xidmətləri, tələbə məşğulluğu, universitet akkreditasiyası, Azərbaycan Ali Təhsili, karyera mərkəzlərinin effektivliyi, QAAE Hesabatları, tələbə karyera inkişafı, təlimdə keyfiyyət təminatı*

**Ilahe Saidova**
Khazar University
Master student
https://orcid.org/0009-0004-0095-168X
ilahe.seidova@gmail.com

# How Effective Are Career Centers? Analysis of Universities Accreditation Reports in Azerbaijan

## Abstract

This study evaluates the effectiveness of universities career centers in Azerbaijan in enhancing student and graduate employability, based on a content analysis of 15 institutional accreditation reports. The analysis focuses on the national quality assurance criterion for "Career Services and Ongoing Contact with Alumni" (Criterion 3.10) to identify how well universities implement career support structures and activities. The findings reveal substantial variability across institutions: while a few universities demonstrate comprehensive career center strategies – including dedicated career counseling, integrated career-planning courses, robust internship programs, regular job fairs, and systematic alumni tracking – many others have only rudimentary or under-resourced services. Several institutions excel in forging employer partnerships and using data on graduate outcomes to improve

Malik olduğumuz coğrafi-siyasi mövqe Almaniya üçün maraq doğurur. Müstəqilliyin bərpasından sonra Azərbaycan bir sıra enerji layihələrinin həm iştirakçısı, həm də tranzit ölkə olaraq Avropa enerji təhlükəsizliyinə öz töhfəsini verir. Almaniya Federativ Respublikası Azərbaycan Respublikasının Avropada ən vacib siyasi, iqtisadi və strateji tərəfdaşlarından biridir. Dünya iqtisadiyyatında və siyasətində mühüm rol oynayan rəsmi Berlin Cənubi Qafqazın aparıcı ölkəsi sayılan Azərbaycanla əməkdaşlığı dərinləşdirmək üçün səylərini daim artırır. Almaniya Avropa İttifaqının aparıcı dövləti kimi Cənubi Qafqazda gedən prosesləri yaxından izləyir. O, regiondakı vəziyyəti düzgün qiymətləndirərək reallığa uyğun qərarlar qəbul edir. AFR Azərbaycan ilə Ermənistan arasındakı münasibətlərin normallaşmasının tərəfdarı, sülhün bərqərar olmasının əsas dəstəkçilərindən biridir.

Azərbaycan və Almaniya arasında ikitərəfli münasibətlər hazırda da yüksək səviyyədədir. Effektiv dialoq mövcuddur. Berlin bu illər ərzində Avropada Bakının ən vacib siyasi-iqtisadi tərəfdaşlarından birinə çevrilib. Eyni zamanda Avropa İttifaqının Şərqi Avropa ölkələri ilə sıx əməkdaşlığını nəzərdə tutan və 2009-cu ilin may ayında Praqada qüvvəyə minən "Şərq Tərəfdaşlığı" proqramının təşviqatçısıdır. Azərbaycan Respublikası ilə Almaniya Federativ Respublikası arasındakı münasibətlər hazırda sürətli inkişaf dövrünü yaşayır.

## Nəticə

1991-ci ildə müstəqilliyini bərpa etdikdən sonra Azərbaycan Respublikası beynəlxalq aləmdə özünü tanıtmaq, suverenliyini qoruyub saxlamaq, həmçinin iqtisadi inkişafa nail olmaq üçün bir sıra dövlətlər ilə əlaqələr qurmağa başlamışdır. Bu dövlətlər içində Almaniya Federativ Respublikasının özünəməxsus yeri var. Çünki almanlar XIX əsrdə bu regiona köç etmiş, burada öz koloniyalarını yaratmışlar. Ölkələr arasında ikitərəfli münasibətlər daha çox iqtisadi əlaqələr üzərində qurulmuşdur. Alman kapitalı ölkənin iqtisadiyyatının inkişafına dəstək olmuşdur. Bir çox alman şirkətləri iqtisadiyyatın müxtəlif sahələrinə sərmayə qoymuşdur. Almaniya Avropanın enerji təhlükəsizliyi üçün Azərbaycanı etibarlı tərəfdaş hesab edir. Həyata keçirilən enerji layihələri bunun bariz nümunəsidir.

Eyni zamanda iki ölkə arasında mədəni münasibətlər də yüksək səviyyədədir. Almaniyanın müxtəlif şəhərlərində yaradılmış diaspora təşkilatları bu münasibətləri inkişaf etdirir.

Müxtəlif sahələrdə ölkələrimiz arasındakı əməkdaşlıq hazırda yüksələn xətt üzrə inkişaf edir. 30 ildən çox zamanı əhatə edən bu dövrdə ikitərəfli əməkdaşlığın hüquqi bazasını təşkil edən 70-dən çox sənəd imzalanmışdır. Dövlət nümayəndələrinin qarşılıqlı səfərləri çərçivəsində bir sıra məsələlər müzakirə olunmuşdur.

## Ədəbiyyat

1. Abdullayev, Ç. (2014). *Azərbaycan–Almaniya əlaqələri*. Bakı: Mütərcim.
2. Azərbaycan Respublikasının xarici siyasətinin əsas istiqamətləri (1991–2016). (2017). Bakı.
3. Azertag. (n.d.). https://azertag.az/xeber
4. Prezident.az. (2024, Aprel 26). *İlham Əliyev Berlində "15-ci Petresberq İqlim Dialoqu"nun Yüksək Səviyyəli Seqmentində iştirak edib*. https://president.az/az/articles
5. Qasımlı, M. (2015). *Azərbaycan Respublikasının xarici siyasəti (1991–2003) (II hissə)*. Bakı.
6. Report.az. (n.d.). https://report.az
7. Azerbaijan Portal. (n.d.). https://www.azerbaijans.com
8. Heydər Əliyev İrsi. (2020, may). *Azərbaycan–Almaniya münasibətləri: Ümumi tarixi arayış*. https://www.lib.aliyevheritage.org/az/687645.html

Daxil oldu: 15.12.2024
Qəbul edildi: 22.03.2025

DOI: https://doi.org/10.36719/2663-4619/115/250-253

**Seyyub Əsədov**
Şirvan şəhər 11№-li tam orta məktəb
https://orcid.org/0009-0005-8010-1737
seyyub1967@gmail.com

# Qızıl Orda xanı Şadı bəy haqqında

## Xülasə

Məqalədə Şirvanşahlar dövlətinin Qızıl Orda dövləti ilə münasibətlərindən bəhs olunur. 1400-1408-ci illərdə baş verən hadisələrdən söhbət gedərkən Qızıl Orda xanı Şadı bəyin Şirvanşahlar dövlətində siyasi sığınacaq tapması məsələsinə toxunmaqla göstərilir ki, o dövrdə Şirvanşahlar dövləti təkcə Cənubi Qafqazda yox, Yaxın və Orta Şərqdə ən qüdrətli və Avroasiya dövlətləri içərisində xüsusilə seçilən bir dövlət olmuşdur. Belə məsələlərin işıqlandırılması şagird və tələbələrimizin öz dövlətçiliyi ilə fəxr etməklə yanaşı, həm də dövlətçiliyimizə olan məhəbbətini qat-qat artırmış olar.

***Açar sözlər:*** *Azərbaycan, Şirvanşahlar dövləti, Qızıl Orda dövləti, Teymurilər, Əmir Teymur, Toxtamış xan, Şirvanşah I İbrahim, siyasi münasibətlər*

**Seyyub Asadov**
Shirvan city secondary school No. 11
https://orcid.org/0009-0005-8010-1737
seyyub1967@gmail.com

# About Shadi Bey, Khan of the Golden Horde

## Abstract

The article discusses the relations between the Shirvanshah state and the Golden Horde. While addressing the events that took place between 1400 and 1408, it highlights the issue of Golden Horde Khan Shadi Bey finding political asylum in the Shirvanshah state. This indicates that during that period, the Shirvanshah state was not only one of the most powerful in the South Caucasus, but also a particularly distinguished state among the major powers of the Near and Middle East and Eurasia. Highlighting such historical facts helps students and learners not only take pride in their statehood but also significantly deepen their love and respect for it.

***Keywords:*** *Azerbaijan, the Shirvanshah state, the Golden Horde state The Teimuris, Amir Teymur, Tokhtamysh Khan, Shirvanshah Ibrahim I, political relations*

## Giriş

1391-ci ilin əvvəlində Teymurun çağırdığı qurultayda Toxtamışa qarşı müharibə aparmaq haqqında qərar qəbul edilir ki, bu da iki nəhəng dövlətin arasındakı münasibətlərin daha kəskin xarakter almasına səbəb olur. Yürüş 1391-ci ilin yanvarında Daşkənddən başlayır. “Bu xəbər Toxtamışa çatanda o Teymurun yanına elçi göndərir və gələcəkdə dost münasibətləri saxlayacaqlarını vəd edir” (Qəzvini, 1986, s. 90). “Bunu qəbul etməyən Teymur yürüşü davam etdirir” (Əmir Teymurun vəsiyyətləri, 1991, s. 38). “18 iyun 1391-ci ildə Samara çayından bir az şimalda Qunduzça çayı yaxınlığında döyüş baş verir. Toxtamışın qoşunu darmadağın edilir.Lakin bu döyüş Qızıl Ordanın siyasi və iqtisadi həyatına ciddi təsir etmədi” (Qrekov, Yakubovskiy, 1950: 308). 1394-cü ildə Qızıl Orda qoşunları yenidən Şirvana hücum etdi. Bu vaxt Teymur öz qoşunu ilə Şəkidə idi. Qızılordalılar Azərbaycandan qovulub çıxarıldılar və Teymur Qızıl Ordaya 2-ci böyük yürüş etməyi

 

qərara alır. “Teymur bu yürüşdə qarşısına Qızıl Ordanın-Krım, Şimali Qafqaz və Aşağı Volqaboyu kimi iqtisadi cəhətdən əhəmiyyətli və varlı əyalətlərini məhv etmək məqsədin qoyur” (Qrekov, Yakubovskiy, 1950, s. 374). “Artıq Toxtamışla qarşılaşmağın vaxtı çatdığını və onu təxirə salmağın lüzumsuzluğunu Teymur başa düşürdü” (Əhəri, 1984, 41). 1395-ci ilin fevralında o Toxtamışa qarşı yürüşə şıxmaq əmrin verir. Yoldan Teymur Toxtamışın yanına bacarıqlı diplomat olan Şəmsəddin Almalığı məktubla göndərərək, döyüşə gəldiyini bildirir. “Toxtamış öz sərkərdələrinin təsiri altında kobud cavab məktubu yazır” (Məmmədova, 1991, s. 28). 1395-ci il aprelin əvvəlində hər iki qoşun Terek çayı sahilində üz-üzə dayanır. 15 aprel 1395-ci ildə Teymur döyüşə başlamağı əmr edir. O dövrün ən böyük döyüşlərindən biri baş verir və bu döyüşlə nəinki Toxtxmışın, həm də Qızıl Orda dövlətinin taleyi həll edilmiş oldu. Hər iki tərəf böyük itki verdi. “O qədər adam qətl edildi ki, səhrada (döyüş meydanında) qan dərələri peyda oldu” (Şami, 1992, s. 14). Döyüşün qanlı və ağır olması Toxtamışın hərbi qüdrətinin güclü olması haqqında xəbər verir. “Lakin buna baxmayaraq Qızıl Orda məğlub olur, Toxtamış özü isə qaçıb gizlənir sonra isə öldürülür. Döyüşdən sonra Teymur ölkənin içərilərinə doğru yürüş edərək Dnepr sahillərinə yaxınlaşır. Krım şəhərləri dağıdılır” (Safarqaliyev, 1960, s. 141). “Qızıl Orda qoşununun Teymur tərəfindən məğlubiyyət xəbəri Saray şəhərinə çatdıqda Misir nümayəndələri Teymurun əlinə düşməmək üçün tez oradan qaçırlar və 18.IX.1395-ci ildə Misirə çatırlar. Bu Misirin Toxtamış xanın yanına göndərmiş olduğu son səfirlik idi” (Zakirov, 1966, s. 96). 1395-ci ilin qışında Teymur qoşunlarının istiqaməti Həştərxan və Saray şəhərləri oldu. Hər iki şəhər tutularaq, qarət edildi və yandırıldı. “Teymurun Qızıl Ordaya bu yürüşü onu sadəcə zəiflətmədi, bu dövlətə ciddi zərbə vurdu” (Qəzvini, 1990, s. 65). Elə bir zərbə vurdu ki, bundan sonra Qızıl Orda öz əvvəlki ərazisində və əvvəlki formasında bərpa ola bilmədi. Teymurun 1395-ci il yürüşündən sonra faktiki olaraq bu dövlətin tənəzzülü dövrü başladı.

Beləliklə, XIV əsrin II yarısında, xüsusən 80-90-cı illərində Azərbaycan Qızıl Ordanın və Teymurun işğalçı yürüşlərinə məruz qalır. Lakin ölkədə mövcud olan feodal pərakəndəliyi və ara müharibələri işğalçılara qarşı ciddi müqavimət göstərməyə mane olurdu. “Feodal pərakəndəliyinin hakim olduğu məmləkət asanlıqla xarici işğalçıların obyekti ola bilərdi” (Əlizadə, 1956, s. 344-345).

**Tədqiqat**

Qızıl Orda xanı Toxtamış 1385,1387,1394-cü illərdə Azərbaycana yürüşlər etmiş, bu yürüşlər zamanı Azərbaycanın şimal əyalətləri ən çox ziyan çəkmişdir. Bundan başqa Təbrizin ələ keçirilməsi bütün Azərbaycanı tutmaq üçün əsas olduğundan şəhər uğrunda mübarizə ciddi şəkil almışdı. Təkcə 1385-1401-ci illərdə Azərbaycan ərazisində (Təbrizdə olmuş döyüşlərdən başqa) 10 dəfə qanlı vuruşma getmişdir. Bunlardan 4-ü Əlincə qalasında, 2-si Şirvanda (1387,1394), qalan vuruşmalar isə Marağa, Naxçıvan, Şəki və Mərənd yaxınlığında baş vermişdir” (Piriyev, 1978, s. 61). 1405-ci ildə Teymurun ölümü ilə onun böyük imperiyası dağıldı. Teymurun ölümü və Teymurilər arasında ara çəkişmələri I İbrahimi asılılığdan azad etdi. “Tez bir zamanda İbrahimə Şirvanın müstəqilliyini bərpa etmək müyəssər oldu. Teymurilərin özləri də bununla hesablaşmağa məcbur oldular və Şirvanın müstəqilliyi onlar tərəfindən tanındı” (Aşurbəyli, 1983, s. 197). Şirvanşah I İbrahim Teymurilər arasında baş verən çəkişmələrdən və onu dəstəkləyən əhalidən istifadə edərək təkcə Şirvanın müstəqilliyinə yox, eləcədə Cənubi Azərbaycanın da qısa müddətə sahibi olur.

Bu dövr üçün Şirvanşahlar dövlətinin Qızıl Orda ilə münasibətində bir məsələyə toxunmaq istərdim. C. İbrahimov E.A. Paxomovun “Azərbaycanın qısa tarix kursu” əsərinə istinadən göstərir ki, “Teymurun və Cəlairlərin asılılığından çıxan Şirvanşahlar dövləti Cuci (Qızıl Orda) ulusundan asılı vəziyyətə düşür və bu asılılıq 1412-ci ilə qədər davam etmişdir” (İbrahimov, 1962: 20). Əlizadə yazır ki, belə bir fikir bu dövrə aid Şirvan sikkələrində Qızıl Orda xanı Şadı bəyin (1401-1407) adı həkk olunduğuna görə yaranmışdır. Bundan başqa, İbrahim Təbrizdə olan zaman hətta Şadı bəyin adına xütbə də oxutmuşdur. Əlizadə daha sonra haqlı olaraq yazlr: “Sikkə zərb etmək və ada xütbə oxunması heç də həmişə siyasi asılılıq əlaməti olmamışdır. Hətta Teymurun sikkələrində, Cağatay sülsləsindən qondarma xanların adı olurdu. Həqiqətdə isə bu dövrdə Qızıl Ordanın bir çox səbəblər üzündən Şirvanla müharibə aparmağa və onu işğal etməyə gücü yox idi (Əlizadə, 1956, s. 397). S.

Aşurbəyli bu halı "I İbrahimin anonim sikkələr kəsdirməsi ilə izah edir" (Aşurbəyli, 1983, s. 238). Tarixçilər Qızıl Orda dövlətində feodal qruplar arasında mübarizədən danışarkən göstərirlər ki, 1400/01-ci ildə Qızıl orda xanı Timur Qutluq öldükdən sonra hakimiyyətə Şadı bəy gəlir. "Əslində real hakimiyyət bütövlükdə bacarıqlı saray xadimi Yedigeyin əlində idi" (Vamberi, 1991, s. 28). Bu barədə 1403-cü il mayın 21-də Teymurun sarayına göndərilən Kastilya səfiri Klavixo məlumat verir. Klavixo Teymurun ölümü ilə əlaqədar məlumat verərkən göstərir ki; "...xəbər yayıldı ki, tatar imperatoru Yedigey ...hücum etmişdir" (Səyyahlar Azərbaycan haqqında, 1961, s. 64). Bu onu göstərir ki, Qızıl Orda da real hakimiyyət Şadı bəyin yox, Yedigeyin əlində cəmlənmişdi. Şadı bəy ondan yaxasını qurtarmaq üçün sui-qəsd hazırlayır. Ancaq Yedigey bundan xəbər tutur və bu sui-qəsddən əvvəl Şadı bəylə haqq-hesab çəkmək istəyir. Bunu duyan Şadı bəy Dərbəndə qaçaraq I İbrahimin yanında sığınacaq tapır və 1407/8-ci ildə burada da ölür. Yakubovski özünün "Qızıl Orda və onun tənəzzülü" əsərində yazır ki, sikkənin kəsilməsi faktı ondan xəbər verirki, Şadı bəy Qızıl Orda da başqa xan hakimiyyətdə olduqda belə özünü qanuni hökmdar hesab edirdi (Qrekov, Yakubovskiy, 1950, s. 392). Bütün bu faktlar onu göstərir ki, Şirvan (Azərbaycan-qeyd) Qızıl Ordadan asılı olmamışdır. Şadi bəy isə hakimiyyətdən əli çıxdığı üçün Şirvanşahlar dövlətində siyasi sığınacaq tapmışdır. "Qızıl Orda xanı Şadı bəyin Şirvanşahlar dövlətində siyasi sığınacaq tapması faktı onu göstərir ki, o dövrdə Şirvanşahlar dövləti təkcə Cənubi Qafqazda yox,Yaxın və Orta Şərqdə ən qüdrətli bir dövlət olmuşdur" (Aşurbəyli, 1983, s. 321). Safarqaliyev öz əsərində P.S.Savelyevin rus dilində nəşr olunmuş "Cuci sikkələri"əsərinə istinad edərək Teymur tarixçilərinin Toxtamışın tamamilə qovulub Şirvandan çıxarılması faktını şübhə altına alır və göstərir ki; "...789 h. (1387/88), 790 h. (1380, 791 h. (1389/90) illərində Dərbənd, Şabran, Şamaxı və Mahmudabadda Toxtamışın adına zərb edilmiş sikkələr vardır" (Safarqaliyev, 1960, s. 146).

Onu da qeyd etmək lazımdır ki, elə məsələlələr vardır ki, onların dərsliklərdə öz əksini tapması böyük əhəmiyyət kəsb etmiş olardı. Bu məsələlər ümumi təhsil müəssisələrinin 7-ci sinifləri üçün Azərbaycan tarixi fənni üzrə dərslikdə öz əksini tapmamışdır. Fikrimcə, belə məsələlərin dərsliklərdə öz əksini tapması şagirdlərdə elmi təfəkkürün inkişafına və yurdsevərlik hisslərinin güclənməsinə böyük təsir etmiş olardı. Şagirdlər öz Vətənlərinin tarixini daha dərindən öyrənməklə yanaşı, Vətənə məhəbbət ruhunda tərbiyə olardılar. Fikrimi 2 məsələ ilə izah etməyə çalışacağam.

Birinci məsələ:Azərbaycan və Qızıl Orda münasibətləri məsələsinə toxunularkən Qızıl Orda xanı Özbək xanın qoşunlarının şəhər və kəndləri talan etməsi, əhalinin qarət olunması məsələsi qeyd olunur.Yaxşı olardı ki, bu zaman müsəlman dini abidələrinin də ziyan çəkməsi, konkret olaraq Şirvan şeyxi Pir Hüseyn xanəgahının qarət olunmasına toxunulaydı. Xanəgah Bakının 127 kilometrliyində, Pirsaat çayı sahilində, Bakı-Salyan ticarət karvan yoiu üzərində yerləşir. Xanəgahın zəngin təsərrüfatı, kitabxanası olmuşdur. Pir Hüseyn məqbərəsinin yazılı-naxışlı kaşı bəzəkləri bu gün dünya muzeylərinin sərgilərini bəzəməkdədir.

İkinci məsələ: Şirvanşahlar dövlətinin Qızıl Orda dövləti ilə münasibətləri məsələsidir. 1400-1408-ci illərdə baş verən hadisələrdən söhbət gedərkən Qızıl Orda xanı Şadi bəyin Şirvanşahlar dövlətində siyasi sığınacaq tapması məsələsinə toxunmaqla göstərilərdi ki, o dövrdə Şirvanşahlar dövləti təkcə Cənubi Qafqazda yox, Yaxın və Orta Şərqdə ən qüdrətli dövlət olmuşdur. Avroasiya dövlətləri içərisində xüsusilə seçilən bir dövlət olmuşdur. Bu da şagirdlərin dövlətçiliyimizə olan məhəbbətini qat-qat artırmış olardı (Qəzvini, 1986).

Yuxarıdakı məsələlərin Azərbaycan tarixi dərsliyində öz əksini tapması şagirdlərdə elmə marağı artırmaqla yanaşı, əxlaqi tərbiyəyə böyük təsir edər, onlarda vətənsevərlik, dövlətçiliyə məhəbbət hisslərini daha da gücləndirmiş olardı.

**Nəticə**

Bu bir həqiqətdir ki,bir olkənin və bir xalqın tarixi, o ölkə və o xalq haqqında nə deyə bilərsə, hər bir tarixçi də o ölkə və onun sakinləri haqqında haqqında təxminən eyni şeyi deyə bilər. XIX əsrin görkəmli Azərbaycan tarixçisi A. A. Bakıxanov "Gülüstani-İrəm" adlı məhşur kitabında yazır: "Tarix

elə bir danışmayan natiqdir ki, sələflərin vəsiyyətlərini bütün təfsilatı və təriflərlə xələflərə bildirir, ehtiyac və rifah səbəblərini, tərəqqi və tənəzzül yollarını anladır. Gələcəkdə törəyə bilən əhvalatı keçmişin libasında insanların ibrət nəzərinə çatdırır" (Bakıxanov, 1993, s. 9).

## Ədəbiyyat


1. Alizade, A. A. (1956). *Socialno-ekonomicheskaya i politicheskaya istoriya Azerbajdzhana v XIII–XIV vekah*.
2. Ashurbeyli, S. (1983). *Gosudarstvo Shirvanshahov*.
3. Bakikhanov, A. (1993). *Gülüstan-i İrəm*.
4. Əbu Bəkr əl-Qütbi əl-Əhəri. (1984). *Tarix-e Şeyx Üveys*.
5. Əmir Teymurun vəsiyyətləri. (1991).
6. Əsədov, S. (2016, noyabr 8). Qızıl Orda xanı Şadı bəy haqqında. https://multiurok.ru/files/qizil-orda-xani-sadi-b-y-haqqinda.html
7. Grekov, B., & Yakubovski, A. (1950). *Zolotaya Orda i ee padenie*. Moskva–Leningrad.
8. Ibragimov, C. (1962). *Feodalnye gosudarstva na territorii Azerbajdzhana v XV veke*.
9. Məmmədova, Ş. (1991). "Xülasət ət-təvarix" Azərbaycan tarixinin mənbəyi kimi.
10. MultiUrok. (n.d.). *Qızıl Orda xanı Şadı bəy haqqında*. https://multiurok.ru/files/qizil-orda-xani-sadi-b-y-haqqinda.html
11. Piriyev, V. (1978). *Azərbaycan Hülakülər dövlətinin tənəzzülü dövründə*.
12. *Puteshestvenniki ob Azerbajdzhane*. (1961).
13. Qəzvini, H. (1986). *Zeyl-e tarix-e qozide*.
14. Qəzvini, Z. (1990). *Zeyl-e tarix-e qozide*.
15. Safargaliev, M. G. (1960). *Raspad Zolotoj Ordy*. Saransk.
16. Şami, N. (1992). *Zəfərnamə*.
17. Vambery, G. (1991). *Əmir Teymur*.
18. Zakirov, S. M. (1966). *Diplomaticheskie otnosheniya Zolotoj Ordy s Egiptom*.


Daxil oldu: 16.01.2025
Qəbul edildi: 05.03.2025

DOI: https://doi.org/10.36719/2663-4619/115/254-257

**Fəsli Nəbiyev**
Bakı, Azərbaycan
https://orcid.org/0009-0003-5133-3390
faslinabiyev1@gmail.com

# Rəqəmsal texnologiyalar və siyasi institutların transformasiyası


## Xülasə

Müasir dövrdə rəqəmsal texnologiyaların sürətli inkişafı cəmiyyətin bütün sahələrinə, o cümlədən siyasi institutların fəaliyyətinə mühüm təsir göstərmişdir. İnformasiya-kommunikasiya texnologiyalarının yayılması, sosial media platformalarının güclənməsi, süni intellekt və böyük verilənlərin analizi kimi alətlər siyasətin təşkili və idarə olunmasında köklü dəyişikliklərə səbəb olmuşdur. Rəqəmsallaşma bir tərəfdən vətəndaşların siyasi proseslərdə iştirak imkanlarını genişləndirərək demokratik iştirakçılığı gücləndirir, digər tərəfdən isə dövlətlərin idarəetmə sistemində şəffaflığı və hesabatlılığı artırır.

Siyasi institutların transformasiyası özünü həm struktur, həm də funksional dəyişikliklərdə göstərir. Ənənəvi idarəetmə modelləri artıq yerini çevik, informasiya əsaslı və texnoloji yönümlü idarəetməyə verir. Rəqəmsal idarəetmə sistemləri vasitəsilə dövlət-vətəndaş münasibətləri yeni səviyyəyə qalxır, elektron hökumət xidmətləri genişlənir və vətəndaşların dövlətlə əlaqəsi sadələşir.

Bununla yanaşı, rəqəmsal texnologiyaların siyasi institutlara təsiri bəzi çağırışlar və risklər də yaradır. Kiber təhlükəsizlik, dezinformasiya, sosial manipulyasiya və məlumat məxfiliyi kimi problemlər siyasi sabitlik və ictimai etimad üçün təhlükə yarada bilər. Bu səbəbdən rəqəmsal transformasiya prosesində hüquqi çərçivənin təkmilləşdirilməsi, texnoloji savadlılığın artırılması və inklüziv siyasətlərin formalaşdırılması mühüm əhəmiyyət kəsb edir.


***Açar sözlər:*** *rəqəmsal texnologiyalar, siyasi institutlar, transformasiya, elektron idarəetmə, demokratik iştirakçılıq, kiber təhlükəsizlik, dezinformasiya*

**Fasli Nabiyev**
Baku, Azerbaijan
https://orcid.org/0009-0003-5133-3390
faslinabiyev1@gmail.com

# Digital Technologies and the Transformation of Political Institutions


## Abstract

In the modern era, the rapid development of digital technologies has significantly impacted all areas of society, including the functioning of political institutions. The widespread use of information and communication technologies, the rise of social media platforms, artificial intelligence, and big data analysis tools have led to profound changes in the organization and management of politics. On the one hand, digitalization expands citizens' opportunities to participate in political processes, strengthening democratic engagement; on the other hand, it enhances transparency and accountability within government systems.

The transformation of political institutions is evident in both structural and functional changes. Traditional governance models are increasingly being replaced by flexible, data-driven, and technology-oriented management approaches. Through digital governance systems, state-citizen relations are evolving to a new level, e-government services are expanding, and interactions with the state are becoming more streamlined for citizens.

However, the impact of digital technologies on political institutions also presents certain challenges and risks. Issues such as cybersecurity, disinformation, social manipulation, and data privacy pose threats to political stability and public trust. Therefore, improving the legal framework, enhancing technological literacy, and developing inclusive policies are crucial in managing the digital transformation process.

***Keywords:*** *digital technologies, political institutions, transformation, digital governance, democratic engagement, cybersecurity, disinformation*

## Giriş

Rəqəmsal texnologiyaların inkişafı XXI əsrin ən mühüm transformasiya proseslərindən biri kimi qiymətləndirilir. Bu proses yalnız gündəlik həyatımızın sadələşdirilməsi və iqtisadi fəaliyyətin sürətlənməsi ilə məhdudlaşmır, eyni zamanda siyasi institutların funksionallığına, strukturlarına və vətəndaşlarla qarşılıqlı əlaqəsinə də dərin təsir göstərir (Əlizadə, 2014). Dünyada baş verən texnoloji inqilab nəticəsində informasiya-kommunikasiya texnologiyaları, süni intellekt, böyük verilənlərin (Big Data) analizi, blokçeyn və sosial media kimi rəqəmsal alətlər dövlətlərin idarəetmə üsullarını köklü şəkildə dəyişdirməkdədir. Bu dəyişikliklər nəticəsində ənənəvi siyasi institutlar öz fəaliyyətlərini yenidən nəzərdən keçirmək və dəyişən şəraitə uyğunlaşmaq məcburiyyətində qalmışdır (Hüseynov, 2016).

Rəqəmsallaşma təkcə idarəetmə mexanizmlərinin səmərəliliyini artırmaqla kifayətlənmir, həm də vətəndaşların siyasi proseslərdə daha fəal iştirakı üçün yeni imkanlar yaradır. Elektron hökumət xidmətləri, açıq məlumat bazaları, onlayn ictimai müzakirələr və rəqəmsal petisiyalar vətəndaş cəmiyyətinin güclənməsinə təkan verir. Bu cür imkanlar demokratiyanın inkişafında və ictimai nəzarətin effektivliyinin artırılmasında əhəmiyyətli rol oynayır. Eyni zamanda rəqəmsal texnologiyalar vasitəsilə informasiya axınının sürətlənməsi və ictimai rəyin formalaşması da yeni çalarlar qazanır (Məmmədov, 2016).

Lakin bütün bu müsbət dəyişikliklərlə yanaşı, rəqəmsal texnologiyaların siyasi institutlara inteqrasiyası bir sıra çağırışları da gündəmə gətirir. Kiber təhlükələr, dezinformasiya kampaniyaları, seçkilərin rəqəmsal müdaxilələrə məruz qalması, şəxsi məlumatların sızdırılması kimi problemlər siyasi sabitlik və ictimai etimad üçün ciddi risklər yaradır. Bu baxımdan, rəqəmsal transformasiya təkcə texnoloji deyil, eyni zamanda siyasi, hüquqi və etik aspektlərdən də kompleks şəkildə araşdırılmalıdır (Əlizadə, 2014).

Bu tədqiqatın məqsədi rəqəmsal texnologiyaların siyasi institutların fəaliyyətinə təsirini hərtərəfli təhlil etmək, bu təsirin doğurduğu imkan və təhlükələri qiymətləndirmək, eyni zamanda rəqəmsal transformasiyanın mövcud və potensial perspektivlərini müəyyənləşdirməkdir. Mövzu, həm nəzəri baxımdan, həm də dövlət idarəçiliyi və demokratik proseslərin təkmilləşdirilməsi kontekstində aktual və əhəmiyyətlidir (İsmayılov, 2020).

**Tədqiqat**

Bu tədqiqatda rəqəmsal texnologiyaların siyasi institutların transformasiyasına təsirini araşdırmaq üçün müxtəlif metodlar tətbiq olunmuşdur (Sadıqov, 2018):

1. **Ədəbiyyatın təhlili (Analitik metod)** – Araşdırmaçı, rəqəmsal texnologiyalar və siyasi institutlar mövzusunda mövcud olan elmi ədəbiyyatı təhlil edərək, bu sahədəki əsas anlayışları, nəzəri yanaşmaları və mövcud məlumatları öyrənmişdir. Bu metod, mövcud problemləri müəyyənləşdirmək və tədqiqatın nəzəri çərçivəsini qurmaq üçün istifadə edilmişdir.
2. **Müqayisəli təhlil** – Fərqli ölkələrin və regionların rəqəmsal texnologiyaları siyasi idarəetmə sahəsinə tətbiq etmə təcrübələri müqayisə olunmuşdur. Bu metod vasitəsilə müxtəlif dövlətlərin rəqəmsallaşma proseslərindən əldə etdiyi uğurlar və qarşılaşdıqları çətinliklər qiymətləndirilmişdir.
3. **Empirik tədqiqat (Sorğu və anketlər)** – Vətəndaşların rəqəmsal texnologiyalara münasibəti və onların siyasi iştirak səviyyəsini öyrənmək üçün sorğular və anketlər tətbiq edilmişdir. Bu metod, rəqəmsal texnologiyaların siyasi institutların fəaliyyətinə real təsirini anlamağa imkan vermişdir.

**4. Tarixi analiz** – Rəqəmsal texnologiyaların inkişafını və bu inkişafın siyasi institutların strukturuna və fəaliyyətinə təsirini zamanla izləyən tarixi metoddan istifadə edilmişdir. Bu yanaşma, texnoloji dəyişikliklərin siyasi idarəetmədə necə inkişaf etdiyini anlamağa kömək etmişdir.

**5. Sistemli yanaşma** – Rəqəmsal texnologiyaların siyasi institutların müxtəlif sahələrində (qanunvericilik, icraedici fəaliyyət, ictimai iştirak) yaratdığı dəyişiklikləri və bu dəyişikliklərin qarşılıqlı təsirini qiymətləndirmək məqsədilə sistemli yanaşma tətbiq edilmişdir.

Bu metodların birgə istifadəsi nəticəsində, rəqəmsal texnologiyaların siyasi institutların transformasiyasına təsiri və bu prosesin qarşısında duran çağırışlar daha dərindən öyrənilmişdir (Babayev, 2017).

## Nəticə

Tədqiqat nəticəsində rəqəmsal texnologiyaların siyasi institutların transformasiyasına təsiri aydın şəkildə ortaya çıxmışdır. Rəqəmsallaşma, siyasi idarəetmədə şəffaflıq, vətəndaşların iştirak imkanlarının artırılması və dövlətin vətəndaşlarla olan münasibətlərinin yenidən qurulmasına müsbət təsir göstərmişdir. Eyni zamanda, süni intellekt, böyük verilənlər və digər texnoloji alətlərin tətbiqi, qərar qəbul etmə proseslərini daha səmərəli etmişdir. Bununla yanaşı, kiber təhlükəsizlik, dezinformasiya və şəxsi məlumatların qorunması məsələləri kimi ciddi çağırışlar da meydana çıxmışdır. Bu problemlərin həlli üçün müvafiq hüquqi və texnoloji mexanizmlərin tətbiqinə ehtiyac duyulmuşdur (Şahbazov, 2021).

Tədqiqatın nəticələri göstərir ki, rəqəmsal texnologiyaların tətbiqi siyasi institutların fəaliyyətini daha çevik və şəffaf etməklə yanaşı, bəzi riskləri də nəzərə alaraq yeni idarəetmə modellərinin inkişafına təkan vermişdir. Siyasi idarəetmə sahəsində rəqəmsal transformasiya hələ də davam edən bir proses olmaqla, ölkələrin təcrübələrinə əsaslanaraq bu sahədə daha da təkmilləşdirilmiş yanaşmaların tətbiqi vacibdir (Əsədov, 2018).

Tədqiqatın nəticələri, rəqəmsal texnologiyaların siyasi institutların transformasiyasına çoxsahəli təsirini ortaya qoymuşdur. Bu təsir yalnız idarəetmə sistemlərinin optimallaşdırılmasına, həmçinin dövlətin vətəndaşlarla olan münasibətləri və ictimaiyyətlə əlaqələrinə böyük dəyişikliklər gətirmişdir. İnformasiya-kommunikasiya texnologiyalarının inkişafı ilə birlikdə, vətəndaşların siyasi iştirak imkanları da artmışdır. Elektron hökumət xidmətləri, rəqəmsal petisiyalar və onlayn seçki sistemləri, vətəndaşların dövlətlə əlaqələrini sadələşdirərək, demokratik proseslərdə daha aktiv iştirak etmələrini təmin etmişdir. Bu yanaşmalar, xüsusən də inkişaf etməkdə olan ölkələrdə siyasi sabitliyi artırmış və dövlətin fəaliyyətində şəffaflığı təmin etmişdir (Quliyev, 2020).

Rəqəmsal texnologiyaların siyasi institutlara təsiri həm də idarəetmənin çevikliyinə gətirib çıxarmışdır. Ənənəvi bürokratik strukturların yavaş və mürəkkəb qərar qəbul etmə prosesləri, rəqəmsal idarəetmə modelləri ilə daha sürətli və effektiv hala gəlmişdir (Rəhimov, 2017). Bu dəyişikliklər dövlət vətəndaş əlaqələrinin rəqəmsal platformalar vasitəsilə daha şəffaf və açıq olmasını təmin etmişdir. Rəqəmsallaşma, həmçinin siyasi iştirakçılığın müxtəlif formalarını təşviq etmişdir. Sosial mediada fəal olan vətəndaşlar, siyasi məsələlərə dair daha çox məlumat əldə edir, fikir mübadiləsi aparır və hökumətə qarşı müvafiq təzyiqləri daha sürətlə tətbiq edə bilirlər.

Bununla yanaşı, rəqəmsal texnologiyaların tətbiqi ilə bağlı mövcud olan ən böyük çətinliklərdən biri də texnoloji savadlılığın artırılmasıdır. Vətəndaşların və dövlət əməkdaşlarının texnoloji yeniliklərə uyğunlaşması və bu alətləri səmərəli şəkildə istifadə etməsi üçün təhsil və təlim proqramlarının hazırlanması vacibdir. Həmçinin, siyasi institutlar rəqəmsal texnologiyaların mənfi tərəflərini və risklərini qiymətləndirərək bu sahədə müvafiq qanunvericiliklər hazırlamalıdır. Bu addımlar, rəqəmsal texnologiyaların siyasi idarəetməyə müsbət təsirini artıracaq və bərabər imkanlar yaradacaqdır.

## Ədəbiyyat

1. Babayev, T. (2017). *Azərbaycanın siyasi sistemində rəqəmsal transformasiya*. Azərbaycan Universiteti Nəşriyyatı.
2. Əlizadə, M. (2014). *Azərbaycanın siyasi həyatında rəqəmsal texnologiyaların yeri və rolu*. Elm və Təhsil.
3. Əsədov, R. (2018). *Azərbaycan dövlətinin və idarəetməsinin tarixi və hüquqi problemləri*. Azərnəşr.
4. Məmmədov, S. (2015). *Azərbaycanın dövlət qurumlarında informasiya texnologiyalarının istifadəsi*. Tələbə Nəşriyyatı.
5. Məmmədov, İ. (2016). *Rəqəmsal idarəetmə: Nəzəriyyə və təcrübə*. Təhsil Nəşriyyatı.
6. İsmayılov, S. (2020). *Azərbaycan idarəetmə sistemində informasiya texnologiyaları və islahatlar*. Nurlan Nəşriyyatı.
7. Həsənov, M. (2019). *Elektron hökumət və rəqəmsal idarəetmə*. İqtisadiyyat Nəşriyyatı.
8. Sadıqov, A. (2018). *Azərbaycan cəmiyyətində informasiya texnologiyalarının təsiri və perspektivləri*. Azərnəşr.
9. Şahbazov, R. (2021). *Siyasi idarəetmədə rəqəmsal texnologiyaların tətbiqi: Azərbaycan təcrübəsi*. Qafqaz Universiteti Nəşriyyatı.
10. Quliyev, F. (2020). *Rəqəmsal cəmiyyət və idarəetmə: Azərbaycan kontekstində*. Nurlan Nəşriyyatı.
11. Rəhimov, M. (2017). *Rəqəmsal transformasiya və siyasi sabitlik: Azərbaycan perspektivi*. Azərbaycan Milli Elmlər Akademiyası Nəşriyyatı.
12. Hüseynov, V. (2016). *İnformasiya texnologiyalarının təsiri altında Azərbaycan cəmiyyətindəki dəyişikliklər*. Elm və Təhsil Nəşriyyatı.

Daxil oldu: 05.01.2025
Qəbul edildi: 10.04.2025

**TƏBİƏT ELMLƏRİ**
**NATURAL SCIENCES**

DOI: https://doi.org/10.36719/2663-4619/115/258-264

**Məlahət Bağırova**
Azərbaycan Tibb Universiteti
https://orcid.org/0009-0000-2969-0082
bmelahet@gmail.com
**Könül Cəfərova**
Azərbaycan Tibb Universiteti
https://orcid.org/0000-0002-1109-1548
tibb üzrə fəlsəfə doktoru
infeksiyakonul@gmail.com
**Rəna Nəzərova**
Azərbaycan Tibb Universiteti
https://orcid.org/0009-0004-5167-7107
shah241962@yahoo.com
**Gülnarə Kərimova**
Azərbaycan Tibb Universiteti
https://orcid.org/0009-0000-3912-4260
**Müseyib Abdullayev**
Azərbaycan Tibb Universiteti
https://orcid.org/0009-0001-9931-4573
abdullayevmuseyib763@gmail.com

# Postkovid dönəmində baş verən göy öskürək epidemiyası və onun qarşısının alınması yolları

**Xülasə**

Göyöskürək (GÖ) hal-hazırda bütün dünyada rast gəlinən ,yayılmış, idarə olunan infeksiyalardan biri hesab olunur. Vaksinasiyaya qədərki dövrdə GÖ uşaq ölümünün səbəbləri içərisində əsas yerlərdən birini tuturdu, lakin planlı immunizasiyanın tətbiqi xəstəliyin və letallığın kəskin azalmasına səbəb olub. Əhalinin geniş kütləsinin planlı immunoprofilaktikasının rəsmi qeydiyyatına baxmayaraq (97%-ə kimi), indiyə kimi 3-4 illik dövriyyə ilə GÖ-nün tsikliki yüksəlişi və enişləri baş verir. CDC təşkilatının verdiyi məlumata görə bütün GÖ hadisələrinin yalnız 5-10%-nin diaqnozu qoyulur və qeydiyyata alınır.

Kütləvi vaksinasiyanın aparılması GÖ-nin epidemioloji xarakteristikasına ciddi təsir edib, lakin törədicinin tam eliminasiyasını əldə etmək mümkün olmayıb. Hal-hazırda GÖ ilə xəstələnmə hallarında artım müşahidə olunur, əsasən bu vaksinasiya üçün hüceyrəsiz vaksinlərdən istifadə edən ölkələrdə baş vrir. İl ərzində dünyada 16 mln adam GÖ ilə xəstələnir, 19500 adamda letal nəticə baş verir. İnkişaf etməkdə olan ölkələrdə, xüsusilə də Afrikada erkən yaşlı uşaqların GÖ-dən letallığı 23% təşkil edir. Hətta hüceyrəsiz vaksin istifadə edən inkişaf etmiş ölkələrdə GÖ ilə xəstələnmə halları artıb. Belə ki dünyanın 50 –dən çox ölkəsində asellyulyar vaksindən istifadə olunur. Aparılan tədqiqtların nəticələri göstərir ki, asellyulyar vaksinlə 5 doza vaksinasiya olunanlarda sellyulyar vaksinlərə nisbətən ( heç olmasa bir dəfə) GÖ-lə yoluxma riski 8,57 və 6 doza alanlarda isə 3,55 dəfə çox olur. Hətta tamhüceyrəli vaksinlərdən ibarət olan AGDT-nin tam kursunu və bir revaksinasiyasını alanlarda belə postvaksinal immunitet 6 ildən sonra 50 % və ondan çox azalır.

COVİD-19 pandemiyası dövründə Avropa və ABŞ-də GÖ-lə xəstələnmə halları azalmışdı, lakin ondan sonrakı dövrdə yenidən artım müşahidə olunmağa başlayıb. 2024-cü ildə dünyanın bir çox ölkələrində GÖ-nin epidemiyası baş verib və bu son 25 ilin ən ciddi epidemiyası hesab olunur.

***Açar sözlər:*** *göyöskürək, uşaqlar, epidemiya, vaksinasiya, postvaksinal immunitet*

 

**Malahat Baghirova**
Azerbaijan Medical University
https://orcid.org/0009-0000-2969-0082
bmelahet@gmail.com
**Konul Jafarova**
Azerbaijan Medical University
https://orcid.org/0000-0002-1109-1548
PhD in Medicine
infeksiyakonul@gmail.com
**Rana Nazarova**
Azerbaijan Medical University
https://orcid.org/0009-0004-5167-7107
shah241962@yahoo.com
**Gulnara Karimova**
Azerbaijan Medical University
https://orcid.org/0009-0000-3912-4260
gulnara@gmail.com
**Museyib Abdullayev**
Azerbaijan Medical University
https://orcid.org/0009-0001-9931-4573
abdullayevmuseyib763@gmail.com

# The Whooping Cough Epidemic in the Post-Covid Period and Ways to Prevent It

## Abstract

Pertussis is currently considered one of the most common, controlled infections worldwide. In the pre - vaccination period, pertussis was one of the main causes of child mortality, but the introduction of planned immunization has led to a sharp decrease in morbidity and mortality. Despite the official registration of planned immunoprophylaxis of a large mass of the population (up to 97 %), until now cyclical ups and downs of pertussis occur with a cycle of 3 - 4 years. According to the CDC, only 5 - 10 % of all pertussis cases are diagnosed and recorded.

Mass vaccination had a serious effect on the epidemiological characteristics of pertussis, but it was not possible to achieve complete elimination of the causative agent. Currently, there is an increase in the incidence of pertussis, mainly in countries that use acellular vaccines for vaccination. During the year, 16 million people in the world get sick with pertussis, and 19,500 people die. In developing countries, especially in Africa, the mortality rate of early-age children from pertussis is 23%. Even in developed countries that use acellular vaccines, the incidence of pertussis has increased. So, acellular vaccine is used in more than 50 countries of the world. The result of the conducted studies show that those who received 5 doses of acellular vaccine have an 8.57 and 3.55 times higher risk of contracting pertussis compared to cellular vaccines (at last once). Even in those who received a full course of Tdap consisting of whole-cell vaccines and one revaccination, postvaccinal immunity declines 50% or more after 6.

During the COVID-19 pandemic, the incidence of pertussis in Europe and the United States decreased, but in the period after that, an increase was observed again. In 2024 an epidemic of pertussis occurred in many countries of the world, and this is considered the most serious epidemic of the last 25 years.

***Keywords:*** *whooping cough, children, epidemic, vaccination, postvaccinal, immunity*

## Giriş

Müasir dövrdə GÖ-nin epidemioloji nəzarəti peyvənd proqramlarının davamlı tətbiqindən və risk qrupları arasında profilaktik tədbirlərin gücləndirilməsindən asılıdır (Bakhmutskaya, Mindlina, Stepenko, 2018).

COVİD-19 pandemiyası zamanı tətbiq edilən sosial izolyasiya, maska istifadəsi və gigiyena tədbirləri bir çox hava-damcı yolu ilə yayılan infeksiyaların, o cümlədən GÖ-nin yayılmasını müvəqqəti azaltmışdı. Lakin pandemiya məhdudiyyətləri aradan qaldırıldıqdan sonra normal sosial həyat bərpa edildikcə yoluxma hallarının yenidən artması müşahidə olunub (Basov, 2016; Basov, Zvirkun, Gerasimova, 2019).

**Tədqiqat**

Son illərdə bəzi ölkələrdə GÖ epidemiyalarının sayında nəzərə çarpacaq dərəcədə yüksəliş qeydə alınmışdır. Xüsusilə: ABŞ, Böyük Britaniya, Avstraliya və Avropa ölkələrində GÖ hallarının çoxaldığı bildirilir. 2023-2024-cü illərdə bəzi ölkələrdə yoluxma göstəriciləri pandemiyadan əvvəlki dövrdən daha yüksək olub (Bouchez, Guillot, Landier, Armatys, Matczak, Toubiana, et al., 2021).

Postkovid dövründə GÖ hallarının artmasının əsas səbəbləri:

1. İmmunitet boşluğu – pandemiya dövründə məhdud infeksiya təması səbəbindən əhalidə təbii immunitetin azalması.
2. Peyvəndləmənin gecikməsi - pandemiya zamanı peyvənd proqramında fasilələrin olması, bəzi uşaqların vaxtında peyvənd olunmaması.
3. Aşılanma səviyyəsinin azalması – peyvənd əleyhinə meyllərin artması və bununla əlaqədar aşılanma faizinin aşağı düşməsi.
4. Böyüklər arasında artan yoluxma – yeniyetmələr və böyüklər arasında immunitetin zəifləməsi və xəstəliyin daha yüngül formalarının müşahidə olunması.
5. Epidemik dövrilik – GÖ-nin 3-5 illik tsiklik dalğalar şəklində yayılması və pandemiya dövründə süni azalma nəticəsində postpandemiya dövründə daha güclü epidemiya riskinin yaranması (Bouchez, Toubiana, Guillot, Parapertussis Study Group, El Belghiti, Landier, et al., 2024).

2024-cü ildə dünyanın bir çox ölkələrində GÖ-nin epidemiyası baş verib (Bridel, Bouchez, Brancotte, Hauck, Armatys, Landier, et al., 2022).

Təkcə ABŞ-də ilin əvvəlində 18500 xəstələnmə hadisəsi qeydə alınıb. CDC-nin verdiyi məlumata görə bu cür yüksək kontagiozlu infeksiya ilə xəstələnənlərin sayı ABŞ-də keçən ilə nisbətən 5 dəfə artıb və bu göstərici 2014-cü ildən bu yana xəstəliyin ən yüksək göstəricisi hesab olunur. Eyni zamanda Avropa ölkələrində də xəstəlik kəskinləşib (Briko, Feldblyum, 2019).

Fransada Paster institutunun bir qrup əməkdaşlarının apardığı araşdırmalarda son 25 ilin Fransada ən pisi olan GÖ epidemiyasının dinamikası təsvir edilib (Iozefovich, Kharit, Bobova, Budnikova, 2021). Fransa dövlət orqanları bildirib ki, bu son 25 ilin ən ciddi epidemiyası hesab olunur. Alimlər göstərib ki, COVİD-19 pandemiyasından sonra GÖ dövrlərinin müntəzəmliyi pozulub, belə ki, 1997-2019-cu illər arasında GÖ hər 3-5 ildən bir dövri olmaqla epidemik sıçrayış verirdi. Covid-19 pandemiyası ilə üst-üstə düşən dövrdə də GÖ dövriyyəsində nəzərə çarpacaq dərəcədə azalma müşahidə edildi.2022-2023-cü illərdə gözlənilən tsikliki yükşəliş baş vermədi. 2024-cü ilin əvvəlində Fransada vəziyyət kökündən dəyişib. 2024-cü ildə yanvarın 1-dən mayın 31-dək 5616 GÖ hadisəsi qeydə alınıb. Xəstəlik 22 uşağın ölümünə səbəb olub, onun da 20-si körpə olub. 2024-cü ilin əvvəlindən bəri GÖ-yə yoluxan və ölənlərin sayı əvvəlki epidemiyalarda qeydə alınan rəqəmlərdən qat-qat çox olub, bu da görünməmiş canlanmanı göstərib. Digər tərəfdən alimlər 2024-cü ildə yoluxmuş şəxslərdən götürülmüş B.pertussis bakteriyalarının bakterial izolatının genomunun sıralanmasını öyrənib və vaksinin istehsalı həyata keçirilib (Lomonosova, 2020). Tədqiqatların nəticələri göstərir ki, vaksinlərin tətbiqi B.pertussisin vaksinal ştamlarının antigen divergensiyasına səbəb olur. Xəstələrdən alınan B. Pertussis ştamlarının müasir klonal strukturu vaksin ştamlarından fərqlənir. Belə ki, vaksinin tərkibində olan antigenlərdən 66 və 65 izolatinin pertaktin COVİD-19-dan əvvəlki illərdən fərqli olaraq FİM-2 adezini istehsal edir, məhz bu iki zülal virulentlik faktorları olub, bakteriyaların tənəffüs epitelial hüceyrələrinə adgeziyasında və makroorqanizm tərəfindən baş

verən reaksiyaların tənzimləməsində mühüm rol oynayır. Məhz post covid dövründə GÖ-nün yüksək sıçrayışı bununla izah oluna bilər (Ma, Calfield, Dewan, Harvill, 2021).

Hal-hazırda dünyanın bir çox ölkələrində olduğu kimi Azərbaycanda da GÖ əleyhinə I-li immunizasiya göstəricilərinin yüksək səviyyədə olmasına baxmayaraq, xəstəliyin artımı baş verib.Bu da onu göstərir ki, vaksinasiya ilə qarşısı alınan digər xəstəliklərdən fərqli olaraq GÖ-yi keçirdikdən, həmçinin tam vaksinasiyadan sonra yaranan immunitet məhdud müddətli olur (Machado, Passos, 2019; Matczak, Levy, Fortas, Cohen, Bechet, Ait El Belghiti, et al., 2022). Məhz ona görə də xəstəlik, əsasən, məktəbəqədər və məktəbyaşlı, hətta əvvəllər bu infeksiya əleyhinə peyvənd alan uşaqlarda belə daha çox qeyd olunur. Bundan əlavə 50 ildən artıqdır ki, GÖ-nin vaksinoprofilaktika taktikası dəyişmir, məhz ona görə də məktəbəqədər və yeniyetmə yaş dövründə, həmçinin böyüklərdə vaksinasiyadan alınan kliniki effektin saxlanılmasında və peyvənd olunmayan uşaqlara ötürülməsi riskinin azalmasında buster dozaların yeridilməsi zəruridir (Mikheeva, Saltykova, Mikheeva, 2018).

Məhz yuxarıda sadalananlar müasir mərhələdə GÖ-nin epidemioloji-kliniki xüsusiyyətlərinin öyrənilməsinin vacibliyini göstərir.

**Tədqiqatın material və metodları.** Tədqiqat Ə.Qarayev adına 2 saylı KUX-nin yoluxucu bölməsində aparılıb. Tədqiqata kliniki-epidemioloji GÖ diaqnozu təsdiqlənən 14 yaşa qədər olan 70 uşaq cəlb olunub. Onların 32 nəfəri (45,7%) qız, 38 nəfəri isə (54,28%) oğlan olub. Bu uşaqların 13 nəfəri (18,57%) 1 yaşa qədər, 10 nəfəri (14,28 %) 3-7 yaş arasında, 25 nəfəri (35,71 %) 7-14 yaş arasında olub.




**Müayinə olunan uşaqların vaksinasiya göstəriciləri.**
Cədvəl 1

| № | Göstəricilər | 1 yaş n=13 18,57 % | | 1-3 yaş n=10 14,28% | | 4-7 yaş n=22 31,42% | | 7-14 yaşn=25 35,71% | |
|---|---|---|---|---|---|---|---|---|---|
| 1 | Vaksinasiya olunmayıb | 4 | 5,71 | 4 | 5,71 | 11 | 15,71 | 13 | 18,57 |
| 2 | 1 dəfə vaksinasiya olunub | 5 | 7,17 | - | - | 2 | 2,85 | 2 | 2,85 |
| 3 | 2 dəfə vaksinasiya olunub | 4 | 5,71 | 4 | 5,71 | 5 | 7,17 | 5 | 5,71 |
| 4 | 3 dəfə vaksinasiya olunub | - | - | 2 | 2,85 | 4 | 5,71 | 5 | 5,71 |
| 5 | Revaksinasiya olunub | yaşa uyğun deyil | yaşa uyğun deyil | 5 | 7,17 | 6 | 8,57 | 5 | 5,71 |

Bir yaşa qədər olan uşaqların 4-ü (5,71 %) 2 aya qədər yaş dövründə olub, dövlət təqvim planına görə vaksinasiyaya göstərişi olmayıb. Bir yaşa qədər olan qalan uşaqların 5-i (7,17%) 1 dəfə, 4-ü isə 2 dəfə (5,71%) sxem üzrə vaksinasiya olunub. 1 yaşa qədər 3 dəfə vaksinasiya olunan uşaq olmayıb.

1-3 yaş qrupunda olan 10 uşağın 4-ü (5,71 %) tibbi əks göstərişə görə (allergiya, anemiya) vaksinasiya olunmayıb, qalan 6 nəfərin 4-ü 2 dəfə (5,71 %), 2-i (2,85 %) isə 3 dəfə vaksinasiya olunub. Bu yaş qrupunda olan uşaqların 5-i (7,17%) revaksinasiya olunmayıb.

3-7 yaş qrupunda olan 22 uşağın 11-i (15,71 %) göy öskürək əleyhinə vaksinasiya olunmayıb, 2 uşaq (2,85 %) 1 dəfə, 5 uşaq (7,17%) 2 dəfə, 4 uşaq (5,71%) 3 dəfə vaksinasiya olunub. Bu yaş qrupunda 6 uşaq (8,57%) revaksinasiya olunmayıb.

7-14 yaş qrupunda olan 25 uşağın 13-ü (18,57 %) vaksinasiya olunmayıb. 2 uşaq (2,85 %) 1 dəfə, 5 uşaq (5,71 %) 2 dəfə, 5 uşaq isə (5,71 %) 3 dəfə vaksinasiya olunub. Bu yaş qrupunda olan uşaqların 5-i (5,71 %) revaksinasiya olunmayıb.




Aparılan müayinənin təhlili göstərir ki, ən yüksək yoluxma səviyyəsi 4-14 yaş arasında, əsasən də, 7 yaşdan yuxarı uşaqlarda müşahidə olunub. Ən az isə 1-3 yaş arasında yoluxma baş verib. 47 uşağın (67,1 %) ümumi vəziyyəti orta ağır, 19 uşağın (27,1) ümumi vəziyyəti ağır, 4 uşağın (5,7 7 yaş %) ümumi vəziyyəti isə çox ağır olub. Ümumi vəziyyəti çox ağır olan uşaqlar həyatının 2 ayına qədər olan və təqvim üzrə vaksinasiyaya göstərişi olmayan körpələrdir. 3 yaşa qədər olan uşaqların ümumi vəziyyətləri ağır, 4 yaşdan böyük olan uşaqların ümumi vəziyyətləri orta ağır olub.




Göründüyü kimi bütün dünyada olduğu kimi Azərbaycanda da covid məhdudiyyəti aradan qaldırıldıqdan sonra GÖ-lə xəstələnmə halları artmağa başlayıb, bunun da əsas səbəbi 2 yaşa qədər uşaqların lazımi səviyyədə vaksinasiyaya cəlb olunmaması, 7 yaşa yaxın dövrdə birincili

immunizasiyadan sonra yaranan postvaksinal immunitetin sönməsi, diaqnostika metodlarının təkmilləşməsidir.

Bir yaşa qədər uşaqlarda xəstəliyin ağır gedişi onları GÖ-yə görə risk qrupuna aid etməyə əsas verir və onların vaxtında immunizasiya olunmasının vacibliyini göstərir (Sizov, 2019; Suetina, Illek, & Khlebnikova, 2019).

Xəstələnənlərin 50%-dən çoxu 4-14 yaş arasında olub, bu da müasir dövrdə epidemik prosesin əsas xüsusiyyətinin əhalinin böyük yaş qrupuna doğru yerini dəyişməsindən ibarətdir (Tessier, Campbell, Ribeiro, Rai, Burton, Roy, et al., 2022).

Yuxarıda deyilənlərdən aydın olur ki, kiçik məktəb yaşı dövründə GÖ-yə həssaslıq artır, lakin xəstələnmə halları tam qiymətləndirilmir, belə ki, qeydiyyata alınanların sayı aysberqin yalnız zirvəsidir, alt hissəsi görünmür. Xəstələnənlərin 37 %-ə qədəri qeydiyyata alınır, bu da xəstələnmə hallarının lazımi səviyyədə qiymətləndirilməməsi, diaqnostikanın çətinliyi, silinmiş formaların çox olması, diaqnostikanın çətinliyi və lazımi səviyyədə olmaması ilə əlaqədardır.

## Nəticə

1. Postkovid dövründə dünyanın bir çox ölkələrində olduğu kimi, Azərbaycanda da GÖ-lə xəstələnmə halları çoxalıb, epidemik sıçrayış xarakteri alıb.Bunun da əsas səbəbi pandemiya dövründə ciddi evə qapanma rejimi, gigiyenik qaydalara riayət etmək, insanlar arasında təmasın azalması və bununla əlaqədar xəstəliyin silinmiş, subklinik formalarının rastgəlmə tezliyinin aşağı düşməsi, vaksinasiyanın ölkəmizdə könüllülük prinsipi üzrə həyata keçirilməsi ilə əlaqədar valideynlərin çoxunun peyvənddən imtina etməsidir.
2. Kovid dönəmində baş verən iqtisadi böhranla əlaqədar dünyanın 26 ölkəsində vaksin istehsalının dayandırılması və əhalinin əksər hissəsinin vaksinasiyaya cəlb olunmaması GÖ-lə xəstələnmə hallarının artmasına səbəb olub.
3. Bir yaşa qədər uşaqlar anatomik-fizioloji cəhətdən yetkin olmadığına və risk qrupuna aid olduqlarına görə onların vaxtında immunizasiyaya cəlb olunması zəruri və vacibdir.
4. Uşaqları 7 yaşa kimi göy öskürəkdən qoruyan tam keyfiyyətli postvaksinal immunitetin formalaşması üçün birincili vaksinasiya kursunun təqvim üzrə yerinə yetirilməsi və revaksinasiyanın 2 yaşı ötməmək şərtilə həyata keçirilməsi məqsədəuyğundur.
5. GÖ-yə qarşı yaranan postvaksinal immunitet uşaq həyatının 18 ayında aparılan axırıncı revaksinasiyadan 5-8 il sonra sönməyə başladığına və xəstələnənlərin sayı artdığına görə sonrakı yaş dövrlərində: 6 yaşda, hər 10 ildən bir buster doza revaksinasiyanın aparılması məsləhətdir.
6. Uşaqların vaxtında vaksinasiyaya cəlb olunması, bununla da yoluxmanın, baş verən fəsadların və ölüm hallarının qarşısının alınması üçün əhali arasında sanitar-maarif təbliğatının gücləndirilməsi tövsiyyə olunur.

## Ədəbiyyat

1. Bakhmutskaya, E. V., Mindlina, A. Ya., & Stepenko, A. V. (2018). Whooping cough incidence, immunization tactics and diagnostic methods in various European countries. *Epidemiology and Vaccine Prevention*, *17*(2), 71–82.
2. Basov, A. A. (2016). *The epidemic process of whooping cough at the present stage: Author's abstract* [Doctoral dissertation, Moscow]. 14.02.02.
3. Basov, A. A., Zvirkun, O. V., & Gerasimova, A. G. (2019). The problem of whooping cough in some regions of the world. *Infection and Immunity*, *9*(2), 354–362.
4. Bouchez, V., Guillot, S., Landier, A., Armatys, N., Matczak, S., Toubiana, J., et al. (2021). Evolution of *Bordetella pertussis* over a 23-year period in France, 1996 to 2018. *Euro Surveillance*, *26*(37), 2001213. https://doi.org/10.2807/1560-7917.ES.2021.26.37.2001213
5. Bouchez, V., Toubiana, J., Guillot, S., Parapertussis Study Group, El Belghiti, F. A., Landier, A., et al. (2024). Transient reemergence of *Bordetella parapertussis* in France in 2022. *Journal of Medical Microbiology*, *73*(7), forthcoming. https://doi.org/10.1099/jmm.0.001843

6. Bridel, S., Bouchez, V., Brancotte, B., Hauck, S., Armatys, N., Landier, A., et al. (2022). A comprehensive resource for *Bordetella* genomic epidemiology and biodiversity studies. *Nature Communications*, *13*(1), 3807. https://doi.org/10.1038/s41467-022-31517-8
7. Briko, N. I., & Feldblyum, I. V. (2019). Modern concept of development of vaccination prophylaxis in Russia. *Epidemiology and Vaccination Prophylaxis*, *18*(5), 4–13.
8. Iozefovich, O. V., Kharit, S. M., Bobova, E. I., & Budnikova, E. A. (2021). Pertussis in a child of the first month of life from family contact. *Zhurnal Infectologii = Journal Infectology*, *13*(2), 149–153. https://doi.org/10.22625/2072-6732-2021-13-2-149-153
9. Lomonosova, A. V. (2020). Causes and consequences of untimely vaccination against whooping cough infection in the Russian Federation. *Journal of Microbiology, Epidemiology and Immunobiology*, *97*(5), 492–502.
10. Ma, L., Calfield, A., Dewan, K. K., & Harvill, E. T. (2021). Pertactin-deficient *Bordetella pertussis*, vaccine-driven evolution, and reemergence of pertussis. *Emerging Infectious Diseases*, *27*(6), 1561–1566. https://doi.org/10.3201/eid2706.203850
11. Machado, M. B., & Passos, S. D. (2019). Severe pertussis in childhood: Update and controversy—Systematic review. *Revista Paulista de Pediatria*, *37*(3), 351–362. https://doi.org/10.1590/1984-0462/2019;37;3;00006
12. Matczak, S., Levy, C., Fortas, C., Cohen, J. F., Bechet, S., Ait El Belghiti, F., et al. (2022). Association between the COVID-19 pandemic and pertussis derived from multiple nationwide data sources, France, 2013 to 2020. *Euro Surveillance*, *27*(25), 2100933. https://doi.org/10.2807/1560-7917.ES.2022.27.25.2100933
13. Mikheeva, I. V., Saltykova, T. S., & Mikheeva, M. A. (2018). Feasibility and prospects of whooping cough vaccination without age restrictions. *Journal of Infectology*, *10*(4), 14–23.
14. Sizov, D. A. (2019). Features of the modern course of whooping cough in children. In E. N. Sazonova (Ed.), *Materials of the II Far Eastern Medical Youth Forum: Actual issues of modern medicine* (pp. 87–89).
15. Suetina, I. G., Illek, Y. Y., & Khlebnikova, N. V. (2019). The problem of timeliness of vaccination of young children and ways to solve it. *Epidemiology and Vaccine Prevention*, *18*(5), 85–91.
16. Tessier, E., Campbell, H., Ribeiro, S., Rai, Y., Burton, S., Roy, P., et al. (2022). Impact of the COVID-19 pandemic on *Bordetella pertussis* infections in England. *BMC Public Health*, *22*(1), 405. https://doi.org/10.1186/s12889-022-12830-9

Daxil oldu: 07.01.2025
Qəbul edildi: 20.03.2025

DOI: https://doi.org/10.36719/2663-4619/115/265-270

**Qumru Balaxanova**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
biologiya üzrə fəlsəfə doktoru
https://orcid.org/0000-0002-1709-1442
19_bq_91@mail.ru

# Bakı şəhərində mikromiset göbələklərinin ekoloji və taksonomik xüsusiyyətləri

## Xülasə

Bu tədqiqat Bakı şəhərində müxtəlif ərazilərdə mikromiset göbələklərinin taksonomik tərkibini, ekoloji xüsusiyyətlərini və trofik ixtisaslaşmalarını araşdırmaq məqsədi ilə həyata keçirilmişdir. Tədqiqatın nəticələri göstərdi ki, mikromisetlərin növ müxtəlifliyi və bolluğu ərazilər arasında fərqlənir. Zabitlər parkı, bioloji müxtəlifliyi yüksək olan və ekosistem funksiyalarının yaxşı inkişaf etdiyi bir ərazi kimi ön plana çıxmışdır. Binəqədi və Şüvəlan ərazilərində isə mikromisetlərin bolluğu və növ müxtəlifliyi nisbətən daha az olmuşdur.

Mikromisetlər saprotrof və fitopatogen kimi müxtəlif trofik qruplarda təsnif olunmuşdur. Saprotrofların üstünlük təşkil etdiyi ərazilərdə orqanik maddələrin parçalanması daha aktivdir, fitopatogenlərin dominant olduğu ərazilərdə isə bitki xəstəlikləri üçün əlverişli şərait mövcuddur. Mikromisetlərin bolluğu və ekoloji göstəriciləri, bu göbələklərin ekosistemdəki rolunu və potensial təsirlərini nümayiş etdirir.

Tədqiqatın nəticələri göstərir ki, mikromisetlər ətraf mühitin sağlamlığını qorumaq və kənd təsərrüfatında məhsul itkilərinin qarşısını almaq baxımından əhəmiyyətlidir. Həmçinin, bu tədqiqat mikromisetlərin ekoloji və iqtisadi əhəmiyyətini vurğulayır və gələcəkdə mikromisetlərin daha dərindən öyrənilməsi və müvafiq ekoloji tədbirlərin həyata keçirilməsi üçün əhəmiyyətli bir baza yaradır.

***Açar sözlər:*** *mikromisetlər, taksonomiya, ekoloji xüsusiyyətlər, bioloji müxtəliflik, saprotrof, fitopatogen, endofit, ekosistem funksiyaları, göbələklər, torpaq*

**Gumru Balakhanova**
Azerbaijan State Pedagogical University
PhD in Biology
https://orcid.org/0000-0002-1709-1442
19_bq_91@mail.ru

# Ecological and Taxonomic Characteristics of Micromycete Fungi in Baku City

## Abstract

This research was conducted to study the taxonomic composition, ecological characteristics, and trophic specialization of micromycete fungi in various areas of Baku city. The results of the study indicated that the species diversity and abundance of micromycetes vary across different areas. Zabrat Park emerged as an area with high biological diversity and well-developed ecosystem functions. In contrast, the abundance and species diversity of micromycetes in Binagadi and Shuvalan were relatively lower.

Micromycetes were classified into different trophic groups, such as saprotrophs and phytopathogens. In areas dominated by saprotrophs, the decomposition of organic matter was more active, while in areas dominated by phytopathogens, favorable conditions for plant diseases existed.

The abundance and ecological indicators of micromycetes reflect their role and potential impacts in the ecosystem.

The findings highlight that micromycetes are significant for maintaining environmental health and preventing crop losses in agriculture. Additionally, this research emphasizes the ecological and economic importance of micromycetes and provides an important foundation for future in-depth studies and the implementation of appropriate ecological measures.

***Keywords:*** *micromycetes, taxonomy, ecological characteristics, biological diversity, saprotroph, phytopathogen, endophyte, ecosystem functions, fungi, soil*

## Giriş

Ətraf mühitin deqradasiyası və bioloji müxtəlifliyin azalması bu gün dünya elmi ictimaiyyətini narahat edən əsas ekoloji problemlərdən biridir. Sənayeləşmənin, intensiv kənd təsərrüfatı fəaliyyətinin, urbanizasiyanın və digər antropogen təsirlərin artması nəticəsində torpaq, hava və su ekosistemləri müxtəlif növ kimyəvi və fiziki çirkləndiricilərlə yüklənir. Bu çirkləndiricilər, xüsusilə ağır metallar, neft məhsulları və sənaye tullantıları mikroorqanizmlərin populyasiya strukturlarına, funksional müxtəlifliyinə və trofik əlaqələrinə əhəmiyyətli təsir göstərir.

Ekosistemlərin əsas komponentlərindən biri olan mikromiset göbələklər torpaq mikrobiotasında xüsusi yer tutur. Onlar üzvi maddələrin parçalanması, qida elementlərinin dövranı, simbioz münasibətlərin formalaşması və ekosistemlərin bioloji balansının qorunmasında mühüm rol oynayırlar (Aslanova, Asadova, 2024). Mikromisetlər həm də müxtəlif ekoloji stress amillərinə qarşı yüksək adaptasiya qabiliyyəti göstərən orqanizmlər qrupuna daxildirlər. Bu xüsusiyyətlərə görə, onlar ekosistemlərin sağlamlıq vəziyyətinin qiymətləndirilməsində bioindikator kimi geniş istifadə olunur.

Çirklənmiş mühitlərdə mikromisetlərin taksonomik tərkibində, növlərarası münasibətlərində və trofik ixtisaslaşma səviyyəsində baş verən dəyişikliklər onların çirklənmə amillərinə verdiyi cavab reaksiyalarını öyrənmək baxımından mühüm əhəmiyyət kəsb edir (Balakhanova, 2024). Bəzi növlər çirklənmiş mühitlərdə geniş yayılsa da, digərləri bu şəraitə dözümsüz olub ekosistemdən sıradan çıxır. Bu dəyişikliklər mikromisetlərin ekologiyasını, fiziologiyasını və funksional strategiyalarını dərindən araşdırmağı zəruri edir.

### Tədqiqat

Müasir mikoloji tədqiqatlarda mikromisetlərin ekoloji-trofik ixtisaslaşmasının öyrənilməsi onların trofik səviyyədə hansı rolları oynadığını və bu rolların çirklənmə şəraitində necə dəyişdiyini müəyyənləşdirmək məqsədi daşıyır. Xüsusilə saprotrof, parazit və simbioz həyat tərzi sürən mikromisetlərin müxtəlif çirklənmə dərəcələrinə malik mühitlərdə dominantlıq səviyyələri və funksional rolları müqayisəli şəkildə təhlil edilir (Balakhanova, 2022). Belə yanaşma mikromisetlərin spesifik ekosistem funksiyalarında iştirak səviyyəsini və onların çirklənmə şəraitindəki davamlılıq strategiyalarını ortaya çıxarmağa imkan verir.

Hazırkı tədqiqat işində müxtəlif antropogen təsirlərə məruz qalmış ekosistemlərdə mikromiset göbələklərinin yayılma xüsusiyyətləri, taksonomik müxtəlifliyi və onların ekoloji-trofik ixtisaslaşma səviyyələri öyrənilmişdir. Tədqiqat zamanı həm də bu mikroorqanizmlərin ekoloji rolları, çirklənməyə qarşı davamlılıq potensialı və bioindikator kimi istifadəyə yararlılıq dərəcələri təhlil edilmişdir. Araşdırmanın nəticələri çirklənmiş ərazilərdə torpağın bioloji göstəricilərinin qiymətləndirilməsi, bərpa və bioremediasiya proseslərinin planlaşdırılması baxımından elmi və praktiki əhəmiyyət daşıyır (Balakhanova, 2024).

### Material və metodlar

Tədqiqat işində çirklənmiş və nisbətən təmiz mühitlərdə mikromiset göbələklərinin taksonomik tərkibi, bolluğu və ekoloji-trofik ixtisaslaşma xüsusiyyətləri müqayisəli şəkildə təhlil olunmuşdur. Araşdırmalar əsasən Bakı şəhəri və onun müxtəlif ətraf ərazilərində həyata keçirilmişdir. Tədqiqat ərazilərinə neftlə çirklənmiş torpaqlara malik sənaye zonaları (Binəqədi, Qaradağ, Səngəçal), yolkənarı avtomobil nəqliyyatının intensiv olduğu sahələr (Zabrat, Biləcəri), bərk məişət tullantılarının toplandığı poliqonlar (Balaxanı), şəhərdaxili park və yaşıllıq zolaqları (Zabitlər parkı, Dədə Qorqud parkı), həmçinin nisbətən təmiz təbii ərazilər (Şüvəlan, Türkan) daxil edilmişdir. Bu

ərazilərdən torpaq və bitki qalıqları (yarpaq, kök sistemi və s.) nümunələri steril şərtlərdə, 5–10 sm dərinlikdən götürülmüş və laboratoriyaya qədər 4–6°C temperaturda saxlanılaraq çatdırılmışdır. Mikromisetlərin ayrılması üçün səpgili (dilution plate) üsulu və Lomakin üsulundan istifadə edilmiş, Czapek-Dox agar, Potato Dextrose Agar (PDA) və Sabouraud agar kimi qida mühitlərində inkubasiya olunmuşdur. Göbələk koloniyaları 25–28°C temperaturda 7–14 gün ərzində inkişaf etdirilmiş və onların identifikasiyası mikroskopik və makroskopik əlamətlərə əsaslanaraq həyata keçirilmişdir. Taksonomik təyinat üçün Domsch, Gams və Andersonun "Compendium of Soil Fungi", Ellisin "Dematiaceous Hyphomycetes" və "More Dematiaceous Hyphomycetes", eləcə də Samson, Hoekstra və Frisvadın "Introduction to Food- and Airborne Fungi" əsərləri əsas mənbə kimi istifadə olunmuşdur. Mikromisetlər ekoloji və trofik xüsusiyyətlərinə əsasən saprotroflar, fitopatogenlər, zootroflar, mikotroflar və fakultativ parazitlər olmaqla beş əsas qrupa bölünmüşdür. Bu bölgü həm ədəbiyyat məlumatları, həm də laboratoriyada müşahidə olunan koloniyaların inkişaf xüsusiyyətləri əsasında aparılmışdır (Balaxanova, 2021). Toplanan məlumatlar əsasında növlərin bolluğu, müxtəlifliyi və trofik strukturunun dəyişməsi qiymətləndirilmiş, Shannon, Simpson, Evenness kimi ekoloji indekslər hesablanmışdır. Statistik təhlillər və korrelyasiya analizləri üçün Microsoft Excel, PAST və Statistica proqramlarından istifadə edilmiş, çirklənmə dərəcəsi ilə mikromisetlərin trofik ixtisaslaşma göstəriciləri arasındakı əlaqələr müəyyən edilmişdir.

**Nəticələr və müzakirə**

Tədqiqat zamanı Bakı şəhərinin müxtəlif ərazilərində mikromiset növlərinin müxtəlifliyi ciddi fərqliliklər göstərmişdir. Zabitlər parkında ən yüksək növ müxtəlifliyi müşahidə olunmuş, burada 38 mikromiset növü müəyyən edilmişdir. Bu ərazidə *Penicillium* və *Fusarium* cinsləri dominant olmuş, ekosistemdə bu növlərin üstünlüyü ekoloji balansın dəyişməsinə səbəb olmuşdur. Zabitlər parkının ekoloji müxtəliflik indeksi (Şannon indeksi) 3.12 qiymətini almış, bu da həmin ərazinin bioçeşidliliyinin yüksək olduğunu göstərir (Balakhanova, 2025).

Binəqədi ərazisində isə yalnız 27 mikromiset növü aşkarlanmışdır. Burada *Aspergillus* və *Penicillium* cinsləri üstünlük təşkil edir və bu ərazinin ekosistemi digər ərazilərlə müqayisədə daha aşağı bioçeşidlik səviyyəsinə malikdir. Binəqədi ərazisinin ekoloji müxtəliflik indeksi 1.82 olaraq müəyyən olunmuşdur, bu da həmin ərazinin bioloji müxtəlifliyinin nisbətən aşağı olduğunu göstərir. Şüvəlan ərazisində də 32 mikromiset növü tapılmışdır ki, burada *Trichoderma* və *Mucor* cinsləri dominantdır. Bu ərazinin Şannon indeksi 2.98 olaraq qiymətləndirilmişdir.

**Cədvəl 1.**
**Mikromiset növlərinin müxtəlifliyi və ekoloji müxtəliflik indeksi.**

| Ərazi | Aşkarlanmış növlər | Şannon indeksi | Ən dominant cinslər |
|---|---|---|---|
| Zabitlər Parkı | 38 | 3.12 | *Penicillium, Fusarium* |
| Binəqədi | 27 | 1.82 | *Aspergillus, Penicillium* |
| Şüvəlan | 32 | 2.98 | *Trichoderma, Mucor* |

Yuxarıdakı cədvəldə göstərildiyi kimi, Zabitlər parkı ən yüksək növ müxtəlifliyinə və ekoloji müxtəlifliyə malikdir. Bu da ərazinin müxtəlif ekosistemlərdən və bioloji elementlərdən ibarət olduğunu göstərir.

Mikromisetlərin trofik ixtisaslaşması, onların ekologiya ilə əlaqəsini və ərazilərdəki funksional rolu barədə mühüm məlumat verir (Balaxanova, 2020). Binəqədi və Şüvəlan ərazilərində saprotroflar

dominant qruplar təşkil etmişdir. Binəqədi ərazisində saprotrofların payı 73% təşkil edərkən, Səngəçal ərazisində bu nisbət 69% olmuşdur. Bu, həmin ərazilərdə ölü üzv və orqanik maddələrin parçalanmasının əsas ekoloji funksiyalarından biri olduğunu göstərir. Zabitlər parkında isə fitopatogen mikromisetlərin (25%) üstünlüyü qeyd olunmuşdur ki, bu da ərazidə bitki xəstəliklərinin yayılma potensialının yüksək olduğunu göstərir (Balaxanova, 2022).

***Cədvəl 2.***
**Mikromisetlərin trofik qruplara görə paylanması.**

| Ərazi | Saprotroflar (%) | Fitopatogenlər (%) | Bioloji Funksiya |
|---|---|---|---|
| **Binəqədi** | 73 | 20 | Orqanik maddələrin parçalanması |
| **Zabitlər Parkı** | 55 | 25 | Bitki xəstəliklərinin yayılması |
| **Səngəçal** | 69 | 18 | Orqanik maddələrin parçalanması |

Cədvəldən də göründüyü kimi, saprotrofların dominant olduğu ərazilərdə orqanik maddələrin parçalanma sürəti daha yüksəkdir. Zabitlər parkında isə fitopatogenlərin dominant olması bu ərazinin bitki xəstəlikləri və patogenlər üçün daha əlverişli mühit olduğunu göstərir.

Mikromisetlərin bolluğu və dominant növlərin müəyyən edilməsi, ərazilərin ekoloji yükünü və bu növlərin ekologiyadakı rolunu başa düşmək üçün vacibdir (Balakhanova, 2022). Binəqədi ərazisində *Aspergillus niger* və *Penicillium citrinum* cinslərinin bolluğu daha yüksək olmuşdur. Bu ərazidə bolluq $3.2\times10^4$ CFU/g olaraq ölçülmüşdür. Zabitlər parkında isə *Fusarium oxysporum* və *Penicillium chrysogenum* dominant olmuş və onların bolluğu $4.5\times10^4$ CFU/g ölçülmüşdür. Şüvəlan ərazisində isə *Trichoderma harzianum* və *Mucor racemosus* cinsləri dominant olmuş və onların bolluğu $4.9\times10^4$ CFU/g olmuşdur.

**Cədvəl 3.**
**Mikromisetlərin dominant növlərinin bolluğu (CFU/g).**

| Ərazi | Dominant növlər | Bolluq (CFU/g) |
|---|---|---|
| Binəqədi | *Aspergillus niger*, *Penicillium citrinum* | $3.2\times10^4$ |
| Zabitlər parkı | *Fusarium oxysporum*, *Penicillium chrysogenum* | $4.5\times10^4$ |
| Şüvəlan | *Trichoderma harzianum*, *Mucor racemosus* | $4.9\times10^4$ |

Yuxarıdakı cədvəldən göründüyü kimi, mikromisetlərin bolluğu müxtəlif ərazilərdə əhəmiyyətli dərəcədə fərqlənir. Bu, hər ərazinin mikrobioloji xüsusiyyətləri və ekosistem funksiyalarına təsir edən amillərin müxtəlifliyini əks etdirir (Muradov, 2021).

Mikromisetlər təbii mühitlərdə ölü orqanik maddələrin parçalanmasında və dövranında mühüm rol oynayır. Saprotrofların üstünlük təşkil etdiyi ərazilərdə bu prosesin sürəti daha yüksəkdir və beləliklə ərazinin bioloji təmizlənməsi daha effektiv olur. Digər tərəfdən, fitopatogen mikromisetlərin yüksək bolluğu olan ərazilərdə kənd təsərrüfatı məhsullarına təsir göstərən xəstəliklərin artması ehtimalı yüksəkdir. Bu, xüsusilə bitkilərin məhsuldarlığını və əkin sahələrinin sağlamlığını riskə atır. Buna görə də, mikromisetlərin ekologiyada və iqtisadiyyatda oynadığı rol, ətraf mühitin qorunması və bitki sağlamlığı üçün strateji əhəmiyyət kəsb edir (Abdullaeva, İsayeva, Seyidova, Novruzova, Muradov, 2019).

## Nəticə

Bu tədqiqat Bakı şəhərində müxtəlif ərazilərdə mikromiset göbələklərinin taksonomik tərkibini, ekoloji göstəricilərini və trofik ixtisaslaşmalarını araşdırmışdır. Tədqiqatın nəticələri göstərdi ki, Bakı şəhərindəki müxtəlif ərazilərdə mikromisetlərin növ müxtəlifliyi və bolluğu əhəmiyyətli dərəcədə fərqlənir. Zabitlər parkı, bioloji müxtəlifliyin yüksək olduğu və ekologiyanın inkişaf etmiş olduğu bir ərazi kimi ön plana çıxmışdır. Binəqədi və Şüvəlan ərazilərində isə mikromiset növlərinin bolluğu və növ müxtəlifliyi nisbətən daha az olmuşdur, bu da həmin ərazilərin ekosistemlərində müəyyən ekoloji çatışmazlıqların olmasına işarə edir.

Mikromisetlərin saprotrof və fitopatogen kimi trofik qruplara bölünməsi, onların müxtəlif ərazilərdəki funksional rollarını daha aydın göstərir. Binəqədi ərazisində saprotrofların üstünlük təşkil etməsi, orqanik maddələrin parçalanmasının daha aktiv olduğunu, Zabitlər parkında isə fitopatogenlərin dominant olması bitki xəstəlikləri üçün əlverişli şəraitin mövcudluğunu göstərir. Həmçinin, mikromisetlərin bolluğu ilə bağlı əldə edilən məlumatlar, bu növlərin ekosistemdəki yerini və ekologiyanı tənzimləmə potensialını nümayiş etdirir.

Tədqiqatın nəticələri həmçinin mikromisetlərin ekoloji və iqtisadi əhəmiyyətini vurğulayır. Mikromisetlər, təbii mühitlərdə orqanik maddələrin dövranını təmin etmək və kənd təsərrüfatında məhsul itkilərinin qarşısını almaq baxımından böyük rol oynayır. Eyni zamanda, fitopatogenlər kimi fəaliyyət göstərən mikromisetlər, bitki xəstəliklərinə səbəb olaraq iqtisadi təsirlərə yol aça bilər (Abdullayeva, 2024).

Nəticə etibarilə, Bakı şəhərində mikromiset göbələklərinin müxtəlif ərazilərdəki paylanması və ekoloji xüsusiyyətləri, ətraf mühitin qorunması və kənd təsərrüfatı sahələrindəki idarəetmə strategiyalarının formalaşdırılması baxımından əhəmiyyətlidir. Bu tədqiqat, gələcəkdə mikromisetlərin bioloji və ekoloji funksiyalarının daha dərindən öyrənilməsinə və müvafiq ekoloji tədbirlərin görülməsinə töhfə verə bilər.

## Ədəbiyyat

1. Abdullayeva, S. A. (2024). Rhizosphere bacteria. *Elmi Tədqiqat Beynəlxalq Elmi Jurnal, 4*(10), 80–83.
2. Abdullayeva, S., İsayeva, A., Seyidova, G., Novruzova, M., & Muradov, P. (2019). Characteristic of species composition of fungi involved in the formation of mycobiota of honey bees in Azerbaijan. *Advances in Bioscience and Biotechnology, 10*(9), 282–287.
3. Aslanova, S., & Asadova, B. (2024). *Flora and fauna of Azerbaijan*. ASPU.
4. Balakhanova, G. (2022). Effects of micromycetes on human health. *Polish Journal of Science*, (50), 4–9.
5. Balakhanova, G. (2024). Ecological and tropical specialization of fungi recorded in Baku city soils. *Nature & Science / Təbiət və Elm, 6*(1).
6. Balakhanova, G. (2024). Ecological impact of micromycetes fungi in residential buildings. *Azerbaijan Scientific Center, International Scientific Journal of Scientific Work, 18*(11), 134–137.
7. Balakhanova, G. V. (2022). Generalized characteristics of the recorded fungi in relation to the initial pH of the environment. *Deutsche Internationale Zeitschrift für Zeitgenössische Wissenschaft*, (30), 18.

8. Balakhanova, G. V. (2025). Disruption of ecological functions of soils as a result of anthropogenic effects. *Foundations and Trends in Research*, 87–91.
9. Balaxanova, Q. (2020). Yaşayış binalarında məskunlaşan göbələklərin törətdiyi patologiyaları və onların sağlamlığa təsiri. *ADPU Xəbərləri, 68*(3), 73–83.
10. Balaxanova, Q. (2021). Müxtəlif antropogen təsirə məruz qalmış biotopların mikobiotasının say və növ tərkibinə, ekolo-trofiki əlaqələrinə və rastgəlmə tezliyinə görə xarakteristikası. *Azərbaycan Texnologiya Universitetinin Elmi Xəbərlər Məcmuəsi, 4*(34), 61–66.
11. Balaxanova, Q. (2022). Müxtəlif çirklənmə mənbələrində qeydə alınan göbələklərin ekolo-trofik ixtisaslaşmasının təzahür formasına görə xarakteristikası. *Azərbaycan Texnologiya Universitetinin Elmi Xəbərlər Məcmuəsi, 1*(38), 228–233.
12. Muradov, P. (2021). Eco-trophic relationships and frequency of occurrence of mycobiota of some trees grown on the roadside: The case of Baku highways. *European Online Journal of Natural and Social Sciences, 10*(1), 34–42.

Daxil oldu: 10.12.2024
Qəbul edildi: 28.03.2025

DOI: https://doi.org/10.36719/2663-4619/115/271-274

**İsmayıl Hüseynli**
Bakı Dövlət Universiteti
magistrant
https://orcid.org/0009-0006-1402-9105
ismaylhuseynli01@gmail.com

# Şirvan düzü torpaqlarının şorlaşması və onunla mübarizə tədbirləri

## Xülasə

Şirvan düzü torpaqlarının şorlaşması, əkinçilik üçün ciddi bir problem yaratmaqla, torpaqda duzların yığılması nəticəsində bitkilərin inkişafını çətinləşdirir və məhsuldarlığı azaldır. Bu problemin qarşısını almaq və ya təsirlərini azaltmaq üçün bir neçə tədbir mövcuddur. İlk növbədə, düzgün suvarma rejimi tətbiq edilməli, suyun miqdarı və verilmə vaxtı tənzimlənməlidir. Əlavə olaraq, drenaj sistemlərinin qurulması torpaqdakı artıq suyun xaric edilməsinə kömək edərək şorlaşmanın qarşısını alır. Torpaq işləmə metodları və orqanik maddələrin əlavə edilməsi, həmçinin əkin dövriyyəsinin tətbiqi torpağın təbii balansını qorumağa kömək edir. Şorlaşmaya davamlı bitkilərin seçilməsi məhsuldarlığı artırmaq üçün effektiv bir üsuldur. Kimyəvi müdaxilələr də, xüsusilə kalsium əsaslı maddələr, torpağın şorlaşmasını azalda bilər. Son olaraq, təbii su mənbələrindən istifadə edərək torpağın şorlaşmasının qarşısını almaq mümkündür. Bu tədbirlər bütövlükdə Şirvan düzü torpaqlarının şorlaşması ilə mübarizə aparmağa və torpağın məhsuldarlığını qorumağa yönəlib.

***Açar sözlər:*** *kimyəvi müdaxilələr, su ehtiyatları, ekosistem, torpağın məhsuldarlığı, torpağın strukturu, kənd təsərrüfatı, iqtisadi inkişaf*

**Ismayil Huseynli**
Baku State University
Master student
https://orcid.org/0009-0006-1402-9105
ismaylhuseynli01@gmail.com

# Shirvan Plain Soil Salinization and Measures to Combat it

## Abstract

Soil salinization in the Shirvan Plain creates a serious problem for agriculture by accumulating salts in the soil, making it difficult for plants to grow and reducing productivity. Several measures can be taken to address or mitigate this issue. Firstly, a proper irrigation regime should be implemented, with careful regulation of water quantity and timing. Additionally, the construction of drainage systems helps remove excess water from the soil, preventing further salinization. Soil management methods, the addition of organic matter, and crop rotation also help maintain the soil's natural balance. Selecting salt-tolerant plants is an effective method to increase productivity. Chemical interventions, especially calcium-based substances, can reduce soil salinization. Lastly, utilizing natural water sources can help prevent further salinization. These measures collectively aim to combat soil salinization in the Shirvan Plain and preserve soil productivity.

***Keywords:*** *chemical interventions, water resources, ecosystem, soil productivity, soil structure, agriculture, economic development*

## Giriş

Şirvan düzü torpaqlarının şorlaşması, yalnız kənd təsərrüfatına deyil, həm də yerli ekosistemlərə və su ehtiyatlarına ciddi təsir göstərir. Şorlaşmış torpaqların istifadəsi, uzunmüddətli perspektivdə

torpağın bioloji və kimyəvi xüsusiyyətlərini zəiflədir, bu da yerli floranın və faunanın azalmasına səbəb ola bilər. Həmçinin, suvarma üçün istifadə olunan suyun duzluluğu artırsa, bu, su resurslarının keyfiyyətini aşağı sala bilər.

Torpağın şorlaşmasına qarşı mübarizədə dövlətin və yerli icmaların dəstəyi vacibdir. Dövlət proqramları çərçivəsində suvarma sistemlərinin modernləşdirilməsi, drenaj və torpaq islahatlarının təşviqi, habelə şorlaşmış torpaqlarda yeni texnologiyaların tətbiqi daha geniş miqyasda həyata keçirilməlidir. Bu proseslər, həmçinin kənd təsərrüfatında davamlı inkişaf və yerli iqtisadiyyatın gücləndirilməsi üçün önəmlidir (İsmayılova, 2020).

**Tədqiqat**

Əkin sahələrinin diversifikasiyası və şorlaşmaya davamlı bitkilərin əkilməsi, torpağın şorlaşmasına qarşı təbii bir mübarizə üsuludur. Bu bitkilər, torpaqda duzların yığılmasına qarşı təbii maneə yaratmaqla, məhsuldarlığın qorunmasına və əkin sahələrinin ekoloji balansının təmin edilməsinə kömək edir. Bundan əlavə, torpağa əlavə edilən orqanik maddələr, mikroorqanizmlərin fəaliyyətini təşviq edərək torpağın strukturu üzərində müsbət təsir göstərir və şorlaşmanın qarşısını alır (Quliyev, 2017).

Şirvan düzü torpaqlarında şorlaşma ilə mübarizədə uzunmüddətli strateji yanaşmalar tətbiq olmalıdır. Bu yanaşmalar, torpağın məhsuldarlığını qorumaqla yanaşı, həm də yerli əhalinin həyat şəraitini yaxşılaşdırmağa xidmət edir (Alışov, 2021).

Şirvan düzü torpaqlarında şorlaşma kənd təsərrüfatı və torpağın davamlılığı üçün ciddi bir ətraf mühit problemi yaradır. Bu fenomen, torpaqda duzların yığılması ilə baş verir, xüsusilə yarımsəhralı və quraq iqlimlərdə, beləliklə Şirvan regionunda geniş yayılır. Şorlaşma, torpağın fiziki və kimyəvi xüsusiyyətlərini dəyişdirərək bitkilərin inkişafını çətinləşdirir, suyun udulmasını və qida maddələrinin mənimsənilməsini azaldır. Nəticədə, məhsulverim azalır və torpağın münbitliyi zədələnir. Şorlaşma prosesi əsasən həddindən artıq suvarma, qeyri-kafi drenaj və regionun yeraltı su mənbələrinin yüksək duz tərkibi səbəbindən baş verir. Bu problemi həll etmək üçün müxtəlif strategiyalar birləşdirilməli və şorlaşmanın təsirləri azaldılmalıdır (Rüstəmov, 2018).

Düzgün suvarma rejimi tətbiq edilməlidir. Suvarma metodları, məsələn damla suvarma və ya spreylə suvarma kimi səmərəli üsullar seçilməli, suyun israfı azaldılmalıdır. Suvarma miqdarı və vaxtı diqqətlə tənzimlənməli, bitkilərə lazım olan suyu təmin edərək duzların torpağın üst qatlarına qalxmasının qarşısı alınmalıdır (Həsənov, Hüseynov, 2020).

Şorlaşmanın qarşısını almaq üçün effektiv drenaj sistemləri qurulması mühüm əhəmiyyət kəsb edir. Drenaj, torpaqdakı artıq suyu və duzları xaric etməyə kömək edir. Yaxşı qurulmuş drenaj sistemləri, suyun torpağın alt qatlarına düzgün şəkildə yayılmasını təmin edir və beləliklə, şorlaşmanın qarşısını alır. Drenaj xətləri, kanallar və digər mexanizmlər vasitəsilə suyun düzgün şəkildə axması təmin olunmalıdır. Bu, yeraltı suyun səviyyəsini idarə etməyə və şorlaşma prosesinin azaldılmasına kömək edər (Hacıquliyev, İsmayılov, 2016).

Torpağın şorlaşmasını azaltmaq üçün mexaniki torpaq işləməsi və orqanik maddələrin əlavə edilməsi tövsiyə olunur. Torpağın strukturunu yaxşılaşdırmaq və suyun yaxşıca udulmasını təmin etmək üçün mütəmadi olaraq torpağın işlənməsi vacibdir. Orqanik maddələr, torpağın mikroorqanizmlərinin fəaliyyətini gücləndirir, bu da torpağın fiziki və kimyəvi xüsusiyyətlərini yaxşılaşdırır. Əkin dövriyyəsi tətbiq edərək, bitki növlərinin dəyişdirilməsi də torpağın şorlaşmasının qarşısını almaq üçün təsirli bir yanaşmadır (Məmmədov, 2019).

Şorlaşmış torpaqlarda məhsuldarlığın artırılması üçün şoraya davamlı bitkilərin seçilməsi vacibdir. Bu bitkilər, torpaqdakı duzluğa qarşı daha dözümlüdür və məhsuldar olurlar. Məsələn, düyü, çəmənlər, bəzi taxıl növləri və digər duza dözümlü bitkilər şorlaşmış torpaqlarda yaxşı inkişaf edir. Bu bitkilərin əkilməsi torpağın duzluluğunun təsirlərini azaldar və yüksək məhsul verimi təmin edər (Cəfərov, Məmmədov, 2022).

Şorlaşmanın qarşısını almaq üçün kimyəvi müdaxilələr də təsirli ola bilər. Xüsusilə, kalsium əsaslı maddələrin tətbiqi torpağın şorlaşmasını azalda bilər. Kalsium, torpaqda duzları neytrallaşdıraraq onların mənfi təsirlərini azaldır. Kimyəvi müdaxilələr, torpağın şorlaşmasının müvəqqəti olaraq azaldılmasına kömək edir və bu, digər tədbirlərlə birləşdirildikdə daha effektiv olur (Məmmədova, Əlizadə, 2021).

Tədqiqat işi, Şirvan düzü torpaqlarının şorlaşması və onunla mübarizə tədbirləri mövzusunda aparılan işin əsas prinsiplərini və üsullarını müəyyən edir. Bu metodologiya, şorlaşmanın səbəblərini və təsirlərini anlamaq, həmçinin şorlaşmanın qarşısını almaq və ya onun təsirlərini azaltmaq üçün tətbiq olunan tədbirlərin effektivliyini qiymətləndirmək məqsədi ilə hazırlanmışdır. Aşağıda tədqiqatın metodoloji yanaşmaları və istifadə olunan üsullar ətraflı şəkildə izah ediləcəkdir (Qasımov, Əliyev, 2019).

Bu tədqiqat işində əsasən keyfiyyət və kəmiyyət tədqiqat metodlarının qarışığına əsaslanılır. Şirvan düzü torpaqlarında şorlaşma problemi kompleks və çoxşaxəli olduğundan, hərtərəfli bir yanaşma tələb edir. Tədqiqat həm eksperimental, həm də müqayisəli metodlardan istifadə etməklə həyata keçirilmişdir (Səmədov, 2017).

Eksperimental yanaşma: Şorlaşmaya qarşı müxtəlif mübarizə tədbirlərinin tətbiqi təcrübələr vasitəsilə qiymətləndirilmişdir. Bu təcrübələrdə müxtəlif suvarma texnologiyaları, drenaj sistemlərinin tətbiqi, torpaq işləmə metodları və orqanik maddələrin əlavə edilməsi test edilmişdir.

Müqayisəli yanaşma: Şirvan düzü və digər şorlaşmış ərazilərdə həyata keçirilən mübarizə tədbirlərinin nəticələri müqayisə edilmişdir. Bu yanaşma, bölgədəki ən effektiv metodları müəyyən etməyə və təkrarlana bilən uğurlu nəticələri əldə etməyə kömək etmişdir.

Tədqiqatın əsas məlumat toplama üsulu sahə müşahidələri və sahə araşdırmaları olmuşdur. Müşahidələr torpağın şorlaşmış ərazilərində aparılmış və burada bitki örtüyü, torpağın fiziki və kimyəvi xüsusiyyətləri təhlil edilmişdir.

Torpaq nümunələri götürülməsi: Şirvan düzü ərazilərində müxtəlif nöqtələrdən torpaq nümunələri götürülərək onların şorlaşma səviyyəsi, duzluq tərkibi və digər kimyəvi göstəriciləri laboratoriyada təhlil edilmişdir. Bu təhlil nəticəsində torpağın duzluq səviyyəsi və şorlaşmanın dərəcəsi qiymətləndirilmişdir (Zeynalov, 2021).

## Nəticə

Tədqiqatın nəticələri göstərir ki, Şirvan düzü torpaqlarının şorlaşması kənd təsərrüfatı üçün ciddi bir problem təşkil edir. Şorlaşma, torpaqda duzların yığılması nəticəsində bitkilərin inkişafını əngəlləyir və məhsuldarlığı azaldır. Bu vəziyyət həm də əkin sahələrinin strukturunu dəyişdirir və yerli ekosistemi zədələyir. Şorlaşmanın əsas səbəbləri arasında quraq iqlim şəraiti, suvarma rejiminin düzgün olmaması və drenaj sistemlərinin qeyri-kafi olması yer alır.

Tədqiqatda tətbiq olunan mübarizə tədbirləri, bu problemlə effektiv mübarizə aparmaq üçün bir sıra mühüm üsulların mövcud olduğunu göstərdi. Düzgün suvarma rejiminin tətbiqi, müasir suvarma texnologiyalarının istifadəsi, drenaj sistemlərinin qurulması və orqanik maddələrin torpağa əlavə edilməsi şorlaşma ilə mübarizədə uğurlu yanaşmalardır. Həmçinin, şorlaşmaya davamlı bitkilərin seçilməsi və kimyəvi müdaxilələr də bu mübarizəni gücləndirən təsirli metodlar arasında yer alır.

Tədqiqat nəticəsində əldə edilən məlumatlar göstərir ki, şorlaşmanın qarşısını almaq və onun təsirlərini azaltmaq üçün multidissiplinar yanaşmaların tətbiqi vacibdir. Həmçinin, torpağın şorlaşmasından əziyyət çəkən bölgələrdə kənd təsərrüfatının dayanıqlığını artırmaq üçün müvafiq dövlət siyasətləri və fermerlərə yönəlik təlimlər də mühüm rol oynayır.

Nəticə olaraq, Şirvan düzü torpaqlarının şorlaşması ilə mübarizə aparmaq və torpaqların məhsuldarlığını qorumaq üçün müxtəlif tədbirlərin birgə tətbiqi zəruridir. Bu tədbirlərin koordinasiyalı şəkildə həyata keçirilməsi, uzun müddətli torpaq istifadəsini davam etdirmək və ekosistemin tarazlığını bərpa etmək üçün mühüm addım olacaqdır.

## Ədəbiyyat

1. Alışov, İ. (2021). Torpaqlarda şorlaşma və onun təsirlərinin qiymətləndirilməsi. *Kənd Təsərrüfatı və Ekologiya Jurnalı, 18*(4), 91–98.
2. Cəfərov, R., & Məmmədov, Ş. (2022). Şorlaşmanın qarşısının alınması üçün tətbiq olunan metodlar və onların effektivliyi. *Torpaq və Su Resursları Dərgisi, 11*(2), 55–63.
3. Hacıquliyev, M., & İsmayılov, V. (2016). *Şorlaşma və onun torpaq məhsuldarlığına təsiri*. Bakı: AMEA nəşriyyatı.

4. Həsənov, A., & Hüseynov, B. (2020). Şirvan düzü torpaqlarında şorlaşma və mübarizə tədbirləri. *Gəncə: Azərbaycan Kənd Təsərrüfatı Universiteti Nəşriyyatı.*
5. İsmayılova, R. (2020). Şorlaşmış torpaqlarda məhsuldarlığın artırılması. *Aqrar Tədqiqatlar və Texnologiyalar, 10*(4), 77–83.
6. Məmmədov, T. (2019). Azərbaycan torpaqlarının şorlaşması və qarşısının alınması yolları. *Kənd Təsərrüfatı Araşdırmaları Jurnalı, 15*(3), 45–52.
7. Məmmədova, G., & Əlizadə, Z. (2021). Torpaqların şorlaşması və onunla mübarizə üçün müasir üsullar. *Torpaq və Su Mühəndisliyi Jurnalı, 29*(1), 88–94.
8. Qasımov, S., & Əliyev, V. (2019). Suvarma texnologiyalarının şorlaşmaya təsiri. *Kənd Təsərrüfatı və Ekologiya Jurnalı, 14*(3), 102–109.
9. Quliyev, F. (2017). Şorlaşmış torpaqların təhlili və mübarizə üsulları. *Torpaq Elmi və Texnologiyaları Dərgisi*, *24*(2), 61–67.
10. Rüstəmov, E. (2018). Şorlaşmaya qarşı mübarizə metodları: təcrübələr və tövsiyələr. *Torpaq Mühəndisliyi və Suvarma Texnologiyaları, 33*(1), 73–80.
11. Səmədov, N. (2017). Torpaqların şorlaşması və suvarma rejimlərinin tənzimlənməsi. *Aqrar Elm və Texnologiya Jurnalı, 12*(2), 34–41.
12. Zeynalov, M. (2021). Şirvan düzü torpaqlarında drenaj sistemlərinin təsiri. *Azərbaycan Torpaq Elmi və Suvarma Jurnalı, 25*(1), 49–56.

Daxil oldu: 14.01.2025
Qəbul edildi: 19.04.2025

DOI: https://doi.org/10.36719/2663-4619/115/275-279

**Cahangir Əlizadə**
Azərbaycan Dövlət Aqrar Universiteti
magistrant
https://orcid.org/0009-0008-7945-8669
cahangirelizade87@gmail.com

## Səmərəli suvarma sistemlərinin layihələndirilməsi

### Xülasə

Su qıtlığı qlobal problemdir. 2050-ci ilə qədər dünya əhalisinin təxminən 9-10 milyard olacağı təxmin edilir və buna görə də daha çox suya ehtiyac duyulacaq. Suvarılan əkinçilik istehlak suyundan istifadənin ən böyük sektorudur. Ərzaq təhlükəsizliyini təmin etmək üçün su ehtiyatlarından davamlı şəkildə necə istifadə etmək indiki və gələcək nəsillər üçün əsas problemdir. Buna görə də, hər damla suya daha çox qida istehsal edən texnologiyalar vasitəsilə su məhsuldarlığının artırılması davamlı kənd təsərrüfatının inkişafı üçün vacibdir. Suvarma sistemlərinin düzgün seçilməsi və layihələndirilməsi bütün dünyada suya qənaət edilə biləcək texnologiya kimi əkin sahələrindən alınan yüksək məhsuldarlığın və keyfiyyətin bariz nümunəsidir. Əhalinin artması və bununla əlaqədar su, qida və enerji tələbatının artması səbəbindən şirin su ehtiyatları qıtlaşır. Üstəlik, ekstremal hava hadisələri (məsələn, daşqınlar və quraqlıqlar) adi hadisələrə çevrilir. Ona görə də şirin su ehtiyatları getdikcə azaldıqca və quraqlıqlar tez-tez baş verdikcə su ehtiyatlarından səmərəli istifadəyə ehtiyac yaranır. Suya qənaət etməyə imkan verən suvarma texnologiyalarında (məsələn, elektrik klapanları, ağıllı nəzarətçilər, torpaq rütubəti sensorları və s.) əhəmiyyətli irəliləyişlər olmuşdur. Bununla belə, bu texnologiyaların effektivliyi bir neçə amildən, məsələn, suvarma sisteminin dizaynından asılıdır. Səmərəli suvarma sistemləri və avadanlıqlarının layihələndirilməsi həm pula, həm də suya qənaət edəcəkdir.

***Açar sözlər:*** *potensial, qradiyent, təzyiq itkisi, sürtünmə itkisi, tekstura*

**Jahangir Alizadeh**
Azerbaijan State Agrarian University
Master student
https://orcid.org/0009-0008-7945-8669
cahangirelizade87@gmail.com

## Designing Efficient Irrigation Systems

### Abstract

Water shortage is a global problem. By 2050, the world's population is estimated to be around 9–10 billion people, meaning more water will be needed. Irrigated agriculture is the largest water-consuming sector. Sustainable use of water resources to ensure food security is a major challenge for present and future generations. Therefore, increasing water productivity through technologies that produce more food per drop of water is critical to developing sustainable agriculture. The correct selection and design of irrigation systems is a clear example of the high productivity and quality obtained from agricultural lands using water-saving technologies throughout the world. Due to population growth and the resulting increase in demand for water, food, and energy, freshwater resources are becoming increasingly scarce. Moreover, extreme weather events (such as floods and droughts) are becoming more frequent and normalized. As freshwater resources continue to diminish and droughts occur more often, the need for efficient water use is growing. Significant advancements have been made in irrigation technologies that enable water savings (such as electric valves, smart controllers, soil moisture sensors, etc.). However, the effectiveness of these technologies depends on several factors, including the design of the irrigation system. Designing efficient irrigation systems and equipment will save both money and water.

***Keywords:*** *potential, gradient, pressure loss, friction loss, texture*

## Giriş

İnsanın təbiətlə yaratdığı bütün qarşıdurmalardan təbii mühitə ən geniş təsir edəni suvarma sistemləri olmuşdur. Planetin dörddə bir milyard hektardan çoxu suvarılır və bütün ölkələr yaşaması və mövcudluğu üçün suvarmadan asılıdır. Suvarma sxemlərinin əhəmiyyətini nəzərə alsaq, təəssüf ki, son vaxtlara qədər onların tikintisinə tətbiq edilən texnologiya və dizayn prinsipləri 4000 il ərzində demək olar ki, dəyişməyib. Suvarma mühəndisliyi ilə bağlı müasir düşüncə sosial elmlər, nəzarət nəzəriyyəsi, siyasi iqtisadiyyat və kənd təsərrüfatı da daxil olmaqla bir çox digər sahələrdən olan fikirlərin çarpaz mayalanmasından faydalanmışdır. Bununla belə, bu təsirlər irriqasiya mühəndisləri tərəfindən böyük ölçüdə nəzərə alınmayıb.

**Tədqiqat**

Suvarma sistemlərini layihələndirərkən bir çox amillər nəzərə alınmalıdır. Suvarma sisteminin layihələndirilməsi məhsul, tarla şəraiti, torpaq və su haqqında bilik tələb edir. Torpağın quruluşu nədir, torpaq nə qədər su saxlaya bilər, sahənin ölçüsü nədir, sahənin topoqrafiyası necədir, sahə suvarma hissələrinə bölünəcəkmi, məhsulun əkin sıxlığı nə qədərdir, məhsulun kök sisteminin dərinliyi nə qədərdir, bitkinin özünəməxsus yerində suya olan tələbatı nədir, su təchizatı mənbəyi nədir, suyun keyfiyyəti nədir, sistemin xərcləri və əmək tələbləri nədir kimi suallara cavab vermək suvarma sisteminin xüsusiyyətlərini müəyyən etməyə kömək edə bilər.

Suvarma sistemlərinin layihələndirilməsi və suvarma avadanlığının seçilməsi zamanı nəzərə alınmalı olan əsas amillərin icmalını nəzərdən keçirək.

*Su mənbəyi.* Suvarma suyu mənbəyinin keyfiyyətini və mövcud miqdarını bilmək çox vacibdir. Su mənbələri bərpa olunan sulardan, yerüstü sulardan və ya yeraltı sulardan ola bilər. İstifadə olunan su mənbəyindən asılı olaraq, mövcud suyun miqdarı və suyu çatdırmaq üçün lazım olan avadanlıq fərqli olacaq. Suvarma üçün suyun ayrılması bir sıra amillərdən asılı olaraq yerli qanunlara tabe ola bilər.

*Sahənin Xüsusiyyətləri*i (yəni, sahənin ölçüsü, torpağın yamacı, torpağın növü) suvarma sisteminin, zəruri suvarma avadanlığının (məsələn, nasos) və bitki növlərinin seçiminə təsir göstərə bilər.

*Sahənin Ölçüsü* əkilə bilən bitkilərin maksimum sayına və nəticədə ümumi suvarma tələbinə təsir göstərir. İstənilən vaxtda suvarılan maksimum sahə suyun mövcudluğuna, nasosun icazə verilən axınına və mənbədəki təzyiqə əsasən müəyyən edilməlidir. Suvarma sahəsi üzrə təzyiq düşmələrini və dəyişiklikləri minimuma endirmək üçün suvarma sistemi layihələndirilərkən təzyiq itkisi nəzərə alınmalıdır.

*Torpaq Yamacı* ərazinin mailliyi su axınına və suvarma paylanmasının vahidliyinə təsir göstərir. Su yüksək potensialdan (yüksək yüksəklikdən) aşağı potensiala (aşağı yüksəklik) axır. Suvarma sisteminin planından asılı olaraq, aşağı hündürlüklərdəki sahələr çox su ala bilər, yüksəkliklərdəki yerlər isə çox az su ala bilər. Yamac gradientinə qarşı kifayət qədər su vermək üçün nasoslara ehtiyac ola bilər. Bundan əlavə, ərazi yamacları su axını və eroziyaya səbəb ola bilər. Bəzi hallarda qeyri-bərabər sahələrin hamarlanması nəzərdən keçirilə bilər.

*Torpağın xüsusiyyətləri* (məsələn, tekstura, quruluş, torpağın dərinliyi, üzvi maddələrin tərkibi) torpağın su tutma qabiliyyəti kimi torpaq və su münasibətlərinə təsir göstərir. Torpağın su tutma qabiliyyəti suyun tətbiqi tezliyinə və sürətinə təsir göstərir. Məsələn, qumlu torpaqlar aşağı su tutma qabiliyyətinə malikdir və daha aşağı suvarma dərəcələrində daha tez-tez suvarılmalıdır. Alternativ olaraq, gilli torpaqlar nisbətən daha yüksək su tutma qabiliyyətinə malikdir və daha yüksək suvarma sürəti ilə daha az suvarıla bilər. Torpağın dərinliyi həmçinin bitkilərin effektiv köklənmə dərinliyinə və kök zonasının altındakı suyun və qida maddələrinin yuyulmasına təsir göstərir.

*Bitki növü* suvarma sisteminin seçiminə təsir göstərir. Bitkilərin böyümə mərhələsindən asılı olaraq suvarma tələbləri fərqlidir. Bundan əlavə, hesabatlar göstərir ki, illik bitkilər çoxillik bitkilərə nisbətən daha az su tələb edir. Bundan əlavə, müxtəlif bitkilərin müxtəlif əkin sıxlığı (aralıq) var. Fərqli bitkiləri suvarmaq üçün eyni suvarma sistemindən istifadə edilərsə, bitkilər müstəqil şəkildə suvarılmaq üçün müxtəlif zonalara yerləşdirilməlidir. Məhsul əmsalları ($K_{tr}$) müxtəlif bitkilər üçün fərqli inkişaf mərhələlərində dəyişir. Beləliklə, faktiki buxarlanma ($E_{fak}$) və suvarma tələbləri

hesablanarkən bitki üçün xüsusi $K_{tr}$ qiymətlərindən istifadə edilməlidir. Məhsul bazarı dəyərləri daha bahalı suvarma sistemlərinin mümkünlüyünə təsir göstərir. Daha yüksək qiymətli məhsullar suvarma sisteminə daha çox investisiya qoymağa imkan verə bilər; bu, aşağı qiymətli məhsullar üçün əlverişli variant olmaya bilər.

Suvarma sistemi suyu mənbədən sahəyə paylayır. Müəyyən bir vəziyyət üçün ən yaxşı su tədarük mexanizmini müəyyən etmək vacibdir. Bitki növü, torpaq növü, landşaft xüsusiyyətləri, tələb olunan axın sürəti, iş təzyiqi və xərclər suvarma sistemlərinin seçiminə təsir göstərir. Suvarma sistemlərinin əsas növləri (damcı, çiləyici və yeraltı, səth), onların üstünlükləri və çatışmazlıqları müzakirə olunmalıdır (Babikov, 2005).

Damcı suvarma sistemi ən səmərəli suvarma sistemidir və cərgə bitkiləri üçün istifadə olunur. Damla suvarma yerüstü və ya yeraltı ola bilər və tez-tez polietilen damcı lentləri istifadə olunur. Damcı suvarma sistemlərində emitentlər birbaşa bitkinin kök zonasına su verirlər. Bu, səth axını və/yaxud kök zonasının altında yuyulma nəticəsində su itkilərini azaldır. Əkin sıxlığı emitentlər arasındakı məsafəni istiqamətləndirir. Emitentlər damcı lentlərinə (yanal) quraşdırıla bilər və ya müvafiq alətlərdən istifadə edərək damcı lentlərini deşməklə tikanlı emitentlər quraşdırıla bilər. Emitentlər boşalma dərəcələrində (gpm) dəyişir (Bazavluk, 2014).

Bu, damcı suvarmanı bütün torpaq növləri üçün uyğun edir. Bununla belə, fiziki (məsələn, qum hissəcikləri), bioloji (məsələn, bakteriya) və kimyəvi birləşmələr emitentləri bağlaya bilər. Filtrləmə sisteminin quraşdırılması, suvarma sisteminin tez-tez yuyulması, dezinfeksiyaedici maddələrin istifadəsi (məsələn, xlor) və yaxud suvarma sisteminə turşunun vurulması kimi strategiyaların birləşməsindən istifadə emitentin tıxanmasını azalda bilər. Şəkil 1 tipik damcı suvarma sisteminin əsas komponentlərinin sxemini göstərir.




Şəkil 1. Sadələşdirilmiş damcı suvarma sisteminin sxemləri.

*Üstünlükləri:* Kök zonasında və ya yaxınlığında lokallaşdırılmış su tətbiqi; Axar və dərin süzülmə nəticəsində azalan su itkisi sayəsində ən səmərəli suvarma sistemi; Xüsusilə plastik malç ilə birləşdirildikdə, alaq otlarını basdırmağa kömək edə bilər; Suyun vahid paylanması; Xəstəlik riskini azaldan yarpaqlarla (məsələn, kahı) su ilə təmasın olmaması (Grebenshchikova, Gorbacheva, 2019).

*Mənfi cəhətləri:* Təsərrüfat avadanlığı, günəş işığı, gəmiricilər, vəhşi heyvanlar və s. tərəfindən asanlıqla zədələnir; Digər sistemlərə nisbətən daha tez-tez dəyişdirilməlidir; Tıxanmağa meyllidir; filtrləmə tələb olunur; Böyük ərazilər üçün daha bahalı; Tez-tez baxım tələbi.

Çiləmə suvarma sistemlərində su çiləyici başlıqlardan istifadə etməklə paylanır. Çiləyici başlıqları spesifikasiyalardan asılı olaraq müxtəlif püskürtmə radiuslarına, iş təzyiqlərinə və tətbiq dərəcələrinə malikdir (Kireycheva, Karpenko, 2015). Yerüstü, mikro çiləyici və rotor kimi müxtəlif tipli çiləmə sistemləri var. Yerüstü çiləyici sistem tez-tez suyun məhsulun üstündən tətbiq olunduğu yüksək tətbiq dərəcəsi ilə yüksək təzyiqə malikdir. Yerüstü çiləyicilər kənd təsərrüfatında, uşaq bağçalarında və şəhərin abadlaşdırılmasında istifadə olunur. Mikro çiləmə üsulu ilə suvarma aşağı təzyiq və aşağı və orta həcmdə olsa da, ağac meyvələri kimi yüksək qiymətli məhsullar üçün uyğundur. Bununla belə, yerüstü çiləyici sistemi böyük ağacların örtüyünün üstündə suvarmaq mümkün deyil. Mikro çiləmə

üsulu ilə suvarma suyun birbaşa torpağa tətbiqinə imkan verir ki, bu da onu yerüstü suvarma sistemindən nisbətən daha səmərəli edir.

*Üstünlükləri:* Damcı suvarma ilə müqayisədə daha uzun ömürlüdür; Kənd təsərrüfatı, landşaft və uşaq bağçalarının suvarılması üçün tətbiq olunur; Yerüstü çiləyici yüksək təzyiqə və orta və yüksək tətbiq dərəcəsinə malikdir; Fərqli püskürtmə nümunələri; Dondurmadan qorunmaq üçün istifadə edilə bilər (Yurchenko, 2018).

*Mənfi cəhətləri:* Damcı suvarma sistemindən daha az səmərəlidir; Sıralar arası açıq sahələrin suvarılması; Damcı suvarma sistemindən daha çox küləyin sürüşməsinə daha həssasdır; Damcı ilə müqayisədə axıntı və eroziya potensialı daha yüksəkdir; Yarpaqların ıslanması səbəbindən bitki xəstəliklərinin riski (Dubenok, 2013).

Yeraltı suvarma, suyun bitkinin kök zonasına yönəldildiyi bir sistemdir. Bu tip suvarma sistemi dayaz suyun səviyyəsinin dəyişdirilməsini nəzərdə tutur (Kireycheva, 2017). Nəticə etibarı ilə, yeraltı suvarma yalnız kök zonasının altında su keçirməyən təbəqənin mövcudluğu ilə nisbətən düz sahələrdə tətbiq oluna bilər ki, bu da oturmuş suyun səviyyəsini tənzimləməyə imkan verir. Yeraltı suvarma sistemi əkinlərin kök zonasında qrunt sularının səviyyəsini yüksəltmək üçün böyük həcmdə su tələb olunduğuna görə ən az səmərəli suvarma sistemlərindən biridir.

Səmərəli suvarma sistemlərinin layihələndirilməsi suvarma sistemi vasitəsilə su axını ilə məşğul olan suvarma hidravlikasını başa düşməyi tələb edir. Suvarma sistemində su axınına təzyiq, boru ölçüsü, klapanlar, sayğaclar və çiləyici başlıqlar kimi bir neçə amil təsir göstərir. Bu bölmədə boru sistemində su axınına təsir edən bir neçə əsas amil müzakirə olunur (Sabo, Teodoronskiy, Zolotarevskiy, 2023).

Suvarmada ümumi prinsip suyun təzyiq kimi enerji hesabına suvarma sistemindən (məsələn, borular, başlıqlar, klapanlar, sayğaclar və s.) keçməsidir. Təzyiq fut, kvadrat düym üçün funt (psi), bar və paskal kimi müxtəlif formalarda ifadə edilə bilər. Su sütununun təzyiqi aşağıdakı kimi hesablana bilər: Uzunluğu 130,48 sm, eni 30,48 sm və hündürlüyü 30,48 sm olan su sütununun (həcmi=30,48 $sm^3$) çəkisi 62,43 kq-dır. Bu o deməkdir ki, təməlin 5,669 $sm^2$ hissəsinə bölünmüş 30,48 $fsm^3$ su sütununun hər birinin çəkisi 4.5 $sm^2$ təşkil edir (Khetsuriani, Bondarenko, Aliferov, 2019).

Suvarma sisteminin vahid paylanmasına və nəzərdə tutulan suyun tətbiqinə nail olmaq üçün suvarma sisteminin layihələndirilməsi zamanı sürtünmə itkiləri nəzərə alınmalıdır. Boru diametri, material növü və forması kimi amillər sürtünmə itkilərinə təsir göstərir. Təzyiq itkisi cədvəllərindən suvarma sistemlərində təzyiq itkisini qiymətləndirmək üçün istifadə edilə bilər. Məsələn, Cədvəl 3 damcı boruları üçün sürtünmə itkisi cədvəllərini göstərir. Məsələn, daxili diametri 0,62 düym və axın sürəti 2 gpm olan damcı borusu hər 100 fut damcı uzunluğu üçün 0,12 MPa psi sürtünmə itkisinə malik olacaqdır. Təzyiqölçənlərin quraşdırılması suvarma sistemlərində təzyiq itkilərinin monitorinqinə kömək edə bilər. Diferensial təzyiqi ölçmək üçün suvarma sisteminin müxtəlif nöqtələrində bir neçə təzyiqölçən quraşdırıla bilər (Dubenok, Shumakova, 2013).

Suvarma sistemlərində axın sürəti borunun ölçüsündən və təzyiqindən asılıdır. Borudan bir anda axan suyun miqdarı çiləyici başlıqların həmin boru hissəsindən aşağıya doğru nə qədər su buraxdığına, nasosun gücünə və iş təzyiqinə əsaslanır (Khatkhokhu, Prus, Fominova, 2016). Sürət borunun en kəsiyinin sahəsinə bölünən axın sürətidir. Boru ölçüləri su mənbəyinin yaxınlığında daha böyük başlayır və suvarma sisteminin sonuna doğru daha kiçik olur. Düzgün boru ölçüsünün hesablanması lazımi miqdarda suvarma suyunun tətbiqini təmin edəcəkdir.

Nasoslar aşağıdan yuxarı nöqtələrə qədər lazımdır. Bir nasos ilk növbədə suvarma sistemində adekvat su axınına səbəb olan axın, qaldırma və ya təzyiq yaratmaq üçün istifadə olunur. Nasos seçərkən tələb olunan axın sürəti və suvarma sisteminin iş təzyiqi nəzərə alınmalıdır. Bununla belə, suvarma nasosları baha başa gələ bilər. Nasos seçərkən suvarma sisteminizin məqsədli istifadəsini nəzərə alınmalı və zəruri hallarda bir mütəxəssislə məsləhətləşməlidir.

Suvarma təcrübələri yağışla qarşılanmayan bitki su tələblərini tamamlayır. Suvarma cədvəli nə vaxt və nə qədər suvarma suyuna ehtiyac olduğunu göstərir. Suvarma qrafiki torpağın rütubətinə əsaslanan, buxarlanmaya əsaslanan və bitki əsaslı ölçmələrdən istifadə etməklə müəyyən edilə bilər

(Kizyayev, Kireycheva, 2006). Səmərəli suvarma sisteminin dizaynı müvafiq suvarma qrafiki mövcud olmadığı təqdirdə suvarma suyundan səmərəli istifadəyə zəmanət vermir.

## Nəticə

Bu məqalə suvarma sisteminin dizaynına təsir edən əsas amillərin əsas icmalını təqdim edir. Bir neçə amil, o cümlədən uyğun avadanlığın seçimi və sistemin dizaynı suvarma sisteminin effektivliyinə təsir göstərir. Effektiv suvarma sistemlərinin dizaynı şirin su ehtiyatlarına qənaət etmək və iqtisadi səmərəliliyə nail olmaq üçün vacibdir. Bundan əlavə, səmərəli suvarma sistemlərində nəzərdə tutulan nəticələrə nail olmaq üçün müvafiq suvarma qrafikləri olmalıdır.

## Ədəbiyyat

1. Babikov, B. V. (2005). *Gidrotekhnicheskiye melioratsii*. Sankt-Peterburg: Lan'.
2. Bazavluk, V. A. (2014). *Meliorativnoye obustroystvo territoriy* [Uçebnoye posobiye]. Tomsk: Izd-vo Tom. politekhn. un-ta.
3. Dubenok, N. N. (2013). *Gidrotekhnicheskiye melioratsii* [Uçebnoye posobiye]. Moskva: RGAU-MSKHA im. K. A. Timiryazeva.
4. Dubenok, N. N., & Shumakova, K. B. (2013). *Gidrotekhnicheskiye sel'skokhozyaystvennyye melioratsii: Uchebnoye posobiye. Praktikum*. Moskva: RGAU-MSKHA im. K. A. Timiryazeva.
5. Grebenshchikova, Ye. A., & Gorbacheva, N. A. (2019). *Gidrotekhnicheskiye melioratsii: Uchebnoye posobiye*. Blagoveshchensk: Dal'nevostochnyy gos. agrarnyy un-t.
6. Khetsuriani, Ye. D., Bondarenko, V. L., & Aliferov, A. V. (2019). Metodologicheskiye osnovy ponyatiya vremeni v otsenke ekologicheskogo sostoyaniya v zonakh vliyaniya meliorativnykh sistem. *Puti povysheniya effektivnosti oroshayemogo zemledeliya, 1*, 165–172.
7. Khatkhokhu, Ye. I., Prus, D. V., & Fominova, G. N. (2016). Osnovnyye polozheniya proyektirovaniya meliorativnykh sistem novogo pokoleniya. *Simvol nauki, 5-3(17)*, 86–89.
8. Kireycheva, L. V., & Karpenko, N. P. (2015). Otsenka effektivnosti orositel'nykh melioratsiy v zonal'nom ryadu pochv. *Pochvovedeniye, 5*, 587–596.
9. Kireycheva, L. V. (2017). Ekologicheskiye printsipy sozdaniya sovershennykh meliorativnykh sistem. *Prirodoobustroystvo, 5*, 70–75.
10. Kizyayev, B. M., & Kireycheva, L. V. (2006). Vosstanovleniye plodorodiya melioriruyemykh zemel' – aktual'naya zadacha. *Plodorodiye, 5*, 18–19.
11. Sabo, Ye. D., Teodoronskiy, V. S., & Zolotarevskiy, A. A. (2023). *Gidrotekhnicheskiye melioratsii: Uchebnik dlya vuzov* (2-ye izd., ispr. i dop.). Moskva: Yurayt.
12. Yurchenko, I. F. (2018). Informatsionnaya podderzhka sozdaniya i ekspluatatsii orositel'nykh sistem. *Prirodoobustroystvo, 3*, 93–100.

Daxil oldu: 09.01.2025
Qəbul edildi: 14.04.2025

